**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**İyul-Avqust**
**№ 4 (656)**
**2013**

**Elmi-nəzəri, pedaqoji jurnal**

## BU NÖMRƏDƏ

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 07

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, "Ərgünəş" FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

**В этом номере**

**In this number**

# 2012/2013-cü tədris ilində keçirilmiş "Ən yaxşı müəllim" müsabiqəsinin qaliblərinin mükafatlandırılması haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, "Ən yaxşı ümumtəhsil məktəbi və ən yaxşı müəllim mükafatlarının təsis edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2007-ci il 4 sentyabr tarixli 2373 nömrəli sərəncamının 1-ci hissəsinə uyğun olaraq **qərara alıram:**

1. 2012/2013-cü tədris ilində keçirilmiş "Ən yaxşı müəllim" müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə aşağıda qeyd edilən müəllimlər 5000 (beş min) manat məbləğində birdəfəlik pul mükafatı ilə mükafatlandırılsınlar:

Abdullayev İlqar Heydər oğlu
Abdullayeva Solmaz Yadulla qızı
Abdullayeva Viktoriya Vasilyevna
Abdullayeva Firəngiz Ələsgər qızı
Abdullayeva Nərminə Şeyx qızı
Ağamalıyeva Validə Şirin qızı
Ağamalıyeva Sədiqə Qəfər qızı
Axundova Vəfa Tahar qızı
Allahverdiyev Aydın Çingiz oğlu
Babaşova Sevda Hacıverdi qızı
Bağırlı Bahar Səməd Vahid qızı
Bəkirov Qafur Seyran oğlu
Cahandarova Səadət Akif qızı
Cəfərli Kərim Süleyman oğlu
Əhmədov Zabul Habil oğlu
Əhmədova Aygün Nizami qızı
Əhmədova Nailə Namaz qızı
Əhmədova Mətanət Eldar qızı
Əliyeva Nərminə Mehdiağa qızı
Əliyeva Kifayət Mahal qızı
Əliyeva Təranə Adil qızı
Əliyeva Təranə Əhmədağa qızı
Əliyeva Ramella İşıx qızı
Əliyeva Mahizər Əsgər qızı
Əliyeva Gülnarə Nizami qızı
Əliyeva Ramela Ramis qızı
Əlizadə Xavər Şükür qızı
Əsədova Məlihə Fəxrəddin qızı
Əsgərova Ruhiyyə Tofiq qızı
Fazilova İlahə Rəfail qızı
Fətullayev Teymur Sabir oğlu
Hacıyeva Natavan Qaffar qızı
Hacıyeva Şəkər Nadir qızı
Həmidov Hafiz Əbil oğlu
Həsənov Möhübbət Qüdrət oğlu
Həsənov Oqtay Mayıl oğlu
Həsənov Rahim Rafiq oğlu
Həsənova Əfsanə Arzu qızı
Həsənova Lalə Kamal qızı
Həşimova Kəmalə Ləzgi qızı
Həsrətov Alqış Kamal oğlu
Hüseynova Nahidə Əlövsət qızı
Hüseynova Turan Bayramqulu qızı
Hüseynova Aynur Şamil qızı

İbrahimova Sevda İsmayıl qızı
İbrahimova İlhamə Fəhrad qızı
İlizarova Elmira Borisovna
İlyasova Nuriyyə Kamal qızı
İsgəndərova Yeganə Əvəz qızı
İsgəndərova Minazər Ramiz qızı
Kərbalayeva Amənə Eldar qızı
Kərimova Gülnar Yusif qızı
Mahmudov Talıb Əhməd oğlu
Mahmudova Ruhiyyə Qüdrət qızı
Maqsudova Nurlana Anəs qızı
Məhərrəmov Fazil Yaqub oğlu
Məhərrəmova Şəlalə Nazim qızı
Məmmədov Rafik İslam oğlu
Məmmədov İqbal İnqilab oğlu
Məmmədova Kəmalə Cahangir qızı
Məmmədova Gülçöhrə Mətləb qızı
Məmmədova Nəzakət Zahir qızı
Məmmədova Nərgiz Kərim qızı
Məmmədzadə Dilrubə Tapdıq qızı
Mirizadə Gülşən Məmməd qızı
Muradova Təranə Fərrux qızı
Mursalova Brilyand Arif qızı
Musayeva Esmira Hümbət qızı
Musayeva Əsbət İsaxan qızı
Musayeva Ülviyyə Sahib qızı
Musayeva Ədalət Ələkbər qızı
Mustafayeva Natəvan Əmrah qızı
Mustafazadə Fatma Abbas qızı
Nəcəfova Ruhəngiz Əşrəf qızı
Nəsibli Günel Məhəmməd qızı
Nəsirova Yeganə Gülağa qızı
Nuriyeva Bela Oleqovna
Quliyev Yunis Allahqulu oğlu
Quliyeva Nurlan Səəddin qızı
Qurbanova Nərgiz Tariyel qızı
Qurbanova Təranə Söhrab qızı
Rüstəmova Xalidə Ədalət qızı
Rüstəmova İlahə Məhərrəm qızı
Rzayeva Səbinə Rahil qızı
Seyidov Rza Hüseyn oğlu
Seyidova Rəsmiyyə Bəbir qızı
Səfərova Fəridə Əsgər qızı
Səfiyarova Pərvin Zahid qızı
Səlimova Tatyana Yakovlevna
Şərifova Zəminə Qurban qızı
Şeydayeva Kəmalə Nüsrət qızı
Şirinov Sahil Səhid oğlu
Təhmasib Leyla Arif qızı
Teymurova Samirə Hidayət qızı
Vəliyev Əzizağa Muradxan oğlu
Xasməmmədova Tahirə Oruc qızı
Yaqubova Röya Zahir qızı
Yusubova Afayət Allahverdi qızı
Zeynalova İlhamə Abbas qızı
Zeynalova Səbinə İslam qızı

2. Bu sərəncamın 1-ci hissəsində nəzərdə tutulmuş pul mükafatları Azərbaycan Respublikası Prezidentinin “Ən yaxşı ümumtəhsil məktəbi müsabiqəsinin keçirilməsi Qaydaları və ümumtəhsil məktəblərinə verilmiş mükafatın istifadə istiqamətləri”nin və “Ən yaxşı müəllim müsabiqəsinin keçirilməsi Qaydaları”nın təsdiq edilməsi haqqında” 2008-ci il 25 fevral tarixli 714 nömrəli fərmanının 3-cü hissəsinə uyğun ödənilsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

**Bakı şəhəri, 6 avqust 2013-cü il**

# 2012/2013-cü tədris ilində keçirilmiş "Ən yaxşı ümumtəhsil məktəbi" müsabiqəsinin qaliblərinin mükafatlandırılması haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, "Ən yaxşı ümumtəhsil məktəbi və ən yaxşı müəllim mükafatlarının təsis edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2007-ci il 4 sentyabr tarixli 2373 nömrəli sərəncamının 1-ci hissəsinə uyğun olaraq **qərara alıram:**

1. 2012/2013-cü tədris ilində keçirilmiş "Ən yaxşı ümumtəhsil məktəbi" müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə aşağıda qeyd edilən ümumtəhsil məktəbləri 10000 (on min) manat məbləğində birdəfəlik pul mükafatı ilə mükafatlandırılsın:

Ağstafa şəhəri 2 nömrəli tam orta məktəb
Bakı Dövlət Universiteti nəzdində "Gənc istedadlar" liseyi
Bakı Slavyan Universiteti nəzdində məktəb-lisey kompleksi
6 nömrəli məktəb-lisey
Bakı şəhəri 20 nömrəli məktəb-lisey
Bakı şəhəri 27 nömrəli tam orta məktəb
Bakı şəhəri 29 nömrəli tam orta məktəb
Bakı şəhəri 30 nömrəli tam orta məktəb
Bakı şəhəri 32 nömrəli tam orta məktəb
Bakı şəhəri 35 nömrəli tam orta məktəb
Bakı şəhəri 39 nömrəli tam orta məktəb
Bakı şəhəri 46 nömrəli tam orta məktəb
Bakı şəhəri 70 nömrəli məktəb-lisey
Bakı şəhəri 94 nömrəli tam orta məktəb
Bakı şəhəri 110 nömrəli tam orta məktəb
Bakı şəhəri 160 nömrəli Klassik gimnaziya
Bakı şəhəri 191 nömrəli tam orta məktəb
Bakı şəhəri 220 nömrəli məktəb-lisey
Bakı şəhəri 263 nömrəli tam orta məktəb
Bakı şəhəri 275 nömrəli tam orta məktəb
Bakı şəhəri 287 nömrəli "Zəkalar" liseyi
Bakı şəhəri 308 nömrəli tam orta məktəb
Bakı şəhəri 319 nömrəli tam orta məktəb
Balakən şəhəri 1 nömrəli tam orta məktəb
Bərdə şəhəri akademik Zərifə Əliyeva adına məktəb-lisey
Bərdə şəhəri 3 nömrəli tam orta məktəb
Gəncə şəhəri 4 nömrəli tam orta məktəb
Göyçay şəhəri 3 nömrəli tam orta məktəb
Xəzər Universitetinin Dünya məktəbi
İsmayıllı şəhəri 1 nömrəli tam orta məktəb
İsmayıllı rayonu Lahıc qəsəbə tam orta məktəbi
İsmayıllı rayonu Talıstan kənd tam orta məktəbi
Kürdəmir şəhəri 1 nömrəli tam orta məktəb
Qax şəhəri 2 nömrəli məktəb-lisey
Qazax şəhəri 1 nömrəli tam orta məktəb
Qəbələ şəhəri 4 nömrəli tam orta məktəb
Qəbələ rayonu Vəndam qəsəbə 1 nömrəli tam orta məktəb
Naxçıvan şəhəri 10 nömrəli tam orta məktəb

| | |
|---|---|
| Oğuz rayonu Xaçmaz kənd 1 nömrəli tam orta məktəb | Sumqayıt şəhəri 30 nömrəli tam orta məktəb |
| Ordubad şəhəri 3 nömrəli tam orta məktəb | Sumqayıt şəhəri 31 nömrəli tam orta məktəb |
| Sumqayıt şəhəri təbiət elmləri təmayüllü gimnaziya | Şərur şəhəri 1 nömrəli tam orta məktəb |
| Sumqayıt şəhəri texniki və təbiət elmləri liseyi | Şirvan şəhəri 10 nömrəli tam orta məktəb |
| Sumqayıt şəhəri "İstedad" liseyi | Tovuz rayonu Azaflı kənd tam orta məktəbi |
| | Ucar şəhəri 2 nömrəli tam orta məktəb |
| | "Zəngi" liseyi |

2. Bu sərəncamın 1-ci hissəsində nəzərdə tutulmuş pul mükafatları Azərbaycan Respublikası Prezidentinin "Ən yaxşı ümumtəhsil məktəbi müsabiqəsinin keçirilməsi Qaydaları və ümumtəhsil məktəblərinə verilmiş mükafatın istifadə istiqamətləri"nin və "Ən yaxşı müəllim müsabiqəsinin keçirilməsi Qaydalar"nın təsdiq edilməsi haqqında" 2008-ci il 25 fevral tarixli 714 nömrəli fərmanının 3-cü hissəsinə uyğun ödənilsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

**Bakı şəhəri, 6 avqust 2013-cü il**

***Təhsil islahatı fəaliyyətdədir***

# YENİ DƏRS İLİ, YENİ VƏZİFƏLƏR

**Qulu Novruzov**
***Təhsil Problemləri İnstitutunun direktoru, hüquq üzrə fəlsəfə doktoru***

**Ənvər Abbasov**
***Təhsil Problemləri İnstitutunun direktor müavini, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *təhsil işçiləri, sentyabr konfransları, təhsilin məzmunu, idarəetmə prinsipləri, gələcəyə baxış, inkişaf konsepsiyası, valideyn-məktəb əlaqələri.*

***Ключевые слова:*** *работники образования, сентябрьские конференции, содержание образования, принципы управления, взгляд в будущее, концепция развития, школьно-родительские связи.*

***Key words:*** *educationists, september conferences, education content, managing principles, further development, development conception, parent-school association.*

2013/2014-cü il dərs ili başlandı. Azərbaycanın təhsil işçilərinin qarşısında çox mühüm, qlobal məsələlərin həlli durur. Təhsilimiz özünün yeni mərhələsinə daxil olur. Dünyanın təhsil potensialı onun inkişafının əsasını təşkil edir. Əldə olunmuş bütün nailiyyətlər təhsil sahəsindəki irəliləyişlərin nəticəsi kimi meydana çıxmaqla özünü göstərir. Parlaq gələcək bu günün təhsil sütunları üzərində qurulur. Elmin, təhsilin nailiyyətlərinə əsaslanaraq formalaşır. Ulu öndər Heydər Əliyevin təbirincə demiş olsaq, "Gələcək bilikli, elmli insanların çiyinlərində qurulacaqdır".

Müstəqillik yolunda addımlayan Azərbaycanın inkişafında təhsil önəmli yer tutur. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin dediyi kimi, "Təhsil Azərbaycanın davamlı inkişaf strategiyasının ən önəmli istiqamətlərindən biridir. Azərbaycanın gələcək inkişafı məhz təhsillə bağlıdır."

Bu vaxta qədər təhsilə cəmiyyətin prioritet sahəsi kimi baxılması, onun islahatyönümlü fəaliyyət sahəsinə çevrilməsi məhz bu zərurətdən irəli gəlir.

Təhsil cəmiyyətin döyünən nəbzi, həyatı kimi hər zaman diqqət mərkəzində saxlanılmaqla ona qayğı göstərilir. Artıq neçə illərdir ki, Respublikamızda təhsil işçilərinin sentyabr konfranslarının keçirilməsi bir ənənəyə çevrilmişdir. Hər il müəllimlər sentyabr konfransına toplaşaraq görülmüş işləri təhlil edir, dəyərləndirir, növbəti il üçün vəzifələrini müəyyənləşdirir və onların həlli yolları barədə fikir mübadilələri aparırlar.

Bu il də Azərbaycan Respublikası təhsil nazirinin 15 avqust 2013-cü il tarixli əmrinə əsasən təhsil işçilərinin 2013-cü il sentyabr konfransları keçirilmişdir. Bu konfranslarda 2013/2014-cü dərs ilində ümumi təhsil sahəsində qarşıda duran vəzifələr müzakirə edilmiş və mövcud problemlərin həllinə yönəlmiş

inkişafyönümlü tədbirlərin müəyyənləşdirilməsi məqsədilə "2012/2013-cü dərs ilinin yekunları və qarşıda duran vəzifələr" müzakirə olunmuş, metodik bölmə iclasları təşkil edilmişdir.

Məlum olduğu kimi, artıq təhsil islahatlarının başlandığı vaxtdan 14 ilə yaxın bir zaman keçir. Bu müddətdə təhsilin, demək olar ki, bütün sahələrində müvafiq dəyişikliklərin aparılması onun hansı məzmunda və istiqamətlər üzrə həyata keçirildiyini aydın şəkildə göstərir. Xüsusilə ümumi təhsil sahəsində maddi-texniki bazanın möhkəmləndirilməsi, yeni məzmunun və texnologiyaların yaradılması, müəllim kadrlarının hazırlanması sahəsindəki tədbirlər bilavasitə görülmüş işlərdən və onların keyfiyyət səviyyəsindən xəbər verir. Son illərdə icbari ümumi təhsilin həyata keçirilməsində, yeni tipli tədris müəssisələrinin yaradılmasında, məktəbyaşlı uşaqların təhsillə əhatə olunması üçün təxirəsalınmaz tədbirlərin həyata keçirilməsində, təhsil sahəsi üzrə sosial-iqtisadi inkişaf planlarının, islahatla bağlı müvafiq proqramların hazırlanmasında ardıcıl addımlar atılır. Təhsil sahəsində çalışanlar üçün seminarların, müşavirələrin, konfransların təşkili, digər nazirliklər, idarə, beynəlxalq humanitar və yerli ictimai təşkilatlarla müvafiq istiqamətlər üzrə əlaqələrin inkişaf etdirilməsi ümumi təhsil sahəsinin dinamik inkişafını təmin edir.

Eyni zamanda xüsusi istedada malik uşaqların yaradıcılıq potensialının yüksəldilməsi, Azərbaycan dövlət uşaq müəssisələrindən uşaqların ailələrə verilməsi və alternativ qayğı üzrə Dövlət Proqramının icrası istiqamətində fəaliyyət planlarının reallaşdırılması, ali məktəblərə tələbə qəbulunun nəticələri ilə bağlı vəziyyətin təhlil edilib müvafiq təkliflərin hazırlanması istiqamətində işlər aparılır, yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi istiqamətlərində müvafiq tədbirlər həyata keçirilir, şagird nailiyyətlərinin qiymətləndirilməsi mexanizmlərinin yaradılması istiqamətində işlər davam etdirilir.

Ümumtəhsil məktəbləri üçün 139 adda dərslik və müəllim üçün metodik vəsait 4 milyon nüsxədən yuxarı tirajla nəşr olunmuşdur. Bu dərsliklər II, IV, VI, VIII, IX və X sinifləri əhatə edir. VI sinif dərslikləri ilk dəfədir ki, yeni təhsil proqramları (kurikulumları) əsasında hazırlanmışdır.

Eləcə də yeni təhsil proqramlarının (kurikulumların) tətbiqini səmərəliləşdirmək və keyfiyyətini yüksəltmək məqsədilə müəllim hazırlığı sahəsində tədbirlər həyata keçirilmiş və bu gün də həmin tədbirlər davam etməkdədir.

Nəzərə almaq lazımdır ki, təhsil islahatlarından irəli gələn vəzifələr kimi hər bir bölgədə təhsil müəssisələrinin, o cümlədən bütövlükdə təhsil şöbəsinin, heç şübhəsiz, gördüyü işlər vardır və sentyabr konfranslarında bu işlərin səmərəli və keyfiyyətli olması baxımından təhlili verilməli, irəliləyişlər və geriləmələr aydın şəkildə göstərilməli, onları doğuran səbəblər açıqlanmalı, təkliflər, vəzifələr müəyyənləşdirilməlidir.

Ölkəmizdə ümumi təhsil cəmiyyətin formalaşmasında həlledici rol oynayan bir pillə kimi inkişaf etdirilir. Müasir zamanda onun məqsəd və vəzifələri cəmiyyətin ehtiyac və tələbatlarına uyğun olaraq dəyişir. Təhsil qanununda göstərilir ki, "Ümumi təhsil təhsilalanların fiziki və intellektual inkişafına, zəruri biliklərə yiyələnməsinə, onlarda sağlam həyat tərzinə və sivil dəyərlərə əsaslanan vətəndaş təfəkkürünün formalaşmasına, milli və dünyəvi dəyərlərə hörmət hissinin aşılanmasına, ailə, cəmiyyət, dövlət və ətraf mühit qarşısında hüquq və vəzifələrinin müəyyən edilməsinə imkan yaradır" (1, səh. 27).

Bu xüsusiyyətlər bizdən Azərbaycanda təhsilin yeni fəlsəfəsinə aid müddəaları mənimsəməklə yanaşı, həm də vəzifələrimi-

zi, onlara uyğun olaraq fəaliyyət istiqamətlərimizi müəyyənləşdirməyi tələb edir.

Bu gün ümumi təhsilin prioritet problemlərindən biri kimi onun yeni məzmununun tətbiqi istiqamətində işlər aparılır, yeni təhsil proqramları (kurikulumları) tətbiq olunur. Artıq altıncı ildir ki, bu proses davam etməkdədir. Daha konkret demiş olsaq, bu il əvvəlki siniflərin davamı kimi VI sinifdə yeni təhsil proqramları (kurikulumları) tətbiq olunacaqdır. Bu, iki istiqamətdə çətinliklərin yaranması ilə nəticələnə bilər. Əvvəla, VI sinifdə ümumi tarix, fizika, biologiya, coğrafiya fənləri ilk dəfə tədris olunduğundan müəllimlərin bu baxımdan problemləri yarana bilər. Ona görə də bu fənlər üzrə yeni təhsil proqramlarının (kurikulumların) xüsusiyyətləri ətrafında fikir mübadiləsinin təşkil olunması məqsədəuyğun hesab edilir. İstər plenar iclasdakı məruzədə və istərsə də metodbirləşmə rəhbərlərinin yığıncağında bu fənlərin fəlsəfəsi, məzmun, struktur xüsusiyyətləri, eləcə də həmin fənlər üzrə kurikulumların strukturuna daxil olan hər hansı məsələnin geniş müzakirəsi təşkil olunmuş və müəllimlərin peşəkarlığının inkişafında faydalı ola biləcək təkliflər verilmişdir.

İkinci çətinlik V sinifdən başlayaraq tədris olunan fənlərin VI sinifdə davam etdirilməsi ilə bağlı yarana bilər ki, buna da təbii proses kimi yanaşılmalıdır. Belə ki, fənnin bütün siniflər üçün ümumi cəhətləri olduğu kimi, sinfin səviyyəsindən, standartların və resursların müxtəlifliyindən asılı olaraq müəllimin, eləcə də bu məsələyə cavabdeh olan hər hansı təhsil mütəxəssisinin fəaliyyətindəki fərqli yanaşmaların olması istisna edilmir. Ona görə də fənlər üzrə təhsil proqramlarının (kurikulumların) xüsusiyyətləri ilə bağlı təlim kurslarından keçmiş müəllim və metodistlərin məruzə və çıxışlarının dinlənilməsi, onun ətrafında işgüzar müzakirələrin aparılması təklif olunur. Bu zaman aşağıdakı məsələlərin diqqət mərkəzində saxlanılması zəruri hesab edilir:

• fənn üzrə təhsil standartları, onların xüsusiyyətləri;

• fənn üzrə inteqrasiyanın özünəməxsus cəhətləri və təlim prosesində onun nəzərə alınması;

• fənn üzrə strateji yanaşmalar: iş forması və təlim üsulları, müəllimin fəaliyyətini planlaşdırması (illik və gündəlik planların hazırlanması və ondan istifadə);

• məzmun standartlarının şərh olunması;

• qiymətləndirmə mexanizmləri və onlardan təlim, tədris prosesində istifadə edilməsi.

Əgər nəzərə alınsa ki, fənlər üzrə yeni təhsil proqramlarının (kurikulumların) tətbiqindən o qədər də çox vaxt keçməyib və bu sənədlər üzərində iş zamanı I-V siniflərlə bağlı müəyyən təkliflərin müzakirə olunmasına ehtiyac yaranır, o zaman həmin müzakirələrin keçirilməsi və müvafiq təkliflərin ümumiləşdirilməsi tövsiyə olunur.

Yeni təhsil proqramlarında (kurikulumlarda) fənlər üzrə təlimin məzmunu standartlarla ifadə olunur. Məzmunun bu formada verilməsi bir neçə cəhətdən əhəmiyyət daşıyır. Əvvəla, siniflər üzrə verilmiş məzmun standartları müəyyən tələblər qismində şagirdlərin ümumi inkişafını addım–addım izləməyə imkan verir. İkinci, standartın (nəticənin) verilməsi və ona nail olmaq üçün forma, vasitə və üsuldan ibarət olan strateji fəaliyyətin seçilməsi, onunla işləyən şəxsə (müəllim, dərslik müəllifi və b.) bu məsələ ilə bağlı səlahiyyətlərin verilməsi təhsildə demokratikləşdirmə prinsipinin nəzərə alınmasından irəli gəlir. Bu standartlar ilə işləyən müəllim və ya digər şəxsin standartı reallaşdırmaq üçün real şəraitə uyğun strategiya müəyyənləşdirilməsinə imkan yaranır.

Ona görə də yeni təhsil proqramlarından (kurikulumlardan) istifadə edən müəl-

limdən ilkin olaraq standartlarla işləmək bacarığının formalaşdırılması, özünün illik təqvim – tematik planını hazırlayarkən standartlara, mövcud resurslara yaradıcı yanaşması tələb olunur.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, yeni pedaqogika müəllimin təşkilatçılıq, təlim, perspektiv, komminikativ (ünsiyyət), suqqestiv (təlqinedici), tədqiqatçılıq və elmi–idraki qabiliyyətlərinin olmasını tələb edir. Müasir təhsil konsepsiyası, yeni təhsil proqramları (kurikulumları) isə müəllimlərdə tədqiqatçılıq qabiliyyətini ön plana çəkir, subyektiv bacarıqları yüksək qiymətləndirir.

Yeni təhsil proqramları (kurikulumları) ilə işləyən müəllim bütün fəaliyyəti boyu məntiqi və yaradıcı yanaşma tərzi ilə özünün orijinal konstruktiv və yaradıcı pedaqoji nümunələrini meydana qoya bilər. İlkin təcrübələr göstərir ki, dərsləri yalnız bu yolla quru, sxematik, cansıxıcı təsir dairəsindən çıxarmaq, onu maraqlı bir prosesə çevirmək mümkündür.

Müəllim nəinki elmi anlayışların, çalışma və tapşırıqların seçilməsində, həm də pedaqoji texnologiyaların müəyyənləşdirilməsində, tətbiq olunmasında yaradıcı yanaşma tərzi ilə peşəkarlıq nümayiş etdirməli, dərs dediyi şagirdlərinin marağına səbəb olan fəaliyyət nümunəsi göstərməlidir.

Sentyabr konfranslarında, xüsusən bölmələrin işində müəllimlərin fənlər üzrə təhsil proqramları (kurikulumları) üzərində işlə bağlı qarşılıqlı təcrübə mübadilələrinin təşkil olunması, praktik nümunələr üzərində şərhlərin aparılması tövsiyə olunur. Eyni zamanda şagirdlərin inkişafını izləməyə imkan yaratmayan, onların yaş səviyyələrinə uyğun fəaliyyətlərini qurmaqda çətinlik yaradan standartlarla bağlı qənaətlərin ümumiləşdirilməsi onların təkmilləşdirilməsi və keyfiyyətinin yüksəldilməsi baxımından əhəmiyyətli hesab edilir.

Bu gün təlim prosesinin daha səmərəli qurulmasında dərslik mühüm vasitələrdən biri kimi aparıcı rol oynayır. Ümumiyyətlə, dərslik təhsilin məzmununu ifadə edən əsas komponentlərdən biri hesab edilir. Ənənəvi olaraq dərslik özünün yeganə məlumat mənbəyi olmaq statusunu uzun illər saxladığından ondan istifadə edənlər də dərsliyə dəyişilməz standart kimi yanaşmaqda davam edirlər. Son dövrlərdə dərsliklərlə bağlı vahid standart tələblər ətrafında müzakirələrin aparılması məhz bu səbəblə bağlıdır. Mahiyyət etibarı ilə dərslik müəllif və ya müəlliflər qurupu tərəfindən orijinal prinsiplər əsasında hazırlanan və özünəməxsus sistemi olan, standart tələblərə nail olmaqda texnoloji vasitə kimi çıxış edən vəsaitdir. Bütün bunlarla yanaşı, həm də nəzərə alınmalıdır ki, şagirdə verilən hər bir resursun, o cümlədən dərsliyin elmi-metodik cəhətdən düz olması təkzibolunmaz bir həqiqətdir.

Nəticəyönümlü təhsil sistemində standartların qəbul olunması və onun reallaşmasının zəruriliyi monitorinq və qiymətləndirmənin həmin standartlar əsasında aparılmasını tələb edir. Bu zaman bütün istifadə olunan vasitələr, o cümlədən dərsliklər standartlara nail olmaqda müəllimin yardımçısına çevrilir. Müəllim standart tələblərə çatmaq üçün öz sinif şəraitinə və şagirdlərinin səviyyələrinə uyğun olaraq resursların, o cümlədən dərsliyin imkanlarını araşdırır. Ona yaradıcı yanaşmaqla nələri isə əlavə, yaxud əvəz edə bilir. Bu gün informasiyaların bolluğu, informatlaşma prosesinin baş verdiyi bir zamanda dərsliyin yeganə məlumat mənbəyi kimi funksiyasını dəyişməkdə davam etməsi təbiidir. Təhsildə kompetensiyaların formalaşdırılmasının zəruriliyi, standartlaşma prosesinin yaranması istər–istəməz müəllimin həmin standartların tələbinə uyğun nəticələrə gəlməsini və bu zaman mövcud resurslara yaradıcı yanaşmasını tələb edir. Variativ dərsliklərin meydana

gəlməsi və genişlənməsi də məhz bu səbəblə izah olunur.

İslahatların həyata keçirildiyi hazırkı şəraitdə müəllimləri daha çox maraqlandıran məsələlərdən biri yeni təlim strategiyalarıdır. "Təlim strategiyası – təhsil prosesində istifadə olunan forma, metod, üsul və vasitələrin məcmusudur" (2, səh. 468).

Bu gün təlim strategiyaları anlayışı ilə yanaşı, həm də "təlim texnologiyaları" anlayışı da işlənir. " Təlim texnologiyası - didaktik sistemin prosessual tərkib hissəsidir". "Pedaqoji texnologiya isə planlaşdırılmış təlim nəticələrinə nail olan prosesin təsviridir" (3, səh. 5-6).

Bölmə iclaslarında elmi anlayış kimi yeni pedaqogikaya gəlməkdə olan, normativ-hüquqi sənədlərimizdə işlənən bir sıra belə pedaqoji terminlər ətrafında müzakirələrə də geniş yer verilmişdir. Lakin başlıca məsələ müəllimləri yeni təlim strategiyaları ilə işləməyə istiqamətləndirməkdən, onların bu texnologiyalardan şüurlu şəkildə istifadə etmələrinə nail olmaqdan ibarətdir.

Müəllimlərlə söhbətlər, müzakirələr onu göstərmişdir ki, onların əksəriyyəti fəal təlim anlayışını qruplarla iş forması kimi başa düşürlər. Bu isə ona gətirib çıxarır ki, onlar bütün fəal təlim nümunələrini qruplarla iş formasında hazırlayır və təqdim edirlər. Əslində isə fəal təlim müəllim ilə şagirdin əməkdaşlığı şəraitində qurulan təlim prosesidir. Belə şəraitdə yalnız qruplarla iş formasından deyil, həm də fərdlərlə, cütlərlə və kollektivlə iş formalarından da istifadə olunur. Ona görə də fəal təlim şəraiti yaratmaq istəyən hər bir müəllim onun üçün müəyyən olunmuş pedaqoji tələbləri düzgün bilməli və ondan yerində istifadə etməyi bacarmalıdır.

Dərs də təlimin əsas təşkilat forması kimi müəllimlərin istifadə etdiyi təlim texnologiyalarından biridir. Fənlər üzrə yeni təhsil proqramlarında (kurikulumlarda) bu ehtiyac nəzərə alınmaqla orada dərsin məzmun və strukturuna aid tövsiyələr və dərs planı nümunələri verilmişdir. Eləcə də, pedaqoji mətbuatda müəllimlərin öz təcrübələrinə əsasən hazırladıqları dərs nümunələri çap olunmuşdur. Lakin buna baxmayaraq, dərs təlimin təşkili forması kimi həmişə müzakirə obyekti olaraq qalmaqdadır.

Ənənəvi olaraq pedaqoji mənbələrdə, xüsusən metodik ədəbiyyatlarda dərsin məzmunu, strukturu, mərhələləri konkret olaraq verilməklə onları öz fəaliyyətində gözləmək müəllimlərə tövsiyə olunurdu. İnzibati təhsil sitemində xarakterik yanaşma tərzi kimi buna həmişə məqbul bir təcrübə kimi baxılmışdır. Müşahidə və təcrübələr göstərir ki, həmin təcrübə bu gün də davam etməkdədir. Hətta fəal təlimin təşkili formalarından, xüsusən dərsdən bəhs edən mütəxəssislərimiz demokratik bir təhsil sisteminin qurulduğu hazırkı şəraitdə dərs texnologiyasını dəyişməz, standart bir forma kimi müəllimə təqdim edirlər. Belə bir yanaşma tərzi kompetensiyaların və təhsil standartlarının reallaşdırılmasını qarşıya məqsəd qoyan təhsil sistemində müəllimin strategiyalar hazırlamaqda yaradıcılıq imkanlarını məhdudlaşdırır, onları qəlibə salır.

Demokratik prinsiplər əsasında qurulan təhsil sistemində onun təşkili formalarından biri kimi dərsin funksiyaları koqnitiv (idraki) xarakter alır. Müəllimin yaradıcı fəaliyyətinin müqabilində qeyri-standart bir forma daşımağa başlayır. Qeyri-standartlıq müasir dərsin əsas atributlarından biri kimi dəyərləndirilir. Müşahidələr göstərir ki, məqamına görə dərs-müzakirə, dərs-ekskursiya, dərs-konfrans və s. kimi qeyri-standart dərs formalarından istifadə olunması təcrübəsi yaranmaqda davam edir. Bölmə iclaslarında bu məsələlərə münasibət bildirilməsinə ehtiyac vardır.

Əslində isə planlaşdırılaraq həyata keçirilən dərs təhsilimizin tarixi boyu

müəllimin imkanları daxilində qurulan yaradıcı fəaliyyət nümunəsi olmuşdur. Qabaqcıl müəllimlər öz zəngin təcrübələrinə istinad edərək orijinal dərs nümunələri yaratmışlar. Onlara təklif olunan standart modelləri şagird marağının tələbinə uyğun olaraq daha təkmil formaya salmaqla genişləndirmişlər. Belə təcrübələr həmişə müsbət qarşılanmışdır. Bu gün də onu davam etdirmək səmərəli təcrübə kimi dəyərləndirilir və müəllimlərə həmin istiqamətdə tövsiyələrin verilməsi faydalı hesab edilir.

Plenar və bölmə iclaslarında şagird fəaliyyətlərinin qiymətləndirilməsi məsələlərinin müzakirə obyektinə çevrilməsi qiymətləndirmə fəaliyyətinin təkmilləşdirilməsi baxımından faydalı olmuşdur.

Məlum olduğu kimi, ölkəmizin təhsil sistemində şagird nailiyyətlərinin qiymətləndirilməsi siyasətinin formalaşdırılması istiqamətində xeyli iş aparılmışdır. İlk növbədə normativ-hüquqi bazanın formalaşdırılması ilə bağlı hökumətin 2006-cı ildə təsdiq etdiyi “Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)” sənədində “ Ümumi təhsil sistemində şagird nailiyyətlərinin qiymətləndirilməsi”nə dair tələblər müəyyənləşdirilmiş, 2009-cu ildə isə “Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası” qəbul olunmuşdur. Nazirlər Kabinetinin 2010-cu ildə təsdiq etdiyi “Ümumi təhsilin dövlət standartları və proqramları (kurikulumları)” sənədində isə “Təlim nailiyyətlərinin (nəticələrinin) qiymətləndirilməsi və monitorinqi” adlı bölmə verilmişdir. Eləcə də Azərbaycan Respublikası təhsil naziri tərəfindən təsdiq olunmuş fənlər üzrə təhsil proqramlarına (kurikulumlara) “Şagird nailiyyətlərinin qiymətləndirilməsi” adda bölmə daxil edilmişdir. Normativ-hüquqi bazanı möhkəmləndirməyə xidmət edən bu sənədlərdə daha çox şagird nailiyyətlərinin qiymətləndirilməsi ilə bağlı ümumi məsələlər əhatə olunmuşdur. Əsasən qiymətləndirmənin məqsəd və vəzifələri, əhəmiyyəti, növləri, formaları barədə konseptual xarakterli fikirlər ifadə olunmuşdur. Biz bu məsələlər ətrafında fikir mübadiləsi aparmaqla daha çox müasir təhsilimizin prioritet məsələsi kimi qiymətləndirmənin ümumi fəlsəfi, metodoloji aspektlərdə mahiyyətini dərk edir, onun tətbiqi ilə bağlı potensial imkanlarımızı genişləndirmiş oluruq. Eyni zamanda qiymətləndirmənin humanist təhsil texnologiyalarından biri kimi tətbiq olunması barədə praktik fikirlər söyləmək imkanı əldə edirik.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, Təhsil Nazirliyinin xüsusi məktubla məktəblərə göndərdiyi şagird nailiyyətlərinin qiymətləndirilməsi barədə prosedur qaydalar da vardır ki, onlar da məktəbə, müəllimlərimizə kömək məqsədi ilə hazırlanmışdır.

Əvvəla, onu nəzərə almaq lazımdır ki, şagird nailiyyətlərinin qiymətləndirilməsi sistemi özündə qiymətləndirmənin prinsiplərini, məzmununu (qimətləndirmə standartlarını), qiymətləndirmə vasitələrini, qiymətləndirmənin növ və formalarını əhatə edir. Eyni zamanda qiymətləndirmə sisteminin tətbiqi üçün zəruri prosedur qaydalar tələb olunur. Hazırda bu sistemin tamamlanması üzrə iş aparılır. Ancaq onu nəzərə almaq lazımdır ki, müəllimlər mövcud qiymətləndirmə sənədləri əsasında özlərinin işini davam etdirə bilərlər. Şagird nailiyyətlərinin qiymətləndirilməsi üzrə hansı sahələrdə boşluqların olduğu hiss edilərsə, o zaman fəal və qabaqcıl müəllimlərdən ibarət işçi qrupu düzəldərək həmin boşluğu doldurmaq üçün müvəqqəti olaraq tədbirlər müəyyənləşdirmək, istifadəyə yararlı tələblər hazırlamaq olar və bu barədə əlaqədar distansiyalara ardıcıl və sistemli hesabatlar, məlumatlar verməklə fəaliyyətlərini qura bilərlər.

Təcrübələr onu göstərir ki, müəllimlər subyektiv mülahizələrinə əsasən hansısa

qiymətləndirmə növünü daha önəmli hesab etməklə onu qabarıqlaşdırmağa, başqalarından fərqləndirməyə çalışırlar. Nəzərə alınmalıdır ki, hər bir qiymətləndirmə növü öz mövqeyinə görə əhəmiyyətli hesab edilir və əvəzolunmazdır. Lakin şagirdlərin bilik, bacarıq və keyfiyyətləri summativ (ümumiləşdirici) qiymətləndirilmənin nəticəsi olaraq dəyərləndirilir və şagird bu qiymətləndirmə növünün nəticəsi olaraq bir səviyyədən digər səviyyəyə keçir. Ona görə də qərarların qəbul olunmasında summativ qiymətləndirmənin nəticələrindən istifadə olunur. Digər qiymətləndirmə növləri onu əvəz edə bilmir.

Heç şübhəsiz, şagird nailiyyətlərinin qiymətləndirilməsi prosesində hansı mexanizmlərin çətinlik yaratması, işləməməsi, yaxud müəllim və şagirdlərin potensial imkanlarından kənar olması plenar və bölmə iclaslarında müzakirə olunmaqla kollegial qərarlar qəbul edilmiş və təkliflər verilmişdir.

Təhsilin, məktəbin yenidən qurulduğu hazırkı şəraitdə onun normativ-hüquqi qaydalara uyğun idarə olunması səriştə və bacarıq tələb edir. Əslində bu, təhsilin inkişafında idarəetmə mədəniyyəti kimi diqqəti cəlb edən, bacarıqlar sistemindən ibarət keyfiyyət göstəricisidir. Bu bacarıqların formalaşması üçün ardıcıl və sistemli qaydada iş aparmaq, məktəb rəhbərlərinin liderlik imkanlarını meydana çıxarmaqla onun bir dəyər kimi formalaşmasına çalışmaq vacib hesab edilir. Təəssüflə qeyd etmək lazımdır ki, bu baxımdan arzu və istəklərimiz çox olsa da, fəaliyyətlərimiz onları reallaşdırmağa imkan vermir. Təhsilin pillələrində zəif ixtisasyönümlü iş aparılır. Ona görə də plenar və bölmə iclaslarında təhsil müəssisələrinin, o cümlədən ümumi təhsil müəssisələrinin idarə olunması məsələləri ətrafında geniş müzakirələr aparılmışdır.

Məlum olduğu kimi, ümumi təhsilin idarə olunması onun sistemli və məqsədyönlü fəaliyyətinin əsasını təşkil edir. Görünür, elə bu səbəbdən də təhsil qanununda təhsil müəssisələrinin idarə olunmasına ayrıca maddə ayrılmışdır. Orada göstərilir ki, “Təhsil müəssisəsi aşkarlıq, şəffaflıq və demokratik prinsiplər əsasında bu Qanuna, digər normativ-hüquqi aktlara və öz nizamnaməsinə uyğun idarə edilir” (1, səh.47).

“Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları)” sənədində göstərildiyi kimi, “Ümumi təhsilin idarə olunması hesabatlılıq, məsuliyyətin bölüşdürülməsi və inkişafın monitorinqi prinsipləri əsasında həyata keçirilir”. Bu prinsiplərin hər birinin nəzərə alınması müasir təhsil texnologiyalarından istifadə zamanı mümkün olur. Ona görə də plenar və bölmə iclaslarında ümumi təhsilin idarə olunmasında müasir mexanizmlərdən istifadə olunması üzərində dayanmaqla daha səmərəli idarəetmə təcrübələrini nümayiş etdirmək, onlardan daha geniş miqyasda istifadə olunması barədə qərara gəlmək olar. Eyni zamanda zərərli təcrübələrin aradan qaldırılması üçün faydalı təkliflər vermək olar.

İstedadlı uşaqlarla iş aparmaq Azərbaycanda təhsil siyasətinin mühüm bir istiqamətini təşkil edir. Azərbaycan Respublikası Konstitusiyasının 47-ci maddəsində təsbit olunmuş belə bir müddəa vardır: “Maddi vəziyyətindən asılı olmayaraq istedadlı şəxslərin təhsili davam etdirməsinə dövlət zəmanət verir” (4, səh. 15). Eləcə də təhsil qanununda qeyd olunur ki, “Dövlət maddi vəziyyətindən asılı olmayaraq, istedadlı şəxslərin təhsilini davam etdirməsinə təminat verir, sosial müdafiəyə ehtiyacı olanların təhsil almasına şərait yaradır” (1, səh.13). Məlum olduğu kimi, bu gün respublikamızın yeddi məktəbində istedadlılardan ibarət sinif təşkil olunmuş və dərslər keçilməkdədir. Bu eksperimental siniflərdə

şagirdlərin məntiqini, nitq mədəniyyətini inkişaf etdirmək, onların yaradıcı təfəkkürlərini formalaşdırmaq prioritet istiqamətlər kimi diqqət mərkəzində saxlanılır.

İstedadlılarla iş daha geniş miqyasda anlaşıldığından onun reallaşdırılmasını ölkənin hər bir yerində, hər bir təhsil müəssisəsində, hətta hər bir sinifdə izlənilməsi vacib hesab edilir. Bu məsələ uşaqlarla işləyən hər kəsin diqqət mərkəzində olmaqla onun vətəndaşlıq borcuna çevrilməli, ölkənin təhsil siyasətindən irəli gələn bir vəzifə kimi həll edilməlidir. Plenar və bölmə iclaslarında istedadlıların müəyyən olunması, sinif şəraitində onlara fərdi yanaşılması, onların inkişaf etdirilməsi üçün texnologiyaların hazırlanması istiqamətində aparılan müzakirələr və fikir mübadilələri də öyrənib ümumiləşdirilməlidir.

Müzakirə obyekti olan məsələlərdən biri də məktəb və valideyn münasibətlərinin yenidən qurulmasıdır. Məlum olduğu kimi, məktəb və valideyn əlaqələrinin qurulması pedaqoji məsələ kimi həmişə aktual olmuşdur. Lakin informasiyalı cəmiyyətin yarandığı, məlumatların ariyalının genişləndiyi bir zamanda təhsilin məzmununu yeniləşdirmək, təşkilini daha səmərəli qurmaq üçün məktəbin fəaliyyət imkanlarının genişlənməsinə yardım göstərən qüvvələrdən istifadə olunmasına ehtiyac yaranır. Valideyn bunların içərisində maraqlı olan tərəf kimi ən etibarlı qüvvədir. O, müasir təhsil şəraitində özünün əvvəlki seyrçi funksiyasını dəyişməli, məktəbin idarə olunmasında və tədris prosesində fəal iştirakçıya çevrilməlidir. Əks halda məktəb şagirdlərin təlim-tərbiyəsində öz missiyasını yerinə yetirməkdə çətinlik çəkəcəkdir. Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarov Ümummilli lider Heydər Əliyevin 90 illik yubileyinə həsr olunmuş məktəblilərin respublika inşa yazı müsabiqəsi qaliblərinin mükafatlandırılması mərasimindəki çıxışında bu məsələyə münasibətini belə bildirmişdir: “Məktəb elə bir məkandır ki, burada biz uşaqlarımızın mənəviyyatınınn əsasını qoyuruq. Məktəbdə hökm sürən psixoloji atmosfer övladlarımızın gələcək həyat yoluna mənəvi dəyərlərinə və əqidələrinə, milli identifikasiyasına və vətəndaşlıq hislərinə bilavasitə təsir göstərir... Mən bu məsələdə valideynlərin də rolunu qeyd etmək istərdim. Təhsil sahəsində Nazirliyin və ya təhsil müəssisəsinin təkbaşına səyləri ilə vəziyyətin düzəldilməsinə inanmaq sadəlövhlük olardı. Bu, eyni zamanda hər bir ailənin və bütövlükdə cəmiyyətin ümumi işidir. Bizim mövqeyimiz ondan ibarətdir ki, məktəblərin idarə olunmasında və təhsil ocaqlarında müsbət atmosferin yaradılmasında valideynlərin rolu artmalı, bunun üçün islahatlar aparılmalıdır” (5).

Qeyd olunan bu məsələlər ciddi pedaqoji müddəalar kimi gündəmə gətirilməli, müzakirələrin tezislərinə çevrilməlidir. Məktəb-valideyn müstəvisində qarşılıqlı fikir mübadiləsindən irəli gələn və çoxluğun qəbul etdiyi optimal fikirlər əsasında təkliflər verilməlidir.

Mühüm bir məsələ - müəllimlərin hazırlığı məsələsi də sentyabr konfranslarının gündəmində dayanan məsələlərdən olmalıdır. Çünki təhsil islahatının ən zəruri istiqamətlərindən biri onun hərəkətverici qüvvələrinə çevrilən müəllim kadrlarının pedaqoji-psixoloji cəhətdən inkişaf etdirilməsi, peşəkarlıq cəhətdən müasir texnologiyalarla işləməyə hazırlanmalarıdır.

Artıq neçə vaxtdır ki, hər il minlərlə ibtidai sinif və fənn müəllimi təlim kurslarına cəlb olunur, onlara yeni təlim texnologiyaları ilə işləmək üçün sertifikatlar verilir. Keçilən bu kurslar müəllim hazırlığının tələblərinə tam cavab verirmi? Yaxud ongünlük təlim kursları müəllimin peşəkarlıq səviyyəsinin yüksəldilməsi baxımından kifayət edirmi, yoxsa davamlı kursların yaradıl-

masına ehtiyac vardır? Müəllim hazırlığının həyata keçirildiyi ali və orta ixtisas təhsili müəssisələrində ilkin müəllim hazırlığı üzrə hansı məsələlərə xüsusi diqqət yetirilməlidir? Yaxud da hər hansı digər bir pedaqoji yanaşma tərzindən istifadə olunmalıdır? Söz yox ki, bu məsələlərə də pedaqoji ictimaiyyət tərəfindən münasibət bildirilməlidir. Eyni zamanda məktəblərin pedaqoji-metodik laboratoriyaya çevrilməsi, müəllimin ardıcıl və sistemli olaraq elmi-metodik təminatının ödənilməsi üçün potensial imkanın gücləndirilməsi istiqamətində tədbirlər həyata keçirilməlidir.

Nəticə olaraq qeyd etmək lazımdır ki, bu il uğurla keçirilən sentyabr konfransları ölkə üzrə qəbul olunmuş "Azərbaycan-2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasına əsasən fəaliyyətlərdə yeni mərhələnin başlandığı bir dövrə düşmüşdür (6). Xüsusən ümumi təhsil sahəsində, onun müddətində, keyfiyyətində, infrastrukturunda, eləcə də digər sahələrində böyük dəyişikliklərin gözlənildiyi bir zamanda islahatların daha da genişlənəcəyini nəzərə alaraq bu barədə öz ideyaları ilə töhfələr vermək hər bir pedaqoji ictimaiyyət üzvünün vətəndaşlıq borcu hesab edilir.

Ümidvarıq ki, bu məqalədə qeyd olunan, yaxud təhsil islahatları çərçivəsində zəruri hesab edilən bütün məsələlər yeni dərs ilində pedaqoji işçilərin diqqət mərkəzində duracaq və bu problemlərinin həlli üçün lazımi təşkilatçılıq işi aparılacaqdır.

**İstifadə edilmiş ədəbiyyat**

1. "Təhsil haqqında" Azərbaycan Respublikasının qanunu. Bakı: Hüquq ədəbiyyatı, 2000.

2. Ümumi təhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı: Təhsil, 2008.

3. Педагогические технологии: Учебное пособие для студентов педагогических специальностей / Под общей ред. В.С. Кукушина М.: "Март", 2004.

4. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı: Qanun, 2005.

5. http: // www.muallim.edu.az/arxiv/2013/17/06.htm

6. http: www.azertag.com/sites/default/files/Bolmeler/Siyaset/azarbaycan-2020-galacaya-baxish-konsepsiyasi-en-yeni.pdf

**Г.Новрузов,**
**Э.Аббасов**

**Новый учебный год, новые задачи**

**Резюме**

В статье говорится о задачах, актуальных для общеобразовательных школ в 2013-2014 учебном году, обсужденных в сентябрьской конференции 2013 г. Раскрывается сущность проблем содержания образования, технологий, а также характеризуются возможные трудности, встречающиеся в области оценивания перед учителями.

**G.Novruzov**
**A.Abbasov**

**New school year, new duties**

**Summary**

The article is dedicated to the issues for the 2013-2014 th school year for the secondary schools of Azerbaijan Republic which discussed in september conferences. The content of general education, new technologies and managing problems, challenges on assessment are characterized, and eliminating approaches are determined.

# TƏHSİL İSLAHATI VƏ ONUN DAŞIYICILARI

**Aysəba Məmmədova**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti***

***Açar sözlər:*** *təhsil islahatı, ümumi təhsil sistemi, proqram, təhsil konsepsiyası, müasir müəllim.*

***Ключевые слова:*** *реформа образования, общеобразвательная система, программа, концепция образования, современный учитель.*

***Key words:*** *educational reforms, general education system, program, educational conception, contemporary teacher.*

Ölkəmizdə aparılan təhsil islahatlarının əvvəlcədən düşünülüb müəyyən olunmuş nəticələr üzərində qurulmasını təsdiq edən və özülü ulu öndərimiz Heydər Əliyevin "Təhsil millətin gələcəyidir" müddəası ilə qoyulan ən mühüm sənəd 1999-cu il iyunun 15-də təsdiq olunan "Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı"dır [1].

Proqrama görə, islahatın ümumi təhsilin ən vacib sahələrində aparılması nəzərdə tutulmuşdur. Buraya aid edilən məsələlərdən biri də, ümumi təhsilin məzmununun yeniləşdirilməsidir.

Ümumi təhsilin məzmun islahatları ölkə Prezidenti cənab İlham Əliyevin verdiyi sərəncamlar və qəbul olunmuş sənədlərə uyğun mərhələlərlə həyata keçirilmiş və hazırda uğurla davam etdirilir.

Ölkəmizdə ümumi təhsil sistemində məzmun dəyişiklikləri təlim-tədris prosesinin sistemli planlaşdırılmasını özündə əksetdirən "Kurikulum islahatları" adı altında aparılır.

İslahat proqramından irəli gələn vəzifə kimi ilk dəfə 2006-cı il 30 oktyabrda "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)" dövlət sənədi hazırlanmışdır və onun əsasında ümumi təhsil məktəblərində tədris olunan fənlərin kurikulumları işlənmişdir [2].

Sonradan "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununa müvafiq olaraq 2010-cu ildə bu sənəd "Ümumi təhsilin dövlət standartları və proqramları (kurikulumları)" adı ilə yenidən işlənərək təsdiq olunmuşdur [3, 4].

Ölkə Prezidentinin təhsilə diqqət və qayğısını əks etdirən mühüm hadisələrdən biri də "2011-2020-ci illərdə Azərbaycan təhsilinin inkişafı üzrə Milli Strategiya"nın hazırlanması haqqında 11 iyul 2011-ci il tarixli Sərəncamıdır.

İslahatların aparılmasında müəllimlərin rolunun böyük olduğunu nəzərə alaraq Təhsil Nazirliyi tərəfindən müəllim hazırlığının səviyyəsinin yüksəldilməsinə yönəldilmiş bir sıra mühüm sənədlər, o cümlədən "Fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiyası və strategiyası" sənədi hazırlanmış və Azərbaycan Hökuməti tərəfindən təsdiq olunmuşdur [5].

Yeni təhsil konsepsiyasının, yeni məzmun, yeni texnologiya və qiymətləndirmə sisteminin məktəblərdə tətbiq edilməsi müəllimin də öz fəaliyyətini müasir səviyyədə qurmasını tələb edir.

Müasir müəllim sadəcə olaraq təlim məqsədlərini qurmaqla işini tamamlamamalı, o, həm də fəal təlim üçün zəruri baca-

* 2

rıqlara malik olmalı, təlim və tədris prosesində bir sıra mühüm funksiyaları yerinə yetirməlidir.

Bu baxımdan müasir müəllim üçün vacib olan əsas keyfiyyətləri aşağıdakı kimi sistemləşdirmək olar:



Hazırda ümumtəhsil məktəblərində məzmunun öyrənilməsinin və tətbiqinin səmərəliliyini artıran, şagirdlərin dərketmə fəaliyyətini daha da gücləndirən fəal/interaktiv təlimdən istifadəyə üstünlük verilir. Fəal dərsin səmərəli keçməsi üçün vacib olan şərtlər, müəllimin planlaşdırma və bələdçilik (fasilitasiya) bacarıqlarına malik olmasıdır.

Müəllim, ilk növbədə Z.Veysovanın təklif etdiyi ardıcıllıqdan yaradıcılıqla istifadə etməklə fəal dərsin planını işləyib hazırlamalıdır [6].

Planda aşağıdakılar nəzərdə tutulur:

1. Dərsin məqsədini və növünü müəyyən etmək;

2. Dərsin motivasiyasını işləyib hazırlamaq;

3. Tədqiqat sualını qısaca ifadə etmək və tədqiqat aparma mərhələsini planlaşdırmaq;

4. Fasilitasiya üçün suallar hazırlamaq;

5. İnformasiyanın təşkilinin mühüm üsullarını müəyyən etmək və ideyaları çıxarmalı olan nəticələri qısaca ifadə etmək;

6. Dərsin hər bir mərhələsinə sərf olunan vaxtı, qiymətləndirmənin metod və üsullarını, dərsin təchizatı üçün lazım olan ləvazimatları və işin gedişinin səmərəli yollarını müəyyən etmək.

Planlaşdırmanı başlayarkən müəllim 4 əsas suala cavab verməlidir.

1. Nə öyrədilməli?

2. Necə öyrədilməli?

3. Hansı şəraitdə öyrədilməli?

4. Nəticələri necə qiymətləndirmək olar?

Fəal təlim prosesində şagirdləri biliklərə aparan yolda müəllimin bir bələdçi kimi əsas təyinedici rolu fasilitasiya (ingilis dilində fasilitation − əlverişli şərait yaratma) adlanır. Fasilitasiya prosesində müəllim sistemli, ardıcıl və məqsədyönlü şəkildə şagirdlərlə əməkdaşlıq edir, tədqiqat məqsədlərinin qoyulmasında şagirdlərə istiqamət verir, bunların həllində metodik kömək göstərir.

Müəllimin vəzifəsi öyrənməyi öyrətməkdir. Belə ki, o, təlim fəaliyyətinin əsas tərkib hissələrini mənimsəməkdə şagirdə kömək edir, eyni zamanda özü biliklərin əldə edilməsinə və tətbiqinə aid zəruri əqli üsul və vasitələrə praktik cəhətdən yiyələnir.

Fasilitasiya aşağıdakılara əsaslanır:

• müəllim və şagirdlərin əməkdaşlığı, onların qarşılıqlı hörmət və etibarı;

• şagirdlərin olduqları kimi qəbul edilməsi və onların müəllim tərəfindən daim dəstəklənməsi;

• müəllimin şagirdlərin qabiliyyətlərinə olan inamı;

• təfəkkürün stimullaşdırılması;

• şagirdlərdə idrak motivasiyasının yaradılması;

• müəllimin sinifdəki mühitlə bağlı xüsusi həssaslığı.

Fəal dərsin səmərəli keçməsi üçün aşağıdakı qaydalar müəyyənləşdirilmişdir.

1. Fikrin təhrik edilməsi.

2. Psixoloji dəstəklənmə.

3. Məlumatla təminetmə.

4. Təşkilati dəstək.

Müəllimin öyrədici vəzifəsi. Kimya müəlliminin öyrədici vəzifəsi şagirdlərin müstəqil olaraq kimya elminin və sənayesinin əsaslarına, kimyanın xalq təsərrüfatında və məişətdə tətbiqinə aid biliklər qazanmasına və onun yaradıcı şəkildə tətbiq etmə bacarığına yiyələnməsinə nail olmaqdır.

Tərbiyəedici vəzifə. Kimyanın tədrisi prosesində şagirdlərdə elmi dünyagörüş formalaşdırılmalı, ideya-siyasi əqidə, azərbaycançılıq, dözümlülük, cəsurluq, prinsipiallıq, liderlik və cəld qərarlar qəbuletmə bacarığı, çeviklik və s. tərbiyə olunmalı və onların sağlamlığının qorunması (kimyəvi maddələrlə işləyərkən ehtiyatlı olmaq və s.)

qayğısına qalınmalıdır.

İnkişafetdirici vəzifə. Kimya müəllimi fəal təlimin üsullarından istifadə etməklə, dərs prosesində və sinifdənkənar işlərdə şagirdlərin idrakını, marağını, nitqini, tənqidi, tətbiqi, yaradıcı təfəkkürünü, təxəyyülünü və s. qabiliyyətlərini inkişaf etdirməlidir.

Məktəbliləri peşəyə istiqamətləndirmək funksiyası. Kimya müəllimi kimya elminin əsaslarını və kimyəvi maddələrin xalq təsərrüfatında tətbiqini öyrədən zaman onlarda peşəyə maraq yaratmaq funksiyasını yerinə yetirə bilər.

Müəllimin ictimai-siyasi vəzifəsi. Digər fənn müəllimləri kimi, kimya müəllimi də ölkəmizin ictimai-siyasi həyatında, kütləvi siyasi tədbirlərdə iştirak etməli, hökumətin qərar və göstərişlərini öyrənməli və öz fəaliyyətlərində, eləcə də şagird və valideynlərin maarifləndirilməsində onları rəhbər tutmalıdır.

Konstruktiv (əməli) fəaliyyət. Kimya müəlliminin konstruktiv fəaliyyəti dedikdə, əsasən, onun təlim-tərbiyə materiallarını şagirdlərin bilik səviyyələrinə, dərsin məqsədinə uyğun şəkildə seçə bilməsi, tədris prosesində onların fərdi xüsusiyyətlərini nəzərə alması, kimya eksperimentinin müxtəlif növləri ilə əlaqədar resursları əvvəlcədən hazırlaması və s. nəzərdə tutulur.

Təşkilatçılıq və idarəedicilik fəaliyyəti. Kimya müəlliminin təşkilatçılıq və idarəedicilik fəaliyyəti dedikdə, fəal dərsi İKT və nümayiş eksperimentindən istifadə etməklə pedaqoji və metodiki cəhətdən səmərəli təşkil etmək, şagirdlərin praktik fəaliyyətini aktivləşdirmək, onları ictimai işlərə cəlb etmək, uşaqlar arasında düzgün vəzifə bölgüsü aparmaq, dərsdənxaric vaxtlarını və işlərini məqsədyönlü planlaşdırmaq və s. nəzərdə tutulur.

Müəllimin kommunikativ (ünsiyyət) funksiyası. Kimya müəlliminin bu funksiyası şagirdlər, eləcə də şagirdlə müəllim arasında əlaqə və münasibətlərdə əməkdaşlığı düzgün təşkil etməkdə, müəllimin özünü və kimya fənnini onlara sevdirməkdə, bir sözlə, sağlam psixoloji mühit yaratmaqda özünü göstərir.

Tədqiqatçılıq fəaliyyəti. Kimya müəlliminin tədqiqatçılığı sinfin fəaliyyətinin tədqiqatı, şagirdlər üzərində müşahidə və dərsin təhlili zamanı dərslik və digər ədəbiyyatlarda verilən məlumatlara öz münasibətlərini bildirdikdə, dərsə aid üsul, priyom və əyani vəsaitləri seçəndə, şagirdlərin tədqiqatçılıq fəaliyyətinə bələdçilik edəndə, özü kimya, kimyanın tədrisi metodikası üzrə müxtəlif tərkibli elmi-tədqiqat işlərində iştirak etdikdə, kitabça, metodik vəsait, məqalə hazırlayanda, həmkarları ilə təcrübə mübadiləsi etdikdə həyata keçirilir.

Prof. Ə.Əlizadənin müasir təhsil nəzəriyyəsinin əsasını təşkil edən “təhsil, inkişaf və tərbiyə (mədəniyyət) triadasından görünür ki, müəllim kimya elmi və metodikasını bilməklə yanaşı, psixologiya və pedaqogikanı da öyrənməli və alimin qeyd etdiyi kimi şagirdlərin təfəkkür və təxəyyülünü qarşılıqlı surətdə inkişaf etdirməlidir [7,8].

Müəllimin ən vacib keyfiyyətlərindən biri də humanizmdir. Kimya müəllimi şagirdlərin şəxsi maraqlarını, onların düşdükləri çətin vəziyyətləri nəzərə almalı, söylədikləri fikirlərə hörmətlə yanaşmalı, tələbkar olmaqla yanaşı, lazım gəldikdə mülayim münasibətlər də yaratmağa çalışmalıdır.

Müəllim hazırlayan təhsil müəssisələrinin əməkdaşları gələcəyin yeni nəsil pedaqoji kadrları olan tələbələrin yuxarıda sadalanan keyfiyyətlərə malik, müasir pedaqoji təfəkkürlü, dövlətin yürütdüyü təhsil siyasəti haqqında tam məlumatlı, yeni təhsil sənədləri ilə işləməyi bacaran, yeni qiymətləndirmə mexanizmlərindən məharətlə istifadə edən tədqiqatçı, yaradıcı mütəxəssislər kimi formalaşmasına səy göstərmə-

lidirlər.

Çalışmaq lazımdır ki, tələbələr Azərbaycanda yaddaş məktəbindən təfəkkür məktəbinə keçilməsinin, intellektual sistemin yaradılmasının mahiyyətini dərindən başa düşsünlər. Digər fənlərlə yanaşı, kimya fənnindən də dərslərin müasir tələblər səviyyəsində, fəal təlimin müvafiq üsul və iş formalarından, imkan daxilində İKT və kimya eksperimentindən istifadə etməklə qurulmasına çalışsınlar. Ümumi pedaqoji prinsiplərə cavab verən ciddi tədqiqatların nəticəsində müəyyənləşdirilmiş elmi-nəzəri əsaslara söykənən, həmçinin bir texnoloji vasitə kimi tədris, təlim şəraitinə uyğun qurulan orijinal xarakterli resurslardan istifadəyə üstünlük versinlər. Dərs prosesində şagirdlərin müstəqil olaraq biliklər qazanması və onların yaradıcı şəkildə tətbiq etmə yollarını öyrənsinlər, eyni zamanda şagirdlərin təfəkkür və təxəyyül vərdişlərinə yiyələnməsi prosesini izləsinlər.

*Rəyçi: dos. İ.Cavadov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat proqramı. Bakı: Çaşıoğlu, 1999.

2. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu). // Kurikulum. 2008, № 1.

3. Azərbaycan Respublikasının Təhsil Qanunu. Bakı, 2009.

4. Ümumi təhsil pilləsinin dövlət standartları (kurikulumları). // Kurikulum. 2010, № 3.

5. “Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiyası və strategiyası”. www.edu.gov.az Qanunvericilik. Konsepsiyalar.

6. Veysova Z. Fəal/interaktiv təlim. Bakı, 2007.

7. Əlizadə Ə. İdrak prosesləri və hislər. Bakı: ADPU, 2006.

8. Əlizadə Ə., Əlizadə H. Pedaqoji psixologiya. Bakı: ADPU, 2010.

**А.Мамедова**

**Образовательная реформа и ведущая его сила**

**Резюме**

В статье дается информация о реформах в системе образования и обязанностей современного учителя химии, по поводу качества и навыков, которые важны для них.

**A.Mammadova**

**Educational reforms and reformers**

**Summary**

In this article it is spoken about educational reforms and the responsibilities of contemporary chemistry teachers, about the qualities and skills which are important to them.

***Kurikulum***

# FƏNN KURİKULUMU: ONUN MAHİYYƏTİ VƏ MƏZMUNU

**Təranə İsmayılova**
***ARTPİ-nin Kurikulum Mərkəzinin böyük elmi işçisi***

***Açar sözlər:*** *fənn kurikulumu, məzmun standartları, təlim nəticələri, motivasiya, qrup tapşırıqları, məzmun xətti.*

***Ключевые слова:*** *предметные курикулумы, содержательные стандарты, результаты обучения, мотивация, групповые работы, содержательная линия.*

***Key words:*** *subject curriculum, content standards, training outcomes, motivation, group works, content line.*

Ümumtəhsil məktəblərində tədris olunan hər bir fənnin öz yeri, öz xüsusiyyətləri vardır. Bu mənada coğrafiyanı öyrənməyin həyati əhəmiyyətə malik olduğu həmişə qeyd olunmuşdur. Ölkəmizi və dünyanı tanımaqda mühüm rol oynayan bu fənnin məzmunu coğrafiya kurikulumunda öz aydın ifadəsini tapmışdır.

Milli Kurikulum sənədinə əlavə və dəyişikliklər edilməklə qəbul edilmiş "Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları)" ümumtəhsil məktəblərində tədris olunan hər bir fənn üçün nəticəyönümlü təhsil proqramları (kurikulumları) kimi hazırlanmışdır. VI –XI siniflər üçün coğrafiya fənn kurikulumu da bu qəbildəndir.

Hər bir fənnin özünəməxsus cəhətləri, məzmunu və vəzifələri vardır. Bilirik ki, coğrafiya fənni hər hansı bir məkanın yaranmasını, yerləşməsini, mövqeyini, kartoqrafik təsvirini, səth quruluşunu, cəhətlərini, məsafələrin ölçülməsini, təbiətini, Yerin təbəqələrini, təbii komplekslərin yaranması mexanizmlərini, coğrafi paylanma qanunauyğunluqlarını, dünya əhalisinin irqi, milli, dini, etnik tərkibini, bu müxtəlifliyin səbəblərini, ölkələrin iqtisadi inkişafını, bu inkişafın yaratdığı ekoloji problemlərin baş vermə səbəblərini, ölkədaxili və beynəlxalq siyasi-iqtisadi münasibətlərin insanların həyat şəraitinə təsirini, dünyada münaqişə zonalarının yaranma səbəblərini və onların həllində beynəlxalq təşkilatların rolunu qiymətləndirməyi öyrədir. Coğrafiya fənni Yer planetinin Günəş sistemində mövqeyini və onun fiziki-coğrafi nəticələrini, coğrafi təbəqədə ərazi dəyişmələrinin əsas qanunauyğunluqlarının və bununla əlaqədar Yer səthi təbiətinin qlobal, müasir, ekoloji sistemlərin yaranması xüsusiyyətləri haqqında təbiətdə baş verən təbii hadisə və proseslərin yaranma səbəbinin inkişaf mexanizmini onların ərazi üzrə paylanma qanunauyğunluqlarını şərh etmək cəmiyyətin sosial–iqtisadi inkişafını təmin etmək üçün təbii ehtiyatlardan səmərəli istifadənin və ətraf mühitin mühafizəsinin mümkün yollarına dair şagirdlərdə bilik və bacarıq formalaşdırır.

Coğrafiya təliminin məqsəd və vəzifələrinə uyğun olaraq, fənn kurikulumunda təhsilin bütün pillələri üzrə 3 məzmun xətti

müəyyən edilmişdir: coğrafi məkan, təbiət və cəmiyyət. Müəyyən olunmuş məzmun xətlərinin köməyi ilə şagirdlərin şüurunda əhatə olunduqları təbiətin vahid, bütöv və bölünməz obrazı yaradılır. Şagird əvvəlcə yaşadığı Yer kürəsini bir planet kimi öyrənir, onun Günəş və öz oxu ətrafında hərəkətinin coğrafi nəticələrini araşdırır, sonra Yer kürəsinin quruluşu, relyefi, coğrafi təbəqəsi, təbiəti, iqtisadiyyatı, əhalisi, sərhədləri haqqında müəyyən biliklər alır və bu bilikləri kontur xəritə, atlas, qlobus və digər məzmunlu xəritələr üzərində tətbiq edir, diaqramlar qurur, statistik göstəricilərdən istifadə edir, cədvəllər çəkir. Məzmun xətləri coğrafiya fənninin zəruri hissəsi və sütunlarıdır. Ümumtəhsil məktəblərində şagirdlərə coğrafiya elminin əsasları deyil, fənnin məzmununun zəruri hissəsi, şagirddə həyatda ona lazım ola biləcək bilik, bacarıq, vərdiş və dəyərlər formalaşdırılmalıdır. Bu məsələ bir prinsip kimi fənn kurikulumları hazırlanarkən əsas götürülmüşdür.

Fənn kurikulumlarında fənnin məzmunu nəticələr şəklində verilmişdir. Nəticələrin əvvəlcədən müəyyənləşdirilməsi və məzmuna gətirilməsi fənn kurikulumlarının ən mühüm xarakterik xüsusiyyətidir. Nəticələr şagirdin bilik, bacarıq, vərdiş və dəyərlərə nail olması üçün bir vasitədir. Şagirdlərin ilin sonunda əldə edəcəyi nəticələr əvvəlcədən müəyyənləşdirilir və məzmuna gətirilir. Məsələn, VI sinfin sonunda gözlənilən ikinci nəticə “məhəldə cəhətlərin təyin edilməsində alət və cihazlardan istifadə edir və ərazinin planını tərtib edir”–dir. Bu nəticə 1.3. əsas standartda “Kartoqrafik təsvirlər üzərində bilik və bacarıqlar nümayiş etdirir”, “1.3.1. Kartoqrafik elementləri fərqləndirir, 1.3.2. Kartoqrafik elementlərə əsasən sadə hesablamalar aparır” alt standartlarında öz əksini tapır. Nümunədən gördüyümüz kimi gözlənilən nəticə alt standartda necə xırdalanır, bu da mözvu və təlim məqsədlərinin müəyyənləşdirilməsində böyük rol oynayır.

Nümunədə göstərilən əsas və alt standartlar “Coğrafi mövqe” məzmun xəttindəndir. Kodların qarşısında göstərilən birinci rəqəm (1) həmin standartın neçənci məzmun xəttinə aid olduğunu göstərir. Əsas standartın kodundakı rəqəmlər isə, həmin əsas standartın o məzmun xəttinin neçənci əsas standartı olduğuna işarədir. 1.3. əsas standartı birinci məzmun xəttinin üçüncü əsas standartıdır. 1.3.1.və 1.3.2. alt standartlarındakı üçüncü rəqəm isə həmin əsas standartın neçənci alt standartı olduğunu bildirir.

Əsas və alt standartlar bir yerdə məzmun standartı adlanır. Bəs onların funksiyaları nədir? Əsas standart müəyyən olunan təlim nəticələrini məzmun xətləri üzrə ümumi şəkildə ifadə edir. Yuxarıda verdiyimiz nümunədən də göründüyü kimi hər bir əsas standart məzmununa görə hər hansı bir məzmun xəttini özündə əks etdirir.

Müəllimin əsas işi isə alt standartlar üzərində qurulur. Alt standartlar dərsdə təlim məqsədlərini müəyyənləşdirmək üçün zəmin yaradır. Hər hansı bir dərs üçün reallaşdırılacaq standart müəyyən olunur və bu ümumi standart mövzuya görə xüsusiləşir. Məsələn, 2.1.3.Yerin hava qatını şərh edir standartı bir neçə mövzunun reallaşdırılmasında iştirak edir. Bu standarta görə atmosfer anlayışı, quruluşu və əhəmiyyəti, temperatur anlayışı, külək, bulud və yağıntı haqqında məlumatlar veriləcək. Əlbəttə ki, göstərilənlər bir dərsin yükü deyil. Əgər bu standart birinci mövzu üçün götürülürsə və bu mövzunun adı da məsələn, “Yerin hava qatı”dırsa, o zaman belə təlim məqsədləri yazmaq olar: 1. Atmosfer anlayışını izah edir. 2. Atmosferin quruluşunu və əhəmiyyətini şərh edir. 3. Atmosferin həyatımızdakı rolunu dəyərləndirir. Külək, bulud və yağıntı haqqında məlumatlarla bağlı mövzular da bu standartın reallaşdırılması zamanı tədris olunacaq və təlim məqsədləri də mövzuya uyğun xü-

susiləşəcək.

Alt standartın xüsusiyyətlərindən biri də təlim strategiyalarının düzgün müəyyənləşdirilməsində rol oynamağıdır. Dərs üçün təlim forması və üsulunun seçilməsi, motivasiyanın qoyulması, iş vərəqlərindəki tapşırıqların hazırlanması alt standartdan asılıdır. Məsələn, əgər standart 2.1.7. Canlı aləmin müxtəlifliyinin səbəblərini izah edirdirsə, mövzu: "Canlı aləmin müxtəlifliyi" olacaq. Forma: kollektiv və qruplar, üsul: müzakirə, Venn diaqramı. Motivasiya: müxtəlif növ canlıların şəkilləri, yönəldici suallar: gördüyünüz canlıları necə qruplaşdırmaq olar?, nəyə görə bu canlıları eyni qrupda cəmləşdirdiniz? və s. Qrupların tapşırıqları: I qrup: Yer kürəsində canlıların müxtəlifliyinə təsir edən mühit amillərini sayın. Onlarda yaşadığı mühitə uyğunlaşmış xüsusiyyətlərə misallar göstərin. II qrup: Buz səhrası ilə isti səhranın canlıları arasındakı oxşar və fərqli cəhətlərini qeyd edin. III qrup: Azərbaycanda yayılmış canlılara misallar göstərin və şəkillərə uyğun qruplaşdırın (İş vərəqlərinə şəkillər yapışdırılır) IV qrup: Yer kürəsində yayılmış canlılara misallar göstərin və şəkillərə uyğun qruplaşdırın (İş vərəqlərinə şəkillər yapışdırılır).

Təlimdə inteqrativliyin təmin olunması da alt standartların funksiyalarına daxildir. Müəllim dərs vaxtı reallaşdırdığı standartın digər fənlərin hansı standartı ilə inteqrasiya etdiyini müəyyənləşdirmə bacarığına malik olmalıdır. Fəndaxili və fənlərarası əlaqə ənənəvi təlimdə sistemsiz şəkildə idi. Ənənəvi təlimdə mövzulararası əlaqə yaradılırdısa, kurikulumda isə standartlararası inteqrasiya müəyyənləşdirilir. Müasir kurikulumlarda ancaq eyni sinifdə tədris olunan fənlərarası inteqrasiya yaradıla bilər. Məsələn, VI sinifdə coğrafiya müəllimi ancaq VI sinifdə tədris olunan fənlərlə inteqrasiya müəyyənləşdirə bilər. Yuxarıda göstərdiyimiz nümunədəki alt standart (2.1.7. Canlı aləmin müxtəlifliyinin səbəblərini izah edir), biologiya fənnin 1.1.4. Canlıların təsnifatının rol və əhəmiyyətini izah edir; 4.1.1.Canlıların ətraf mühitlə və bir-birilə əlaqəsini izah edir standartları ilə inteqrasiya edə bilər.

Alt standartın funksiyalarından biri də təlimin məzmununun davamlı inkişafını təmin etməsidir. Alt standartlar sadədən mürəkkəbə doğru inkişaf edir. Coğrafiya fənnin məzmunu ənənəvi təhsildə siniflər üzrə aşağıdakı kimi paylanmışdır: VI sinifdə "Fiziki coğrafiya", VII sinifdə "Materik və okeanların fiziki coğrafiyası", VIII sinifdə I yarımildə 1 saat "Azərbaycan Respublikasının fiziki coğrafiyası", II yarımildə isə bununla yanaşı "Azərbaycan Respublikasının sosial-iqtisadi coğrafiyası", IX sinifdə "Dünya ölkələrinin iqtisadi və sosial coğrafiyası", X sinifdə "Yerşünaslıq", XI sinifdə isə "Türk dünyası coğrafiyası". Coğrafiya fənnin belə pərakəndə halda paylanması şagirdə bir sistem üzrə inkişaf etməyə imkan yaratmır. Coğrafiya fənn kurikulumunda isə standartlar elə işlənmişdir ki, bütün bu məsələlər VI sinifdən XI sinfə qədər sadədən mürəkkəbə, asandan çətinə doğru öyrəniləcək. Bir nümunəyə baxaq: coğrafiyanın ən mühüm bölmələrindən biri "Atmosfer"-dir. Ənənəvi proqramda atmosfer VI , VII və X siniflərdə öyrənilirdi. Coğrafiya fənn kurikulumunda isə atmosfer VI sinifdən XI sinfə qədər, hər yaş dövrünə uyğun öyrənilir. Coğrafiya fənn kurikulumunun bütün siniflərində 2.1.3. və 2.1.4. standartları "Atmosfer" bölməsinə aiddir. Hər bir sinifdə 2.1.3. standartı atmosfer bölməsinə aid nəzəri bilikləri, 2.1.4. isə bu biliyi bacarığa çevirmək üçün praktik standartdır. Məsələn, VI sinifdə 2.1.3. standartına görə şagird atmosfer anlayışını, onun quruluşunu, əhəmiyyətini, temperatur anlayışını, onun hesablanmasını, küləyin və buludun yaranmasını, yağıntı və onun növlərini öyrənəcək, 2.1.4. standartına görə isə şagird havanın gün ərzində dəyişməsini

müşahidə edəcək, yaşadığı ərazidə havanın sutkalıq temperaturunu hesablayacaq, nəticələrini təqdim edəcək. VII sinifdə 2.1.3. standartına görə şagird havanın temperaturunun və təzyiqinin üfüqi istiqamətdə dəyişməsini, atmosferdə rütubətin səth quruluşundan asılılığını öyrənəcək, 2.1.4. standartına görə isə temperatur və təzyiqin dəyişməsinə aid çalışmalar edəcək, hesablamalar aparacaq. VIII sinifdə isə şagird 2.1.3. standartına görə atmosfer sirkulyasiyasını, iqlimə təsir edən amilləri və iqlim tərəddüdlərini öyrənəcək, 2.1.4. standartında isə atmosfer yağıntılarının və temperaturunun paylanma qrafikini quracaqdır. Bu məsələ XI sinfə qədər mürəkkəbləşərək öyrəniləcək.

Coğrafiya fənn kurikulumu Azərbaycan Respublikasının coğrafiyasının yalnız VIII sinifdə I yarımildə 1, II yarımildə isə 2 saat öyrənilməsi problemini də aradan qaldıracaq. Çünki bütün coğrafi kompetensiyalar VI sinifdən XI sinfə qədər Azərbaycan baxımından öyrənəcək və inkişaf edəcək. Bu da şagirdlərdə Azərbaycanın təbii şəraiti, təbii ehtiyatları, əhalisi və demoqrafik vəziyyəti, dünya ölkələri ilə müqayisədə Azərbaycanın iqtisadi və sosial-coğrafi xüsusiyyətləri haqqında ümumi təsəvvürlər yaradır. Azərbaycanın qloballaşma prosesində iştirakı barədə məlumatlar verir, dünyanın səbəb-nəticə zəminində kompleks şəkildə qavranılması, ətraf mühitin antropogen dəyişilməsinin bəşəriyyətin inkişafına təsiri, ekoloji problemlərə həssas münasibət, vətəndaşlıq mövqeyi formalaşdırır. Onların idrak qabiliyyətini, iqtisadi təfəkkürünü və ekoloji mədəniyyətini inkişaf etdirir. Coğrafiya fənn kurikulumu müasir Azərbaycan şagirdinə tolerantlıq, ekoloji mədəniyyət, iqtisadi göstəricilərdən istifadə edə bilmək, nəticə çıxarma, layihələr irəli sürmə bacarıqları verəcəkdir.

Coğrafiya fənn kurikulumunda təbiət-cəmiyyət münasibətləri baxımından şagirdlərdə məntiqi təfəkkürün, sadədən mürəkkəbə doğru inkişafın, fənnin tədrisində yeni texnologiya və kommunikasiya vasitələrinin tətbiq olunması nəzərdə tutulur. Şagirdlərdə tədqiqatçılıq bacarığı, fikirlərini ümumiləşdirərək təqdimatlar etmək, proqnoz və referatlar hazırlamaq, təbiətdə və cəmiyyətdə baş verən hadisə və prosesləri təhlil edib qiymətləndirmək bacarığı formalaşdırır.

*Rəyçi: dos. Ə.Gərayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Ümumtəhsil pilləsinin dövlət standartları (kurikulumları). // Azərbaycan məktəbi, 2011, № 6.

2. Veysova Z. Fəal/interaktiv təlim. Bakı, 2007.

3. Cəbrayılov İ. Şəxsiyyətyönümlü təhsil və vətəndaş cəmiyyəti. Monoqrafiya. Bakı: Mütərcim, 2011.

**Т.Исмайлова**

**Предметный курикулум: сущность и содержание**

**Резюме**

В статье говорится о различных свойствах куррикулума и традиционной программы, показано его сущность и содержание. А также даны функции и динамика развития содержательных стандартов.

**T.Ismayilova**

**The essence, content and different features of geograhy subject curriculum**

**Summary**

The article deals with the differences of content principles between traditional and modern geography subject curriculum.

The content standards and their dynamic development have also been presented in the article.

# MƏZMUN XƏTTİ FƏNLƏR ÜZRƏ MÜƏYYƏNLƏŞDİRİLİR

**Firuzə Kərimova**
***ARTPİ-nin böyük elmi işçisi***

***Açar sözlər:*** *məzmun xətti, fənn kurikulumu, məzmun standartı, təlim nəticəsi.*
***Ключевые слова:*** *содержательные линии, предметные курикулумы, содержательные стандарты, результаты обучения.*
***Key words:*** *content line, subject curriculum, content standards, training results.*

Əsası ümummilli liderimiz Heydər Əliyev tərəfindən qoyulan təhsil islahatı ölkəmizin təhsil siyasətinin əsas istiqamətlərini müəyyən etməklə bu sistemin inkişafının, keyfiyyətinin və rəqabət qabiliyyətinin yüksəldilməsini təmin edir. Mütərəqqi dünya təcrübəsini özündə əksetdirən "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)" demokratizm, humanizm kimi prinsiplərdən çıxış etməklə, şagirdlərin maraq və ehtiyaclarına cavab verən, mütəxəssislərin elmi yanaşmalarına söykənən, dövlətin təhsil siyasətinin tələblərinə uyğun bir sənəddir.

Hazırda respublikamızda müasir dünyanın şəxsiyyətyönümlü təhsil sferasına daxil olmaq üçün tələbatlara uyğun interaktiv məzmun, ən yeni təlim strategiyaları, qiymətləndirmə mexanizmləri, demokratik idarəetmə sistemi işlənib hazırlanır, ənənəvi və mütərəqqi dünya texnologiyalarından istifadə edilir.

Təhsil sistemində aparılan islahatlar müasir dərsin məzmununun təkmilləşdirilməsini, yeni təlim texnologiyalarının tətbiqini tələb edir. İnteraktiv təlim metodlarından istifadə təhsilin keyfiyyətinə öz müsbət təsirini göstərir. Kurikulum islahatı təlim prosesində şagirdlərə daha çox müstəqillik verilməsinə, öz fikirlərini sərbəst şəkildə ifadə etməyə zəmin yaradır. Digər fənlər kimi riyaziyyat fənnin də tədrisi artıq bir neçə ildir ki, kurikulumun tələblərinə uyğun şəkildə aparılır.

Məzmun xətti – fənn üzrə ümumi təlim nəticələrinin reallaşdırılmasını təmin etmək üçün müəyyən edilən məzmunun zəruri hissəsidir.

Riyaziyyat fənn kurikulumunda fənnin məzmunu bacarıqlar şəklində ifadə edilən təlim nəticələrindən (standartlardan) ibarətdir və bu nəticələr məzmun xətləri üzrə qruplaşdırılmışdır.

Məzmun xətləri şagirdlərin öyrənəcəyi məzmunu daha aydın təsvir etmək üçün müəyyən olunur və onu sistemləşdirmək məqsədi daşıyır. Onlar siniflər üzrə əsas və alt standartlar şəklində müəyyənləşdirilir.

Riyaziyyat fənni üzrə 5 məzmun xətti müəyyənləşdirilmişdir: 1. Ədədlər və əməllər. 2. Cəbr və funksiyalar. 3. Həndəsə. 4. Ölçmə. 5. Statistika və ehtimal.

Riyaziyyat fənni üzrə müəyyənləşdirilmiş 5 məzmun xətti bütün siniflər üzrə (I-XI siniflər) dəyişməz qalır. Kurikulum sənədində hər bir məzmun xətti əsaslandırılmış və onlara uyğun təlim nəticələri verilmişdir.

Ədədlər və əməllər. Saymaq, hesablamaq, ölçmək və kəmiyyətlərin qiymətini müəyyən etmək üçün istifadə olunan ədədlər riyaziyyat fənninin məzmununa daxil olan

əsas bölmələrdən biridir. Ədədlər və əməllər üzrə məzmun vasitəsilə şagirdlər tərəfindən ədəd anlayışının və onun genişləndirilməsinin dərk edilməsi, ədədlər üzərində əməllərin (toplama, çıxma, vurma, bölmə, kökalma, qüvvətəyüksəltmə və s.) yerinə yetirilməsi təmin olunur, onlarda dəqiq və təqribi hesablama vərdişləri formalaşdırılır. Yuxarı siniflərdə isə bu məzmun xətti vasitəsilə sadə və mürəkkəb ədədlər, rasional, irrasional ədədlər və irrasional ədədlərin rasional ədədlərlə təqribi ifadə olunması, həqiqi və kompleks ədədlərin daxil edilməsi məsələlərinin öyrənilməsi həyata keçirilir.

Cəbr və funksiyalar. Cəbrin elementlərinin daxil edilməsi şagirdlərdə ədədlər və əməllərin bir sıra xassələrinin ümumiləşdirilməsini, hərfi ifadə, bərabərlik, tənlik və s. mühüm riyazi anlayışların formalaşmasını, cəbri anlayışlardan istifadə edərək ətraf aləmdəki hadisələrin riyazi modellərinin qurulması kimi müvafiq vərdişlərin yaranmasını təmin edir. Cəbr vasitəsilə şagirdlər qarşıya çıxan problemləri təbii dildən cəbrin simvolik dilinə və əksinə çevirməklə həll edirlər.

Riyaziyyatın öyrənilməsində əsas sahələrdən biri olan funksiyalar bölməsi şagirdlər tərəfindən qanunauyğunluqların, asılılıqların, kəmiyyət münasibətlərinin mənimsənilməsinə xidmət edir. Məzmun xəttinə daxil edilmiş bu bölmənin yuxarı siniflərdə tətbiq sahələri genişlənir və müstəsna əhəmiyyət kəsb edir.

Cəbr və funksiyalar məzmun xətti vasitəsilə dəyişən kəmiyyətləri olan problemlərin təhlili, modelləşdirilməsi, həlli və təqdim olunması həyata keçirilir.

Həndəsə. Həndəsə məzmun xətti vasitəsilə müstəvi və fəza fiqurlarının xassələrinin öyrənilməsi, fəza təsəvvürlərinin formalaşdırılması, həndəsi fiqurların xassələrindən və həndəsi metodlardan istifadə etməklə riyazi məsələlərin təhlili və həllinin yerinə yetirilməsi təmin olunur. Aşağı siniflərdə həndəsə məzmun xətti vasitəsilə əsas həndəsi fiqurların tanınması (məsələn, üçbucaqlılar, dairələr, kvadratlar və kublar) həyata keçirilir. Sonrakı siniflərdə həndəsi fiqurların xassələrinin öyrənilməsi genişləndirilir və dərinləşdirilir, müxtəlif həndəsi münasibətlər və həndəsi çevrilmələr daxil edilir, fəza həndəsəsi daha ətraflı öyrədilir.

Ölçmə. Müvafiq ölçü vahidləri və alətləri vasitəsilə kəmiyyətlərin lazımi dəqiqliklə ölçülməsi və qiymətləndirilməsinin öyrədilməsi ölçmələr məzmun xəttinin daxil edilməsi vasitəsilə həyata keçirilir. Bu məzmun xətti aşağı siniflərdə şagirdlərdə sadə ölçü alətlərindən (məsələn, xətkeşdən) istifadə etmək vərdişlərinin yaranmasına xidmət edir. Sonrakı siniflərdə isə bucaqların, sahələrin, həcmlərin ölçülməsi, müvafiq ölçü vahidlərindən istifadə edilməsi, ölçü vahidləri arasındakı əlaqələrin başa düşülməsi, bunların məsələlərin həlli üçün tətbiqi təmin olunur.

Statistika və ehtimal. Statistika və ehtimal məzmun xətti müxtəlif məlumatların statistik göstəricilərinin təyin edilməsi və hesablanması, seçim zamanı təsadüflərin nəzərə alınması, toplanmış məlumatların təsnifatı, təhlili və təqdimatı kimi məsələlərin şagirdlər tərəfindən öyrənilməsi məqsədilə daxil edilmişdir. Bu məzmun xətti vasitəsilə ibtidai siniflərdə məlumatları toplamaq və onları qrafik şəklində təsvir etmək kimi məsələlərin öyrənilməsi təmin olunur, yuxarı siniflərdə statistika və onun gündəlik həyata təsirinin daha dərindən öyrənilməsi, toplanmış məlumatlar əsasında mühakiməyürütmə və qərarvermə təcrübəsinin formalaşdırılması üçün zəmin yaradılır. Ümumi orta təhsil səviyyəsində hadisə anlayışı, onun müxtəlif növləri öyrədilir, eyniimkanlı hadisələr, ehtimalın klassik tərifi daxil edilir, sadə hadisələrin baş vermə ehtimalının tapılması qaydası verilir. Tam orta təhsil səviy-

yəsində birləşmələr nəzəriyyəsi hadisələrin ehtimallarının hesablanmasına tətbiq edilir.

İbtidai təhsil səviyyəsində məzmun xətləri üzrə təlim nəticələri.

Ədədlər və əməllər

Şagird:

• milyon dairəsində əşyaları bir-bir və ya qruplarla saymağı, onluq say sistemində mərtəbə vahidlərinin qiymətini müəyyən etməyi, ədədləri oxumağı və yazmağı, müxtəlif ekvivalent formalarda təsvir etməyi, mərtəbə toplananlarının cəmi şəklində göstərməyi, ədədin hissəsini tapmağı bacarır;

• mənfi olmayan tam ədədlər üzərində hesab əməllərini aparmağı bacarır, bu əməllər arasındakı əlaqələri başa düşür və onlardan məsələlərin həllində istifadə edir;

• kəsrlər haqqında ilkin məlumatları əldə edir;

• məsələ həllində və hesablamalarda gözəyarı qiymətləndirmə aparır.

Cəbr və funksiyalar

Şagird:

• ədədlər arasında əlaqələrin ifadəsində, təsvirində, sadələşdirilməsində, məsələlərin həllində müvafiq simvollar, əməllər və xassələrdən istifadə edir;

• sadə tənlikləri həll edir;

• müxtəlif kəmiyyətlər (qiymət, miqdar, dəyər, sürət, zaman, gedilən yol, əmək məhsuldarlığı, işin müddəti, işin həcmi) arasında funksional asılılıqları ifadə edir və bu biliklərdən məsələ həllində istifadə edir.

Həndəsə

Şagird:

• əşyaların fəzada qarşılıqlı vəziyyətini müəyyən edir, sadə fiqurları (nöqtə, parça, düz xətt, bucaq, üçbucaq, düzbucaqlı, kvadrat, dairə, kub) tanıyır, təsvir edir, onların bəzi xüsusiyyətlərini bilir, bu biliklər əsasında müqayisələr aparır və onlardan məsələ həllində istifadə edir.

Ölçmə

Şagird:

• seçilmiş şərti ölçü vahidinin verilmiş kəmiyyətdə neçə dəfə yerləşdiyini müəyyənləşdirməklə ölçmə əməliyyatının mənasını başa düşür, vahidlər arasında əlaqə yarada bilir;

• kəmiyyətlərin ölçülməsində və müqayisəsində uyğun ölçü vahidləri və alətlərindən düzgün istifadə edir və bu biliklər əsasında riyazi və praktik çalışmaları yerinə yetirir;

• perimetri və sahə anlayışlarını başa düşür, bu biliklərdən praktik işlərin və çalışmaların yerinə yetirilməsində istifadə edir.

Statistika və ehtimal

Şagird:

• məlumatları toplayır, sistemləşdirir və alınan nəticələri şərh edir;

• ehtimalla bağlı bəzi ifadələri (mümkündür, qeyri-mümkündür, baş verə bilər, baş verə bilməz) bilir və onlardan sadə proqnozların verilməsində istifadə edir.

Ümumi orta təhsil səviyyəsində məzmun xətləri üzrə təlim nəticələri.

Ədədlər və əməllər

Şagird:

• ədəd anlayışını, ədədlərin müxtəlif üsullarla ifadə olunmasını, ədədlər və ədəd sistemləri arasında əlaqələri başa düşür;

• əməllərin mənalarını, bir-biri ilə əlaqələrini, xassə və qanunlarını, yerinə yetirmə qaydalarını bilir və tətbiq edir.

• dəqiq hesablamalar və təqribi qiymətləndirmələr aparır.

Cəbr və funksiyalar

Şagird:

• riyazi modellərdən istifadə etməklə müxtəlif cür problemlərin həlli ilə bağlı situasiyaları cəbri üsulla təqdim və təhlil edir;

• cəbri simvolları tətbiq etməklə cəbri qaydaları dəqiq yerinə yetirir;

• cəbri qanunauyğunluqları, asılılıqları və funksiyaları tanıyır, istifadə edir və təqdim edir;

• kəmiyyət münasibətlərini başa düşür və müxtəlif kontekstlərdə dəyişənlərin təhlilini aparır

Həndəsə

Şagird:

• müşahidələrdən və fəza təsəvvürlərindən istifadə etməklə həndəsi fiqurların əlamətlərini və xassələrini təhlil edir;

• həndəsi münasibətləri tanıyır və əsaslandırır;

• həndəsi çevirmələr və simmetriyanın elementlərini tətbiq etməklə problemlərin həlli ilə bağlı situasiyaları təhlil edir;

• problemlərin həlli ilə bağlı situasiyaları təhlil etmək üçün xüsusi mühakimə üsullarından və həndəsi modelləşdirmədən istifadə edir;

Ölçmə

Şagird:

• ölçməyə məna vermək üçün vahidlərdən ölçü sistemləri və alətlərdən istifadə edir;

• müvafiq üsullardan və düsturlardan istifadə etməklə nələrin və necə ölçülə bilən olmasını müəyyənləşdirir;

• ölçmələrdə xətaların mümkünlüyünü başa düşürlər və onların qiymətini müəyyənləşdirir, təqribi ölçmələr aparır.

Statistika və ehtimal

Şagird:

• məlumatları toplayır, emal edir və təhlil üçün müvafiq statistik metodları seçib tətbiq edir;

• məlumatların təhlili əsasında ehtimallar edir, mühakimələr yürüdür və qərar çıxarır;

• ehtimal nəzəriyyəsinin sadə ehtimal anlayışlarını başa düşür və ondan istifadə edir.

Tam orta təhsil səviyyəsində məzmun xətləri üzrə təlim nəticələri.

Ədədlər və əməllər

Şagird:

• kompleks ədədi müxtəlif formalarda (cəbri və triqonometrik) təqdim edir, onlar üzərində hesab əməllərini yerinə yetirir;

• triqonometrik, üstlü, loqarifmik ifadələri sadələşdirir və qiymətini tapır.

• n dərəcəli tənlikləri həll edir.

• ardıcıllığın və funksiyanın xassələrini tətbiq edir, limitlərini hesablayır.

Cəbr və funksiya

Şagird:

• triqonometrik, qüvvət, üstlü və loqarifmik funksiyaların xassələrini tətbiq edir və qrafiklərini qurur;

• triqonometrik, üstlü və loqarifmik tənlik və bərabərsizlikləri, onların sistemini həll edir;

• bəzi funksiyaların törəməsini tapır, törəmənin köməyi ilə funksiyaları araşdırır;

• ibtidai funksiya, qeyri-müəyyən inteqral anlayışlarını başa düşür, bəzi funksiyaların inteqralını hesablayır;

• müəyyən inteqralın köməyi ilə əyrixətli trapesiyanın sahəsini və fırlanmadan alınan cisimlərin həcmini hesablayır.

Həndəsə

Şagird:

• fəzada düz xətlərin və müstəvilərin qarşılıqlı vəziyyətinə aid məsələlər həll edir;

• çoxüzlülərin və fırlanma cisimlərinin xassələrini müxtəlif məsələlərin həllinə tətbiq edir;

• fəza cisimlərinin simmetriyasına aid müxtəlif məsələlər həll edir;

• vektorlar üzərində əməlləri yerinə yetirir, xassələrini müxtəlif məsələlərin həllinə tətbiq edir;

• fəzada Dekard koordinat sistemində müxtəlif məsələlər həll edir.

Ölçmə

Şagird:

• fəza fiqurlarının səthi və həcmi ilə bağlı müxtəlif ölçmələr və təqribi hesablamalar aparır;

• ölçmə və hesablamalarda alınan nəticələri müqayisə edir, xətanı müəyyən

edir.

Statistika və ehtimal

Şagird:

• ölçmənin səhvinin sabit komponentini dəyişən komponentindən fərqləndirir, dispersiyasını və orta kvadratik meyilini hesablayır;

• ehtimalın hesablanmasında Bernulli sxemini və normal paylama qanunu tətbiq edir.

Yeni fənn kurikulumları nəticəyönümlüdür. Ümumi təhsilin hər mərhələsi (səviyyəsi) üçün təlim nəticələri öncədən müəyyənləşdirilir. Onların əldə edilməsi isə məzmun standartları vasitəsi ilə həyata keçirilir. Ümumi orta təhsil səviyyəsi üçün təlim nəticələrini göstərək.

Ümumi orta təhsil səviyyəsi (V-IX siniflər) üzrə şagird:

• ədədlər üzərində şifahi, yazılı formada dəqiq və ya təqribi hesablamalar aparır;

• müxtəlif həyati məsələlərin həllində riyazi bilikləri tətbiq edir;

• simvollarla ifadə olunmuş cəbri dildən istifadə edir;

• rasional ifadələr üzərində eynilik çevrilmələri aparır, xətti tənlikləri, kvadratik tənlikləri, xətti tənliklər sistemi və bərabərsizliklər sistemini həll edir;

• funksiya anlayışı və qrafiklərdən real asılılıqların öyrənilməsində və şərhində istifadə edir;

• mühakimələrini məntiqi əsaslandırır, nitqində dəqiq, aydın və yığcam ifadə edir.

• müstəvi fiqurların və sadə fəza cisimlərinin xassələrini praktik həndəsi məsələlərin həllində tətbiq edir, sadə həndəsi qurmaları yerinə yetirir.

• ölçmə və hesablama ləvazimatlarından istifadə edir.

• fəaliyyətlərini planlaşdırır, onların əsasında alqoritmlər qurur, nəticələri yoxlayır və qiymətləndirir.

• statistik məlumatları toplayır, araşdırır, sistemləşdirir və nəticəsini təqdim edir;

• statistika və ehtimal əsasında hadisənin başvermə mümkünlüyünü proqnozlaşdırır.

Kurikulumda hər sinfin sonunda şagirdlərin əldə edəcəyi bilik və bacarıqların konkret olaraq həcmi göstərilir. Nümunə olaraq V sinfin sonunda şagirdin əldə edəcəyi nəticələri göstərək.

Şagird:

• Natural ədədləri oxuyur, yazır, müqayisə edir, düzür və ədəd oxunda natural ədədə uyğun nöqtəni göstərir, natural ədədlər üzərində hesab əməllərini yerinə yetirir, natural ədədləri tələb olunan mərtəbəyə qədər yuvarlaqlaşdırır, iki sonlu çoxluğun birləşməsini və kəsişməsini tapır.

• Onluq kəsrlər üzərində hesab əməllərini yerinə yetirir, onluq kəsrləri tələb olunan mərtəbəyə qədər yuvarlaqlaşdırır, məxrəcləri eyni olan kəsrləri və qarışıq ədədləri toplayır və çıxır, ədədin hissəsini və faizini tapır.

• Dəyişənlərin və natural ədədlərin köməyi ilə sadə cəbri ifadələr və tənliklər qurur, dəyişənlərin və natural ədədlərin köməyi ilə şifahi söylənilən təklifi bərabərsizlik şəklində yazır, natural ədədlər çoxluğunda tənlikləri həll edir, sadə bərabərsizliklərin natural həllərini seçmə üsulu ilə tapır.

• Uzunluğu məlum olan parçanı, dərəcə ölçüsü verilən bucağı, iki tərəfi və onlar arasında qalan bucağa görə üçbucağı, tərəflərinə görə düzbucaqlını qurur, üçbucağın və dördbucaqlının perimetrini, düzbucaqlının və kvadratın sahəsini, düzbucaqlı paralelepipedin və kubun səthinin sahəsini və həcmini hesablayır.

• Simmetrik müstəvi fiqurları və sadə konqruyent fiqurları tanıyır.

• Uzunluğun, sahənin, həcmin və bucağın ölçü vahidlərini bilir və ölçmə alətlərindən istifadə edir.

• Tələb olunan məlumatları müxtəlif

mənbələrdən toplayır, sistemləşdirir, cədvəl və ya diaqramlar şəklində təqdim edir, məlumatlara əsasən, onların modasını, medianını və ədədi ortasını tapır.

• Yəqin hadisə, mümkün olmayan hadisə və təsadüfi hadisəni, eyniimkanlı və müxtəlifimkanlı hadisələri fərqləndirir, eyniimkanlı sadə hadisələrin ehtimalını hesablayır.

Məzmun standartları əsas və alt olmaqla iki qrupa bölünür. Hər bir standartın tərkibi bilik və fəaliyyət (bacarıq) komponentindən ibarətdir.

V sinfin məzmun standartından nümunə göstərək:

1. Ədədlər və əməllər

1.2. Riyazi əməlləri, riyazi prosedurları tətbiq edir və onlar arasındakı əlaqəni müəyyənləşdirir.

1.2.1 Natural ədədlər üzərində hesab əməllərini yerinə yetirir.

1.2.2 Natural ədədləri, onluq kəsrləri mərtəbə vahidlərinə vurur və bölür.

1.2.3 Ədədi ifadənin qiymətini tapır (mötərizə daxilində ifadələr də daxil olmaqla).

1.2.4 Məxrəcləri eyni olan kəsrləri və qarışıq ədədləri toplayır, çıxır, onluq kəsrlər üzərində hesab əməllərini yerinə yetirir.

1.2.5 Ədədin hissəsini və faizini tapır.

Nümunədəki hər bir alt standartı biliyə və fəaliyyətə görə də ayırmaq olar.

Alt standartın

✓ Bilik komponenti - mövzunu,

✓ Fəaliyyət komponenti isə təlimin strategiyalarını müəyyən etməyə kömək edir.

Beləliklə, məlum olur ki, ənənəvi təlimə görə riyaziyyat fənninin məzmunu dedikdə əsasən mövzular, onlara ayrılan saat miqdarı başa düşülürdü. Riyaziyyat fənn kurikulumunun məzmunu dedikdə isə təhsil standartları, təhsil səviyyələri üzrə təlim nəticələri, məzmun xətləri, məzmun xətləri üzrə təlim nəticələri, fəaliyyət xətləri və fəaliyyət xətləri üzrə təlim nəticələri ehtiva edilir.

*Rəyçi: dos. Ə.Gərayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (Kurikulumları). Kurikulum, 2010, № 3.

2. Ümumi təhsilin fənn standartları (I-XI siniflər). Bakı: Mütərcim, 2012.

**Ф.Каримова**

**Содержательные линии определяются по предметам**

**Резюме**

В статье предлагается новое содержание предметного курикулума по математике, обоснованы содержательные линии и одновременно показана динамика развития уровней образования. Отмечается, что содержтельные линии служат систематизации знаний учащиеся.

**F.Karimova**

**New content of mathematic subject curriculum**

**Summary**

In the article the content of mathematic subject curriculum is given. At the same time content line is determined and development dynamics for education levels is shown. It is noted that content lines serve to systematize students’ learning.

# FORMATİV QİYMƏTLƏNDİRMƏ SAHƏSİNDƏ MÖVCUD OLAN BƏZİ PROBLEMLƏR VƏ ONLARIN ARADAN QALDIRILMASI YOLLARI

**Rəfiqə Hüseynova**
***Samux rayonu, Qarayeri qəsəbəsi,***
***1 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *qiymətləndirmə, təlim prosesi, reallaşdırma, nailiyyət, dəyər.*
***Ключевые слова:*** *оценивание, процесс обучения, реализация, достижения, ценность.*
***Key words:*** *assessment, training process, realization, achievement, values.*

Qiymətləndirmə müəllimin öyrətmə, şagirdin öyrənmə və təhsilin idarəolunması sahəsində mühüm əhəmiyyət kəsb edir. Şagird biliyinin qiymətləndirilməsi onun bilik və bacarıqlara yiyələnməsi, onlardan istifadə etməsi, nəticə çıxarması haqqında məlumatların toplanması kimi qəbul edilir. Müasir qiymətləndirmənin təlim prosesinin tərkib hissəsini təşkil etməsi və onun haqqında məlumat mənbəyi olması, təlimin səmərəliliyini müəyyən etməsi, dəqiq müəyyənləşdirilmiş standartlara və meyarlara əsaslanması, eləcə də məsələlərin mərkəzində şagirdin dayanması onun fəlsəfi əsasını təşkil edir. Müasir qiymətləndirmənin standartlar əsasında qurulması onun daha obyektiv və real köklərə dayandığını göstərir. Belə ki, müəllim və şagirdlər onların qarşısına qoyulan tələbləri öncədən daha aydın görür və yollarını müəyyənləşdirirlər.

Bu gün ölkəmizdə məktəbdaxili qiymətləndirmədə - diaqnostik, formativ, summativ qiymətləndirmə növlərindən istifadə olunması məqsədəuyğun hesab edilmişdir. Həmçinin qiymətləndirmə prosesi məqsəddən asılı olaraq formal və qeyri-formal şəkildə keçirilir.

Formal qiymətləndirmə şagirdlərin təlim nəticələrinə hansı səviyyədə yiyələndiyini müəyyən etmək üçün məlumatların test (yazı işi, təqdimat və s.) əsasında toplanmasıdır. Testlər vasitəsilə şagirdlərin bilik və bacarıqları qiymətləndirilir, nəticələr sinif jurnalında yazılır. Formal qiymətləndirmə vasitəsilə ümumi nailiyyət səviyyəsi yoxlanılır.

Qeyri-formal qiymətləndirmə fəaliyyətyönümlü olmaqla meyarlar əsasında aparılır və nəticələri rəsmi sənədlərdə (sinif jurnalında) qeyd olunmur. Müəllim və şagirdləri təlim zamanı məlumatlandırmağa xidmət edən qeyri-formal qiymətləndirmə müxtəlif üsullarla həyata keçirilir: məsələn, şagirdlərin fəaliyyətinin müəllim tərəfindən müşahidə edilməsi, müəyyən olunmuş meyarlar əsasında müzakirələrin aparılması, şagirdin özünüqiymətləndirməsi, cütlərin birbirini qiymətləndirməsi, şagird portfoliosunun yaradılması və s.

Formativ qiymətləndirmə qeyri-formal qiymətləndirmə olmaqla, şagirdin qəbul edilmiş standartların reallaşmasına yönəlmiş irəliləmələrini izləmək, bu zaman qarşıya çıxan problemləri aradan qaldırmaq və şagirdləri istiqamətləndirmək məqsədi ilə aparılır. Bu izləmələr şagirdin təlim nəticələrinə nail olması və nəticədə summativ qiymətləndirmədə nailiyyət qazanmasına

kömək məqsədi ilə aparılır.

Məhz formativ qiymətləndirmə sayəsində şagird gündəlik təlim fəaliyyəti ərzində rəqəmli qiymət almaq üçün deyil, yaxşı nəticə göstərmək üçün çalışır. Qeyd edək ki, yeni məktəbdaxili qiymətləndirmədə formativ qiymətləndirmənin xüsusi yeri vardır. Bu, formativ qiymətləndirmənin adında da aydın əks olunub. "Formativ" sözü (formative) formalaşdıran, formalaşdırıcı deməkdir. Formativ qiymətləndirmə təlim nəticələrinin mənimsənilməsi ilə bağlı mütəmadi məlumat toplamaq məqsədi ilə aparılır. Fənni tədris edən müəllim formativ qiymətləndirməni məzmun standartlarından irəli gələn təlim məqsədləri əsasında hazırladığı meyarlar üzrə dərs ili ərzində müntəzəm olaraq həyata keçirir.

Bu baxımdan müəllimin apardığı gündəlik qiymətləndirmələrin nəticəsinin sinif jurnalına yazılmaması şagirdin xeyrinə istiqamətlənən humanist bir addımdır. Belə ki, müəllim təlim məqsədlərinə uyğun olaraq şagirdlərinin sinifdəki fəaliyyətini müşahidə edir, fənlərin xüsusiyyətlərini nəzərə almaqla seçilmiş qiymətləndirmə üsullarından istifadə edir və onların irəliləməsini nəzarətdə saxlayır. Şagird haqqında hər hansı qərar qəbul edilərkən onun gündəlik fəaliyyətinin nəticələri nəzərə alınır. Gündəlik qiymətləndirmələrin nəticələri müəllimin şəxsi qeydlərində öz əksini tapır və şagird gündəliyi vasitəsilə bu məlumatlar daimi valideynlərə çatdırılır.

Məktəbdaxili qiymətləndirmənin digər növü olan summativ qiymətləndirmə bəhs və bölmələrin, yarımilin və ilin sonunda aparılır və onun nəticəsi sinif jurnalında yazılır.

İbtidai sinif şagirdlərinin nailiyyətlərinin inkişafına xidmət edən qiymətləndirmə müəllimdən yaradıcılıq tələb edən bir prosesdir. İbtidai sinif şagirdlərinin uğurları bu prosesi sinifdə idarə və icra edən müəllim üçün həvəslə gözlədiyi mənəvi mükafatdır. Qiymətləndirmənin daha çox şagirdin öyrənməsinə xidmət etməsi onun nailiyyətlərinin uğurlu olmasının birbaşa təminatçısıdır [1].

Eyni zamanda unutmaq olmaz ki, sinfin idarəolunmasında müəllimə göstəriş vermək olmaz. Müəllimin fəaliyyəti onun təcrübəsindən, vərdişlərindən və peşəkarlığından asılıdır. Müəllim nəyi qiymətləndirməyi, necə qiymətləndirməyi və qiymətləndirmə vasitəsilə əldə olunmuş məlumata necə yanaşmağı fərdi olaraq qərara alır [2].

Formativ qiymətləndirmədə müşahidə üsulu və burada istifadə olunan vasitələr diaqnostik qiymətləndirmədə olduğu kimi tərtib oluna bilər. Məsələn, mətn qurmaqla bağlı dərsin müşahidəsini aşağıdakı meyarlar əsasında aparıram.

| Şagirdlərin soyadı və adı | Müşahidə etdiklərinə dair mühakimə xarakterli fikirlər söyləyir | Müşahidə etdikləri haqqında mətn qurur | Mətndə sadə bədii ifadələrdən istifadə edir | Danışarkən jest və mimikalardan istifadə edir |
|---|---|---|---|---|
| | | | | |

* 3

Şifahi sual-cavab üsulundan istifadə edərkən qiymətləndirmə vasitəsi kimi bacarıqlar üzrə qeydiyyat vərəqindən istifadə edirəm. Qeydiyyat vərəqini fənnin xüsusiyyətinə uyğun tərtib edirəm.

Yazı üsulundan istifadə edərkən hər hansı mövzuda imla, ifadə, inşa yazdırır və şagirdlərin bacarıqlarını meyarlar tərtib etməklə yoxlayıram. Şagirdin yazısını yoxladıqdan sonra onun nəticələri haqqında valideynləri də məlumatlandırıram.

Müxtəlif mətnlərin oxusunu təşkil edərkən oxu zamanı yoxlamaq istədiyi bacarıqların şagirdlər tərəfindən necə yerinə yetirilməsinə diqqət yetirirəm.

Şagird oxuyan zaman müdaxilə etmirəm, şagirdin etdiyi səhvləri qeyd edirəm. Sözlərin və ifadələrin düzgün tələffüz edilib-edilməməsini qeydiyyat vərəqində yazır və şagirdin portfoliosuna daxil edirəm. Sonrakı fəaliyyətimi hər bir şagirdin portfoliosunda etdiyi qeydləri əsas götürməklə qururam. Qeydiyyat vərəqindəki qeydləri valideynə bildirmək üçün şagirdin məktəbli kitabçasına da yazıram.

Tədqiqat xarakterli tapşırıqları şagirdlər fərdi və ya qrup halında iş vərəqindəki suallara uyğun həll edir və araşdırmanı layihə şəklində təqdim edirlər. Məsələn, "Azərbaycan dili" fənnindən aşağıdakı suallardan araşdırma aparmaq üçün istifadə edirəm:

• Çoxmənalı sözləri omonimlərdən necə fərqləndirə bilərsiniz?

• Nitqi canlı və obrazlı etmək üçün nə etmək lazımdır?

• Köməkçi nitq hissələrinin əsas nitq hissələrindən fərqi nədir?

Bu suallar əsasında hazırlanan layihə şagirdin qazandıqları bacarıqları yoxlamağa imkan verir.

Sorğu və ya müsahibə şagirdə müstəqil ev tapşırığı kimi verilir. Bu zaman müsahibənin kiminlə aparılacağını və hansı suallara cavab axtarılacağını sinifdə şagirdlərlə birgə müəyyən edirəm. Şagird həmin suallar ətrafında topladığı məlumatı təhlil edərək sinif qarşısında təqdimat edir. Bu yolla şagirdin məlumat toplamaq, nəticə çıxarmaq, ümumiləşdirmək və eşitdiklərini şərh etmək bacarıqları yoxlanılır.

Bu qiymətləndirmənin nəticəsini şagirdin vəziyyətinə uyğun olaraq qısa şəkildə məktəbli kitabçasına yazıram. Məsələn, (standart:1.2.1.) Müşahidə etdikləri, eşitdikləri, oxuduqları hadisələr haqqında kiçik təqdimatlar edir. (IV sinif) "Eşitdiyi hadisə haqqında kiçik təqdimat edir", "Eşitdiyini ümumiləşdirib təqdim etməyə cəhd edir", "Eşitdiyini ümumiləşdirib təqdim edə bilmir" və s. (5, 27).

Bildiyimiz kimi, özünüqiymətləndirmə üsulundan istifadə geniş yayılmışdır. Özünüqiymətləndirmə vərəqində göstərilən meyarlar üzrə şagird özünə qiymət verir və bunu "+", "-" və ya "bəli", "xeyir" ilə işarə edir. Özünüqiymətləndirmə vərəqlərini də şagird portfoliosuna daxil edirəm. Şagirdin valideyninin həmin vərəqlə tanış olması məqsədəuyğundur.

Rollu oyunları müşahidə etmək üçün meyarlar hazırlanarkən bir yox, bir neçə standartın məzmunundan istifadə edilir. Rollu oyunlar üçün şagirdlərə hər hansı bir situasiya təqdim olunur. Rollu oyunlar şagirlərə ifadəli danışmaq, nitqində obrazlı ifadələrdən istifadə etmək və s. bacarıqlar aşılayır.

Formativ qiymətləndirmənin nəticələri məktəbli kitabçasında öz əksini tapır. Həmçinin şagird portfoliosunda toplanır, eyni zamanda şagird gündəliyi vasitəsilə meyarlarla–ümumiləşdirilmiş cümlələrlə valideynə çatdırılır.

Qiymətləndirmənin nəticələrinin qeydiyyatı müəllimlərə, şagirdlərə və valideynlərə aşağıdakı suallara cavab verməyə kömək edir:

• Şagird nələri öyrənmişdir?

• Daha nələri öyrənməlidir?

• İnkişaf üçün hansı addımlar atılmalıdır?

Qeyd etmək lazımdır ki, məktəbli kitabçasına diqqətsiz yanaşmamalı və onun valideynlər üçün əsas məlumat mənbələrindən biri olduğu unudulmamalıdır.

Valideynlər, adətən, məktəbli kitabçasında qiymət görmək istəyirlər, lakin müəllim formativ qiymətləndirmənin mahiyyətini və məqsədini valideynə düzgün izah edirsə, şagirdin gündəlik rəqəmli qiymətləndirilməməsi valideynlər tərəfindən düzgün anlaşılır. Məhz formativ qiymətləndirmə sayəsində valideynlər öz övladlarının inkişafını, nailiyyətlərini daha diqqətlə izləməyə müvəffəq olur, məktəblə, müəllimlə ünsiyyət saxlayırlar. Məsələn, valideyn müəllimin məktəbli kitabçasındakı qeydini- “Yazı yazanda hüsnxət normalarına əməl etmir”–oxuyanda problemin nədə olduğunu başa düşür və bu istiqamətdə iş aparır. Deməli, şagirdlərin meyarlarla qiymətləndirilməsi, bunların məktəbli kitabçasında qeyd edilməsi valideynlərin işini asanlaşdırır. Valideynlər uşaqlarının nədə çətinlik çəkmələri haqqında aydın və anlaşıqlı şəkildə məlumatlanır, hansı istiqamətdə onlara yardımçı olacaqlarını müəyyənləşdirirlər. Həmçinin valideynlər bu qeydlərlə uşaqlarının uğurlu göstəricilərilə də tanış olurlar. Yadda saxlamaq lazımdır ki, müəllim göstərilən üsul və vasitələr əsasında öz işini qurmazsa, zəif şagirdi diqqətdən kənarda saxlayarsa, formativ qiymətləndirmənin inkişafetdirici funksiyası təmin olunmayacaqdır.

*Rəyçi: dos. R.Qəndilov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. // Kurikulum, 2009, № 2.

2. Bəylərov Ə. Şagird nailiyyətlərinin qiymətləndirilməsində yeni yanaşmalara dair. // Kurikulum, 2011, № 2.

3. Hacıyeva T. Məktəblərin daxili qiymətləndirmənin aparılması yolları. // Kurikulum, 2010, № 2.

4. Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları). // Kurikulum, 2010, № 3.

5. Ümumtəhsil məktəblərinin I-IV siniflər üçün fənn kurikulumları. Bakı: Təhsil, 2008.

6. D.Sparks, Leading for Results: Transforming Teaching, Learning and Relationships in Schools (2006).

**Р.Гусейнова**

**Существующие проблемы формативного оценивания и способы их устранения**

**Резюме**

Формативное оценивание является неформальным оцениванием, направлена на реализацию принятых стандартов со стороны ученика и проводится с целью предотвращения каких-либо проблем, выявленных в процессе обучения. Эти прослеживания проводятся для того, чтобы более четко вывести суммативную оценку.

**R.Husseinova**

**Formative assessment, problems and ways of eliminating**

**Summary**

The estimation is informal estimation, is directed on realization of the accepted standards on the part of the schoolboy and is spent with the purpose of prevention of any problems revealed during training at the schoolboys. These shadowings are spent more precisely to deduce summativ an estimation.

# MƏKTƏBƏQƏDƏR TƏHSİLİN YENİ MƏZMUN ÇALARLARI

**Kifayət Məmmədova**
***Təhsil Problemləri İnstitutunun məktəbəqədər təhsilin kurikulumu şöbəsinin elmi işçisi***

***Açar sözlər:*** *məktəbəqədər təhsil, yeni məzmun, təlim nəticələri, məqsəd, məzmun standartları, uşaq, inteqrasiya, inkişaf sahəsi, bilik, bacarıq, nailiyyət, məktəbəqədər müəssisə, valideyn, tərbiyəçi.*

***Ключевые слова:*** *дошкольное образование, новое содержание, результаты обучения, цель, стандарт содержания, ребёнок, интеграция, область развития, знание, умение, достижение, дошкольное учреждение, родитель, воспитатель.*

***Key words:*** *preschool education, new maintenance, training results, aim, maintenance standard, child, integrity, area development, knowledge, ability, achievement, parent, educator.*

Dünya təhsil sisteminə inteqrasiya Azərbaycan təhsilinə də öz təsirini göstərir. Hazırda respublikamızda təhsil sahəsində aparılan islahatlar digər təhsil pillələrində olduğu kimi, məktəbəqədər təhsil pilləsinin qarşısında duran vəzifələrin də təkmilləşdirilməsini tələb edir. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il 16 iyul tarixli, 137 nömrəli qərarı ilə təsdiq edilən “Məktəbəqədər təhsilin dövlət standartı və proqramı”nda nəzərdə tutulan mühüm məsələlər artıq məktəbəqədər təhsil sahəsində özünün uğurlu nəticələrini göstərir. Bu sənədə əsasən hazırlanmış və Təhsil Nazirliyinin 10 iyul 2012-ci il tarixli, 1329 nömrəli əmri ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında Məktəbəqədər təhsilin proqramı (kurikulumu) “(3-6 yaş)” məktəbəqədər təhsilin mahiyyət və məzmununa yeni forma və çalarlar gətirmişdir. Modernləşməkdə olan dünya təhsilinin tələblərinə müvafiq olaraq hazırlanmış məktəbəqədər təhsilin proqramı (kurikulumu) respublikada bu sahədə tətbiq olunan mühüm əhəmiyyətli sənəddir və proqramda məktəbəqədər təhsilin məzmununu əhatə edən bütün zəruri məsələlər sistemli şəkildə əhatə olunmuşdur.

Məktəbəqədər təhsilin proqramında (kurikulumunda) uşaq fəaliyyətinin təmin olunması və bacarıqlarının formalaşması, onun bir subyekt kimi inkişaf etməsi üçün müvafiq təhsil şəraitinin yaradılması nəzərdə tutulur. Bu məqsədin reallaşdırılması üçün aşağıdakı vəzifələrin həyata keçirilməsi məqsədəmüvafiq hesab edilir:

1. Məktəbəqədər dövrdə uşaqların inkişafının izlənilməsi.
2. Uşaqların məktəb təliminə hazırlığının məzmununun tənzimlənməsi.
3. Məktəbəhazırlığın təşkili qaydalarını təqdim etməklə keyfiyyətin təmin olunması.
4. Məktəbəqədər təhsil sahəsində çalışan mütəxəssislərin səriştəliliyinin artırılması.
5. Bütün maraqlı tərəflərin (məktəbəqədər təhsil mütəxəssisləri, ailələr, valideynlər və s.) rollarının müəyyənləşdirilməsilə məktəbəqədər təhsilin keyfiyyətinin təmin edilməsi (1).

Məktəbəqədər təhsilin yeni məzmunu böyüməkdə olan nəslə nəyi öyrətməyin vacib olduğunu, məktəbəqədər təhsil müəssisələrində təlim üçün cəmiyyətin dəyişən tələblərinə müvafiq seçilmiş bilik, bacarıq və vərdişlərin dəqiq sistemini əhatə edir. Bu sistem ətraf mühit, müasir texnologiya, sosial və mədəni inkişaf haqqında biliklərin ümumiləşdirilərək, uşaqların intellektinin yüksəlməsindən, onların nəzəri və təcrübi problemlərinin həllini müstəqil və yaradıcılıqla yerinə yetirmələrinin təmin edilməsinə yönəldilmiş vərdişlərin formalaşdırılmasından ibarətdir.

Məlumdur ki, məktəbəqədər yaşlı uşaqlar bilikləri özünəməxsus səviyyədə mənimsəyir və bacarıqlar formasında nümayiş etdirirlər. Bu səbəbdən məktəbəqədər təhsilin yeni məzmununda uşaqların hər bir yaş səviyyəsinə uyğun olaraq diferensiallılıq gözlənilmiş və proqramda nəzərdə tutulmuş bilik və bacarıqlar uşaqların maksimum tələbatlarına uyğunlaşdırılmışdır.

Məktəbəqədər təhsil proqramının (kurikulumunun) məzmununa - uşaqların ümumi inkişafına xidmət edən 4 inkişaf sahəsi bütün yaş dövrləri və qruplar üzrə mənimsənilməsi əvvəlcədən nəzərdə tutulmuş təlim nailiyyətlərinin konkret hissələri olan ümumi təlim nəticələri, məktəbəqədər təhsilin bütün inkişaf sahələri üzrə reallaşması hər yaş dövrünün sonu üçün nəzərdə tutulmuş, uşaqların bilik və bacarıq səviyyələrinə qoyulmuş dövlət tələbi olan məzmun standartları daxildir. Məktəbəqədər təhsilin proqramı məktəbəqədər yaşlı uşaqların biliklərini sistemli şəkildə fiziki, estetik, idraki və sosial istiqamətlərdə inkişaf etdirir və onların sağlamlığı, özünəxidmət bacarıqları, elementar təhlükəsizlik qaydalarına əməl etmələri, idrak və təfəkkürünün inkişaf etdirilməsi, ətrafdakılarla sosial münasibətlərin qurulması, mədəni yaradıcılıq nümunələrinin nümayiş etdirilməsi və s. bu kimi biliklərin gələcəkdə bacarıqlara çevrilməsini təmin edir.

Məktəbəqədər təhsilin proqramının (kurikulumunun) srtukturu aşağıdakı kimi müəyyənləşdirilmişdir:

Giriş.

1. Məktəbəqədər təhsilin məzmunu.
2. Təlim strategiyaları.
3. Uşaq inkişafının izlənilməsi və dəyərləndirilməsi.
4. Uşaqların yaş və inkişaf səviyyəsinin qiymətləndirilməsinə dair nümunələr.

Tezaurus.

İstifadə olunmuş ədəbiyyat.

Məktəbəqədər təhsilin proqramı (kurikulumu) uşaqların maraq və ehtiyacları nəzərə alınmaqla milli və ümumbəşəri dəyərlərə uyğun hazırlanmış mühüm sənəddir. Məktəbəqədər təhsilin yeni məzmununun ümumi əsasları uşaqyönümlülük, nəticəyönümlülük, inkişafyönümlülük, inteqrativlik, hər bir uşağın inkişafı üçün bərabər şəraitin yaradılması, millilik və dünyəviliyin nəzərə alınması, uşaqların məktəb təliminə hazırlanmasının zəruriliyi kimi mühüm prinsiplərdən ibarətdir ki, bütün bunlar da yüksək intellektə malik yaradıcı şəxsiyyətin formalaşdırılmasına yönəldilmişdir.

Uşaqyönümlülükdə uşaq fəaliyyətinin təmin olunması və bacarıqlarının formalaşması, təlimin uşaqların meyil və maraqları əsasında təşkil olunması üçün şəraitin yaradılması mühüm şərt kimi nəzərə alınmışdır. Məzmunda uşaqların bilik və bacarıq səviyyələrini əks etdirən standartların verilməsi və bu standartların uşaqlara yönəldilməsi uşaqyönümlülüyü ifadə edir və uşaqlara yeni biliklər öyrənərkən, yaxud oyun zamanı sərbəst seçimlər etməyə, müəyyən fəaliyyətlərdə təşəbbüskarlıq göstərməyə, yiyələndiyi təcrübələr əsasında prosedural biliklərdən kontekstual biliklərə keçid etməyə və bütöv şəxsiyyət kimi

inkişaf etməyə şərait yaradır.

Nəticəyönümlülük digər prinsiplərdən və ənənəvi proqramdan fərqlənir. Bu, təlimdə əldə olunacaq son nəticələri, əldə olunacaq nailiyyətləri əvvəlcədən görməyə və məzmuna gətirməyə, daha dəqiq desək, məzmunun nəticəyə yönəlməsinə imkan verir. Məktəbəqədər təhsilin proqramında verilmiş nəticələr həm məzmunu müəyyənləşdirir, həm də uşaqların əldə etdiyi nailiyyətlərin dəyərləndirilməsinə şərait yaradır.

Uşaqların idrak fəallığının izlənilməsi, inkişaf səviyyələri və nailiyyətlərinin təhlil edilməsi, bilik, bacarıq və vərdişlərinin inkişaf səviyyəsinin tənzimlənməsi onun inkişafyönümlülüyünü meydana çıxarır (1). Uşaqların yiyələndikləri bilikləri tədqiqat zamanı bacarıqlara çevirmələri üçün səmərəli təlim prosesinin təşkil olunması, hər bir uşağın inkişaf səviyyəsi və maraq dairəsinə uyğun planlaşdırma aparılması onların hərtərəfli inkişaf etmələrinə təkan verir.

Məktəbəqədər təhsilin proqramında (kurikulumda) məzmun standartlarının fiziki, sosial-emosional, idraki və estetik bacarıqların ifadə olunmasına yönəlməsi isə onun inteqrativliyidir ki, bu da məktəbəqədər yaşlı uşaqların bütün inkişaf sahələrinin əlaqəli inkişafını təmin etmək məqsədinə xidmət edir.

Hər bir uşağın inkişafı üçün bərabər şəraitin yaradılması prinsipi nəzərdə tutulmuş ümumi təlim nəticələrinə nail olmağı və bütün uşaqların təlimə yiyələnməsi üçün bərabər şəraitin yaradılmasını, təlimin keyfiyyətinin yüksəldilməsi və səmərəliliyinin artırılmasını təmin edir.

Millilik və dünyəvilik prinsipi milli ruhda böyüyən və ümumbəşəri dəyərlərə yiyələnməklə yüksək intellektə malik uşaq şəxsiyyətinin formalaşdırılması məqsədini güdür.

Uşaqların məktəb təliminə hazırlığı prinsipi uşaqlarda oxuma və yazmaya həvəs, məktəbə müsbət emosional münasibəti inkişaf etdirir və onlarda fiziki, psixi və sosial keyfiyyətləri formalaşdırır.

Adətən, sosial təcrübələr məktəbəqədər təhsilin məzmununa ayrı-ayrı hissələr-məşğələlər kimi daxil olur və əvvəllər bu istiqamətlər üzrə öyrədilirdisə, müasir məktəbəqədər təhsil proqramı (kurikulum) bundan fərqli olaraq, bu pillə üçün mühüm əhəmiyyət kəsb edən dörd inkişaf sahəsi üzrə öyrənilir. Həmin inkişaf sahələri uşaqların ümumi inkişafını və məktəb həyatına tam hazırlıqlı olmalarını təmin edir. İnkişaf sahələri uşaqların hər bir inkişaf sahəsi üzrə ümumi təlim nəticələrinin reallaşmasını təmin etmək üçün müəyyən olunan məzmunun zəruri hissəsidir. Məktəbəqədər təhsilin inkişaf sahələri aşağıdakılardır:

- Fiziki inkişaf, sağlamlıq və təhlükəsizlik;
- İdrakın inkişafı;
- Estetik və yaradıcı inkişaf;
- Sosial-emosional inkişaf.

Məktəbəqədər təhsilin sonunda və hər bir inkişaf sahəsi üzrə hər yaş dövrünün sonu üçün ümumi təlim nəticələri və hər inkişaf sahəsinə uyğun məzmun standartları müəyyənləşdirilmişdir. Ümumi təlim nəticələri uşaqların hər yaş dövrünün sonunda yiyələnəcəkləri bilik və bacarıqları, qazandıqları təlim nailiyyətlərinin konkret səviyyələrini göstərir.

Məktəbəqədər təhsilin proqramı (kurikulumu) aşağıdakı funksiyaların reallaşdırılmasına xidmət edir:

• məktəbəqədər təhsilin bütün yaş dövrləri üzrə tədris olunan hər bir inkişaf sahəsi arasında inteqrativliyin və ardıcıllığın təmin edilməsi;

• inkişaf sahələrinin məzmununun uşaqların maraq və meyillərinə uyğun təkmilləşdirilməsi;

• təlim nailiyyətlərinin konkret səviy-

yəsi olan ümumi təlim nəticələrini özündə ehtiva edən məzmun standartlarının reallaşmasına nail olunması;

• məşğələlərdə yeni təlim texnologiyalarının, təlim üsullarının və interaktivliyin təmin olunması;

• məktəbəqədər təhsilin kurikulumunun prinsipləri ilə tam əhatə olunan səmərəli təlimin təşkili;

• uşaq nailiyyətlərinin müəyyən edilmiş dəyərlər əsasında obyektiv və etibarlı vasitələrlə ölçülərək, qiymətləndirilməsi.

Məktəbəqədər təhsil pilləsində öyrədiləcək məzmun proqramda məzmun standartları şəklində verilir ki, bunlar da yaş dövrlərinə uyğun olaraq hər bir inkişaf sahələri üzrə müəyyənləşdirilmişdir. Məzmun standartları əsas və alt standartlara ayrılır. Məzmun (əsas) standartlar uşaqların bilik və bacarıq səviyyələrinə qoyulmuş dövlət tələbidir və onlar inkişaf sahələrinin hər yaş dövrü üçün müəyyənləşdirilmiş ümumi təlim nəticələrinin həmin yaş dövrlərinin sonuna qədər reallaşmasını və uşaqların həmin nəticələrə nail olmalarını təmin edir. Alt standartlar isə nisbətən konkret təlim nəticələri olub, müəyyən mərhələdə uşağın əldə etməli olduğu bilik, bacarıq və dəyərləri ifadə edir. Məzmun standartları aşağıdakı funksiyaları yerinə yetirir:

- inkişaf sahələri üzrə (məsələn: idrakın inkişafı) müəyyən olunan təlim nəticələrini bütün yaş dövrləri üzrə ümumi şəkildə ifadə edir;

- inkişaf sahələri üzrə summativ qiymətləndirmənin aparılmasında istifadə edilir.

Alt standartların funksiyaları aşağıdakılardır:

- təlim məqsədlərinin dəqiq müəyyən olunması üçün etibarlı zəmin yaradır;

- təlim strategiyalarının düzgün seçilməsində mühüm rol oynayır;

- təlimdə inteqrativliyi təmin edir;

- təlimin məzmununun ardıcıl və davamlı inkişafını təmin edir.

Məktəbəqədər təhsil proqramının (kurikulumun) nəticəyönümlü olması təlimdə əldə olunacaq son nəticələri əvvəlcədən görməyə və məzmuna gətirməyə, yəni məzmun standartlarının nəticələrə yönəlməsinə imkan verir. Belə ki, məzmun standartları ümumi təlim nəticələrində nəzərdə tutulmuş nailiyyətləri bir növ geniş şəkildə əks etdirərək, bütünlüklə təlim nəticələrinin reallaşmasına xidmət edir və standartlarda qoyulmuş tələblər bilik formasında uşaqlar tərəfindən mənimsənilərək, təcrübədə bacarıqlara çevrilir. Ümumi nəticələr bütün inkişaf sahələri üzrə hər bir yaş dövrünə uyğun mənimsənilməsi nəzərdə tutulan və əvvəlcədən müəyyənləşmiş təlim nailiyyətlərinin konkret hissəsi olduğundan, onlar həm məzmunu müəyyənləşdirir, həm də uşaqların əldə etdiyi nailiyyətlərin dəyərləndirilməsinə şərit yaradır.

Tərbiyəçilərə məzmun standartlarının reallaşdırılması zamanı aşağıda qeyd olunan məsələlərə diqqətlə yanaşmaları tövsiyə olunur:

• hər bir yaş mərhələsində mənimsənilməsi əvvəlcədən nəzərdə tutulmuş ümumi təlim nəticələrinə nail olunması üçün məzmun standartlarının reallaşdırılması;

• hər yaş dövrünün sonunda uşaqların bilik və bacarıq səviyyələrinin məzmun standartlarında qoyulan tələblərə mütləq cavab verməsi;

• məzmun standartlarının hər yaş dövrü üçün minimum tələblər olduğunu nəzərə alaraq, uşaqların həmin qoyulmuş tələblərdən daha artıq nailiyyətlər əldə etməsi;

• məzmun standartlarındakı biliklərin uşaqlar tərəfindən mənimsənilməsi və praktikaya tətbiq olunaraq həmin biliklərin bacarıqlara çevrilməsi;

• mövzunun məqsədlərinin alt standartlara uyğun olaraq düzgün müəyyən-

ləşdirilməsi və s.

Yeniliklərlə işləyən hər bir müasir tərbiyəçi ilboyu müntəzəm olaraq təlimləri elə təşkil etməlidir ki, uşaqların inkişaf səviyyəsi hər yaş dövrünün sonunda məzmun standartlarında qoyulan tələblərə cavab versin.

Beləliklə, məzmun standartları dövlət tələbi olduğundan, hər bir uşaq tədris ilinin sonunda həmin il üçün nəzərdə tutulan standartlara cavab verməlidir ki, bu məsələyə hər bir tərbiyəçinin xüsusi məsuliyyətlə yanaşması, təlim zamanı uşaqlar üçün bərabər imkanların yaradılması mühüm şərtdir.

*Rəyçi: dos. L.Cəfərova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında məktəbəqədər təhsilin proqramı (kurikulumu) (3-6 yaş). 10 iyul, 2012-ci il.

2. Məktəbəqədər təhsilin dövlət standartı və proqramı. 16 iyul 2010-cu il. http://www.edu.gov.az/

3. Azərbaycan Respublikasının Təhsil sahəsində islahat Proqramı. Bakı,1999, s.8.

4. А.В.Запороже. Некоторые проблемы развития познавательных и волевых процессов у дошкольников. М., Просвещение, 1956.

**К.Мамедова**

**Новые содержательные свойства дошкольного образования**

**Резюме**

Новое содержание дошкольного образования охватывает точную систему знаний, навыков и умений, выбранных адекватно меняющимся требованиям общества в дошкольных учреждениях. Эта система состоит из повышения интеллекта детей, и формирования таких важных компетенций, как самостоятельное решение теоретических и практических проблем у детей.

**K.Mammadova**

**Feature new content preschool education**

**Summary**

What does the new party and special pre-school education in the context of the growing importance menyaischemsya needs of society and the proper selection of pre-school educational institutions, knowledge, skills and abilities required of the system. This system In this system, the environment, social and cultural development of modern technology to enhance their knowledge about the theoretical and practical problems of intelligent children generalized solution is the creation of independent creative skills to ensure graduates meet.

***İnnovasiyalar***

# CƏMİYYƏTİN İNKİŞAFINDA İNFORMASİYA MÜBADİLƏSİNİN TEXNOLOJİ TƏŞƏKKÜLÜ

**Şahrza Ağayev**
***pedaqogika üzrə fəlsəfə doktoru, Azərbaycan Müəllimlər İnstitutunun dosenti***

**Xədicə Əliyeva**
***Bakı şəhəri Nərimanov rayonu Məktəb-Lisey Kompleksinin direktor müavini***

***Açar sözlər:*** *informasiya, texnologiya, kommunikasiya, rabitə.*
***Ключевые слова:*** *информация, технология, коммуникация, связь.*
***Key words:*** *information, technology, communication, relation.*

Müasir dövrdə informasiya və kommunikasiya texnologiyaları daha çox sahəni əhatə edir. Onun tətbiq sahələri hər gün qəbul edilərək informasiyanın həcmini durmadan artırır.

Bunlar isə təhsil sistemində çalışanların pedaqoji-psixoloji hazırlığının daim təkmilləşdirilməsini tələb edir. Dünyada baş verən qloballaşma, ilk növbədə özünü informasiya mübadiləsində aydın göstərir. Bəşər tarixində informasiya yükü artdıqca yeni ünsiyyət texnologiyaları yaranmağa başlamışdır. Buraya yazı, kitab çapı, teleqraf və nəhayət, informasiya-kommunikasiya texnologiyaları da daxildir. Artıq sübut olunmuşdur ki, cəmiyyətdə ünsiyyətin yaradılmasında İKT müstəsna əhəmiyyət kəsb edir. Belə informasiya mübadiləsi psixoloji ədəbiyyatlarda ünsiyyətin kommunikativ formatı adlanır. Araşdırmalar göstərir ki, əməli fəaliyyətlə məşğul olan insanlar məqsədyönlü, planlı, mütəşəkkil addımlar atmaqda zəruri olan informasiya mübadiləsinə daimi ehtiyac duyurlar. Ünsiyyətsiz pedaqoji prosesi təsəvvür etmək mümkün deyildir. Çünki burada iki tərəf vardır: öyrədən (informasiyanı verən), öyrənən (məlumatı qəbul edən). Birinci tərəf kommunikativ, ikinci tərəf resipiyent adlanır. Deyilənləri K – İ – R kimi işarələmək olar: Demək, hər cür informasiya mübadiləsi kommunikativ informasiya resipiyent sxemi üzrə həyata keçirilir.

Onu da qeyd etmək lazımdır ki, informasiya mübadiləsini təmin etmək üçün kifayət qədər üsullar vardır. Onlar iki qrupa bölünür:

- Birinci qrup: Sözlərin, dilin köməyi ilə bağlı olan informasiya vasitələri. Bu cür verbal (şifahi dil cavabları) kommunikasiya vasitələri dillə bağlı olduğu üçün həmin ünsiyyət prosesi nitq adlanır.
- İkinci qrup: kommunikasiya vasitələri, qeyri-verbal, müxtəlif ifadəli hərəkətlər, mimika, işarələr sistemi və s. aid etmək olar.

Yeri gəlmişkən xatırlatmağı lazım bilirik ki, başlıca ünsiyyət vasitəsi olan dilin yaranması ilə bağlı çoxlu nəzəriyyələr var-

dır. Onlardan biri də "Əmək hıçqırıqları nəzəriyyəsi"dir. Bunu Fransız filosofu Lüdviq Hyare (1829-1889) irəli sürmüşdür. Dilin mənşəyini izah etməyə çalışan bu alimin yanaşmasına görə dil əmək prosesində insanların çıxartdığı instiktiv və ya reflektiv hıçqırıqlar əsasında yaranmışdır. Məsələn: odunyaran adamın baltanı vurarkən, yaxud matraflar çəkərkən çıxartdıqları səslər dilin ilk sözləri, felləri olmuş, digər sözlər də bunlardan əmələ gəlmişdir. Lüdviq Hyarenin düşüncəsinə görə əməklə dil paralel amillərdir. Dil insanın əmək prosesini müşayiət edir. Eyni zamanda dil əməyi müşayiət etməyə də bilər, yəni səs çıxartmadan da ağaca balta vurmaq olar. Elmi əsası olmayan belə nəzəriyyələr hadisənin mahiyyətini tam aça bilmir. Dil ünsiyyət vasitəsidir (Bax: № 15 – səh. 76-77). Elmi ədəbiyyatlarda dil, adətən, şərti işarələrin sistemi kimi mənalandırılır. Dil vasitəsilə insanlar arasında həyata keçirilən ünsiyyət prosesi nitq adlanır. Cəmiyyət tərəfindən yaranan dil məxsus olduğu xalqın başlıca atributudur. Demək, dil verbal ünsiyyətdə rabitə, nitq isə prosesin özüdür. Hər hansı məmulat hazırlanarkən istifadə olunan zəruri alətlər emal zamanı vasitələrdir, baş verən dəyişikliklər isə prosesdir, texnologiyalardır (kəsmə, deşmə, birləşdirmə və s.). Təcrübə göstərir ki, insanlar ünsiyyət prosesində heç də həmişə verbal kommunikasiya vasitələrindən istifadə etmirlər. Nitqdən kənar vasitələrdən istifadə etmək zərurətinin yaranma halları daim artmaqdadır. Buna başlıca səbəblərdən biri kimi inteqrasiyanın, beynəlxalq əlaqələrin sürətlə genişlənməsidir. Son illərin texnoloji vasitələrin təkmilləşmə zərurətinin yüksəlməsi, insanlar arasında ünsiyyətin qeyri-verbal formatı, demək olar ki, üstünlüyü ələ almaqdadır. Məsələn: dünyada yaşayan insanların başa düşə biləcəyi simvollardan istifadə edilməsi aeroportlarda, avtovağzallarda və digər ictimai yerlərdə qoyulan simvolların köməyi ilə insanlar dayanacaqlar, yeməkxanalar, yanacaq və təmir yerləri və s. barədə düzgün məlumat əldə edirlər.

Pedaqoji prosesdə qeyri-verbal ünsiyyət vasitəsi kimi müəllim müxtəlif intonasiyalardan, öskürməkdən və s. istifadə edir. Eyni zamanda insanlar öz geyimləri ilə də onları əhatə edən adamlara münasibət bildirirlər.

Mütəxəssislər şəxsiyyətlərarası ünsiyyətdə dörd əsas zonanın mümkünlüyünü diqqətə çatdırırlar.

• Yaxın ünsiyyət zonası (yarımmetrlik məsafədə). Bu məsafədə valideynlər, övladları, olduqca yaxın dostlar, sevgililər ünsiyyət saxlayırlar.

• Şəxsi ünsiyyət zonası (0,5 metrdən 1,5 metrə qədər olan məsafə). Bu məsafədə bir-biri ilə yaxından tanış olan adamlar ünsiyyət saxlayırlar.

• Formal ünsiyyət zonası (1,5 metrdən 3 metrə qədər olan məsafə). Bu məsafəni işgüzar adamlarla ünsiyyət və az əhəmiyyətli söhbət zamanı gözləyirlər.

• Ümumi ünsiyyət zonası (3 metrdən uzaq məsafə). Bu məsafədə mühazirə dinlənilir, ümumi ünsiyyət situasiyası yaranır.

Dünyada formalaşmaqda olan informasiya cəmiyyətinin əsas məqsədi insanların düşündüklərini ünsiyyət üçün maneəsiz olaraq ictimaiyyətə çatdırmaqdır.

1948-ci ildə qəbul edilmiş "Ümumdünya İnsan Hüquqları Bəyannaməsi"ndə proseslə əlaqədar deyilir: "Hər bir insan əqidə azadlığı və onu sərbəst ifadə etmək hüququna malikdir: bu hüquqa maneəsiz olaraq öz əqidəsində qalmaq azadlığı və istənilən vasitələrlə və dövlət sərhədlərindən asılı olmayaraq, informasiya və ideyalar axtarmaq, almaq və yaymaq azadlığı daxildir". Hazırda internet və onun infrastrukturu, fəaliyyət sferası və imkanları genişlənməkdədir. Burada təkcə informasiya almaq deyil, eyni zamanda elektron poçt, kitabxana, elm,

ticarət, virtual əmək münasibətləri və bir çox vasitələrdən faydalanmaq da aktuallaşır.

Tədqiqatlar sübut etmişdir ki, bədənin tədrici inkişafı adlanan somatik təkamül proseslərində orqanizmlərdə maddələr və enerji mübadiləsi ilə yanaşı, xarici mühitdən gələn siqnalları qəbul etmək və onları cavablandırmaq qabiliyyəti də formalaşmağa başlamışdır.

Cəmiyyətdə birinci informasiya inqilabı Şumerlərin təxminən e.ə. 5-6 min il bundan əvvəl kəşf etdiyi yazı olmuşdur.

Şumer dövləti Mesopotamiyada (Mesopotamiya yunan dilində ikiçayarası deməkdir) Dəclə və Fərat çaylarının kəsişməsində yerləşmişdir.

Tarixilik baxımından belə bir faktı xatırlatmaq vacibdir. Texnoloji cəhətdən müasir İKT infrastrukturunun inkişafı ilə əlaqədar Azərbaycanın təhsil sistemində təminat dinamik səciyyə daşıyır. Bu istiqamətdə söhbət açılarkən bir sıra cəhətlərə də aydınlıq gətirilməlidir.

• Məlumat və resurs mərkəzi (mkm). Mərkəzdə Azərbaycan Təhsil Şəbəkəsinə (ATŞ) internetə “giriş və çıxış nöqtəsi” olmaqla yanaşı, eyni zamanda fasiləsiz olaraq təhsilə aid informasiya resursları toplanır. Xüsusi mərkəzləşdirilmiş antivirus proqramı təminatı mərkəzə qoşulmuş məktəblərdəki kompyuterləri avtomatik olaraq yeniləşdirir. Birbaşa mərkəzdən idarə olunan məktəblərdəki kompyuterlərin texniki xidmətinin səviyyəsi daim əhəmiyyətli dərəcədə artırılır.

• Avadanlıq təchizatı ilə bağlı “2008-2010-cu illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı” çərçivəsində mühüm layihə həyata keçirilmişdir. Təhsil müəssisələrinə 5585 ədəd stolüstü kompyuter, 1640 ədəd noutbuk və 1576 ədəd proyektor paylanması proqramın uğurla reallaşmasının göstəricilərindəndir. Ölkə üzrə ümumtəhsil məktəblərində 5-11 siniflərin sayına görə şagird kompyuter nisbəti 1:16-ya çatmışdır. Bununla yanaşı, Məlumat və Resurs Mərkəzi və eləcə də 1700 təhsil müəssisəsinin təxminən 17.000 sinif otağı şəbəkə avadanlıqları ilə təchiz olunmuşdur. İndi təhsil müəssisələrində “Mimio”, “Promethean” və “Smart” şirkətlərinin istehsalı olan 300-ə yaxın interaktiv lövhələr vardır.

• Təhsilimizin həyatında çox böyük hadisə olan “Elektron Məktəb” layihəsi 2009-cu ildən reallaşmağa başlamışdır. Layihəyə cəlb olunan 50 təhsil müəssisəsinin 43-ü ümumi təhsilə aiddir. Layihənin əsas məqsədi informasiya-kommunikasiya texnologiyalarının tədris sistemində geniş və hərtərəfli tətbiqinə nail olmaqla yanaşı, qazanılan müsbət nəticələrin ölkədəki digər təhsil ocaqlarında istifadəsini həyata keçirməkdir.

• “Bir şagird: bir kompyuter” layihəsinin pilot tətbiqi “2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı” çərçivəsində həyata keçirilməyə başlamışdır. İlkin sınaq üçün layihəyə 15 pilot məktəb (Bakıdan – 12, Sumqayıtdan – 2, Xaçmazdan – 1 məktəb) cəlb edilmişdir. Bu məktəblərə ümumilikdə təhsil üçün nəzərdə tutulmuş 2277 noutbuklar paylanmış və limitsiz internet şəbəkəsi qurulmuşdur.

Sağlamlıq imkanları məhdud olan uşaqların distant təhsilin inkişafına təminat yaratmağa xidmət edən “Elektron Təlimləndirən Sistemlər” adlı layihənin icrasına başlanması yenilik kimi təqdirəlayiqdir. Layihənin çərçivəsinə uyğun olaraq 60 şagird və 10 müəllim heyətinə ən yeni texnologiya və proqram təminatları ilə təchiz olunmuş noutbuk verilmişdir. Eyni zamanda 60 şagirdin evinə internet xətti çəkilmişdir. Şagirdlərin dərs prosesinin idarə olunması üçün Bakıdakı 20 nömrəli məktəbdə Distant Təhsil Mərkəzi yaradılmışdır. Mərkəzdə yüksəksürətli fileroptik internet intranet bağlantıları

quraşdırılmışdır. Müəllim, şagird və valideynlərin təhsil prosesinə qoşulmaları üçün WWW məsafəedən məktəb.az portalı fəaliyyət göstərir.

Tədris prosesində istifadə olunan informasiya texnologiyaları şagirdlərin tədqiqat bacarıqlarının inkişafına şərait yaradır, maraq dairələrini genişləndirir, təlimin motivasiyasını yüksəldir, şagirdlərin sərbəst və yaradıcı işlərini aktivləşdirir.

Təhsildə informasiya-kommunikasiya texnologiyaları (İKT) üzrə zəruri amillərin reallaşdırılması bir çox yeniliklərin müəllim və şagird hazırlığının inkişafında mühüm əhəmiyyət kəsb edir. Müşahidələr göstərir ki, İKT-nin təhsilə transformasiyasında müəllimlərin rolu göstərilən səviyyədən asılıdır. Bu problemin həlli üçün müəllimlərin qarşısına İKT ilə əlaqədar xüsusi tələblər qoyulmalıdır. Bu məqsədlə UNESKO müəllimlərin İKT üzrə bacarıqlarına qarşı tələblərin çərçivə sənədini müəyyənləşdirmişdir. Bilmək lazımdır ki, təşkilatın tövsiyələrinin yeni versiyası "CİSCO", "İNTEL", "İSTE" kimi qurumların birgə iştirakı ilə UNESKO və "Microsoft" tərəfindən 2011-ci ildə hazırlanmışdır. UNESKO həmin tövsiyələri müntəzəm olaraq təkmilləşdirir.

Həmin tövsiyələrdə müəllimlərin İKT üzrə bacarıqları ilə əlaqədar üç yanaşma vardır:

Birinci yanaşma: "İKT-nin təhsilə tətbiqi". Bu yanaşmaya görə, müəllimlərdən təlim prosesində şagirdlərin İKT vərdişlərinin effektivliyinin artması tələb olunur.

İkinci yanaşma: "Biliklərin mənimsənilməsi" adlanır. Burada müəllimlərin və şagirdlərin qarşısında təlim subyektlərinin dərindən mənimsənilməsi real aləmdə zəruri məsələlərin həllində qurulan biliklərin tətbiqi tələbi nəzərdə tutulur.

Üçüncü yanaşma: "İnformasiya istehsalıdır". Bu tələbə görə, müəllimlər öyrənənləri cəmiyyətin ahəngdar inkişafı üçün vacib olan yeni biliklərin istehsalına (emalına) yardım etməlidirlər.

Təhsil cəmiyyətin aparıcı qüvvəsi olduğu üçün onun qarşısında çox mühüm beynəlxalq tələblər qoyulur:

• ölkələr, müxtəlif mədəniyyətlər arasında qarşılıqlı anlaşmanı yaxınlaşdırmaq;
• münaqişələrin sülh yolu ilə həlli;
• cəmin bütün üzvlərinin fiziki və mənəvi təkmilləşdirilməsi;
• iqtisadi inkişafa dəstək olmaq;
• yoxsulluğun azaldılması;
• həyat səviyyəsinə birbaşa təsir etmək.

UNESKO-nun İKT-dən istifadə ilə əlaqədar tələblərdə təhsil islahatları ilk növbədə iqtisadi inkişafla şərtləndirilir.

Bütün bunlar onunla bağlıdır ki, müasir kurikulum ənənəvi təhsil proqramından özünəməxsus bir sıra üstün cəhətləri ilə fərqlənir. Belə ki, müasir kurikulum şəxsiyyətyönümlü, şagirdyönümlü, nəticəyönümlü və tələbyönümlüdür. Bu da informasiya mübadiləsində nəzərə alınmalıdır.

Azərbaycan bütün sahələrdə dinamik inkişaf edir. İnformasiya-kommunikasiya texnologiyaları üzrə qazanılan uğurların əsası ulu öndər Heydər Əliyev tərəfindən qoyulmuşdur. Onun "Azərbaycan Respublikasının inkişafı naminə informasiya və kommunikasiya texnologiyaları üzrə Milli Strategiyanın (2003-2012-ci illər)" təsdiq edilməsi haqqında 17 fevral 2003-cü il tarixli sərəncamın tələblərinin ölkə başçısı möhtərəm Prezident İlham Əliyev tərəfindən uğurla həyata keçirilməsi dünyada inkişaf etmiş ölkələrlə inteqrasiyanın reallaşmasına təminat vermişdir. Milli Strategiyadan irəli gələn vəzifələrin yerinə yetirilməsinin təmin edilməsi, İKT-nin inkişafını və geniş tətbiqini həyata keçirməyə xidmət göstərən Azərbaycan Respublikasında rabitə və informasiya texnologiyalarının inkişafı üzrə 2010-2012-ci illər üçün Dövlət Proqramı

Prezidentin Sərəncamı ilə göstərilən fəaliyyəti uğurlu nəticələr qazanmışdır. Həmin nəticələrdən birincisi İKT-nin geniş tətbiqi sayəsində respublikada informasiya cəmiyyətinə keçid üçün real şəraitin yaradılmasına nail olmaqdır. "Azərbaycan 2020: - Gələcəyə baxış" inkişaf konsepsiyasının mühüm hədəfi İKT-nin illik artımın təxminən 1820 faiz ətrafında saxlamaqla, qarşıdakı səkkiz ildə bu sahədə gəlirlərini 8-9 milyard ABŞ dollarına çatdırmaqdır.

Azərbaycan Respublikasında 2013-cü il Prezidentin müvafiq sərəncamı ilə "İnformasiya-kommunikasiya texnologiyaları ili" elan edilmişdir. Sərəncamın tələbinə uyğun olaraq geniş tədbirlər planı müəyyənləşdirilmişdir. Burada informasiya cəmiyyəti və insan potensialının inkişafı, İKT potensialının gücləndirilməsinə xüsusi diqqət ayrılmışdır.

Mövzu ilə əlaqədar aşağıdakı nəticələri söyləmək olar:

- informasiya mübadiləsinin texnoloji təşəkkülü bəşər tarixinin inkişafını əks etdirir.
- informasiya cəmiyyəti insan cəmiyyətinin yeni inkişaf mərhələsidir.
- informasiya texnologiyalarından bacarıqla istifadə edilməsi cəmiyyət üzvlərinin həyat tərzinin yüksəldilməsində mühüm əhəmiyyət kəsb edir.
- informasiya texnologiyalarından səmərəli istifadənin elmi-praktik əsasları təhsil müəssisələrində mənimsədilməlidir.
- əmək məhsuldarlığının artırılmasında biliklərin mübadiləsinə ehtiyac vardır.
- ölkədə informasiya cəmiyyətinin formalaşması istiqamətində dövlətin sistemli olaraq proqramların reallaşdırması bütün sahələrdə dinamik inkişafı təmin edir.
- cəmiyyətin inkişafının yeni mərhələsində informasiya iqtisadiyyatın və sosial həyatın əsas resurslarındandır.

*Rəyçi: prof. İ.Əhmədov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında inkişaf naminə İKT-nin tətbiqi və inkişaf etdirilməsinin milli strategiyası (İKTMS). 2003-2012-ci illər. Bakı, 2003. www.tqdk.az.
2. Azərbaycan Respublikasında rabitə və İKT-nin inkişafı üzrə Dövlət Proqramı. 2005-2008-ci illər. (Elektron Azərbaycan). Bakı, 2005.
3. Qurbanov A. İnsan və dil. Bakı: Gənclik, 2006.
4. Əliquliyev R., Qurbanova Ə. Azərbaycan terminaloji informasiya sisteminin yaradılmasının konseptual əsasları, informasiya cəmiyyəti problemləri. 2011, № 1.

**Ш.Агаев,**
**Х.Алиева**

**Технологическое происхождение обмена информацией в развитии общества**

**Резюме**

В этой статье повествуется о первоначальных видах средств информации, о реализованных проектах в области образования и об их благотворном влиянии на общее развитие страны.

**Sh.Agayev,**
**H.Aliyeva**

**The role of sharing information - communication technology in the development of society**

**Summary**

The article is dedicated to the role of sharing information technology in the development of society, initial kinds of information techniques, and the projects on education in Azerbaijan.

# TƏDRİS PROSESİNDƏ STANDARTLARIN ÖYRƏDİLMƏSİ TƏCRÜBƏSİNDƏN

**Rəmziyyə Babayeva**
***Bakı şəhəri Nərimanov rayonu Məktəb-Lisey Kompleksinin müəllimi***

***Açar sözlər:*** *müəllim, tədris prosesi, standartlar, məzmun, fəaliyyət.*
***Ключевые слова:*** *учитель, учебный процесс, стандарты, содержание, деятельность.*
***Key words:*** *teacher, teaching process, standards, content, activity.*

Müasir mərhələdə bütün sahələrdə həyata keçirilən iqtisadi, sosial, mədəni islahatların nəticəsi olaraq ölkəmiz dinamik inkişaf yolu ilə inamla irəliləyir, onun beynəlxalq aləmdə nüfuzu güclənir. Respublikamızda hər bir sahədə müşahidə olunan fasiləsiz inkişaf tendensiyası özünü təhsil sektorunda da göstərir. Bu inkişafın əsasında ulu öndər Heydər Əliyevin ideyaları və həmin ideyaların işığında həyata keçirilən aydın və ardıcıl strateji kurs dayanır. Möhtərəm Prezidentimiz İlham Əliyevin rəhbərliyi ilə müəyyənləşdirilən və icra edilən dövlət proqramları təhsil sistemində keyfiyyətcə yeni inkişafa, yüksək nəticələrin əldə edilməsinə geniş imkan və şərait yaradır. Ölkəmizdə aparılan təhsil islahatları səmərəliliyini artıran nəticələrə gətirib çıxarır. Bu da təbiidir. Çünki yeni texnologiyalar əsri olan XXI əsrdə ümumtəhsil məktəbinin başlıca vəzifəsi yüksək intellektual hazırlığa malik olan, qazandığı biliklərdən istifadə etməyi bacaran, dünyagörüşü hərtərəfli inkişaf etmiş, milli və ümumbəşəri mənəvi keyfiyyətlərə yiyələnmiş şəxsiyyətin, əsl vətəndaşın yetişdirilməsindən ibarətdir. Ölkəmizdə tədris prosesinin təşkilinin yeni, daha səmərəli formalarının tətbiq edilməsi də bu məqsədə xidmət edir. Təhsilin keyfiyyətini yüksəltmək və onun dinamik inkişafını təmin etmək üçün yeni pedaqoji texnologiyalardan, yeni təlim metodlarından istifadəyə üstünlük verilir. Ona görə ki, xalqın intellektual–mənəvi potensialına, milli dəyərlərinə əsaslanan demokratik cəmiyyət qurmaq inkişafda olan dövlətlərin müasir dövrdə ən vacib vəzifələrindən biridir. Yetişməkdə olan gənc nəslin həyata hazırlanmasında, cəmiyyətin hər bir üzvünün vətəndaş kimi formalaşmasında təhsilin üzərinə mühüm vəzifələr düşür. Təlim prosesi ilə bağlı bütün fəaliyyətlərin səmərəli təşkili, standartların öyrədilməsi, məqsədyönlü və ardıcıl həyata keçirilməsinə imkan yaradan kurikulumun ibtidai siniflərdə tətbiqi–müəllimin peşəkarlıq səviyyəsinin və pedaqoji fəaliyyətinin yüksəlməsini tələb edir.

Standartların öyrədilməsində fəal təlimin məntiqə söykənən bir sıra nəticələrini nəzərə alıram. Dərsdə problemin həlli məzmun xətti və standartların öyrədilməsi ilə səciyyələnir. Bu öyrənmədən şagirdlər yeni bilikləri müstəqil olaraq əməli fəaliyyətləri əsasında dərk etməlidirlər. Düzgün istiqamətləndirmə şagirdin özünü şəxsiyyət kimi dərk etməsinə şərait yaratmalıdır.

Standart iki mühüm komponentdən ibarət olur :

1) Məzmun (bilik)
2) Fəaliyyət (bacarıq)

Standartlarda təlim ediləcək məzmun ifadə olunur və bacarığın xüsusiyyəti göstə-

rilir, yəni nəyin öyrədiləcəyi və öyrədilənlərin necə nümayiş etdiriləcəyi aydın təsvir edilir. Hər bir standart alt standarta bölünür. Burada mürəkkəb fikirlər daha sadə fikirlərə bölünür, təlim məqsədinin müəyyən olunması üçün zəmin olan komponentlər əks olunur. Sinifdən-sinfə keçdikdə alt standartlar dəyişir. Məsələn: I sinif üçün riyaziyyat və onun alt standartlarına baxaq:

2.1. Ədədi və dəyişənli ifadələr haqqında təsəvvürü olduğunu nümayiş etdirir.

2.1.1. Sadə ədədi ifadələri oxuyur və yazır.

2.1.2. Sadə ədədi ifadələrin qiymətini hesablayır.

Bu nümunədə bilik kateqoriyalarının (deklorativ, prosedural, kontekstual) hər üçü alt standartlarda öz əksini tapmışdır.

1. Deklorativ-alt standartlarda şagird sadə ifadələri oxuyub informasiyanı əldə edir.

2. Prosedural-malik olduğu informasiyanı xatırladığını hər hansı yolla nümayiş etdirir.

3. Kontekstual-alt standartlarında şagirddən gözlənilən nəticə ədədi ifadənin qiymətinin hesablanmasıdır. Bunun üçün şagird müəyyən prosedur biliklərə malik olmalıdır. O, ədədi ifadələri toplayarkən doğru cavab almaq üçün əvvəl toplama və çıxmanın ən əlverişli yollarını bilməlidir. Məzmun standartında fəaliyyət idraki, emosional və psixomotor taksonomiyanın köməyi ilə sistemləşdirilir. Riyaziyyat dərslərində əsas fəaliyyət idraki fəaliyyət olduğundan standartlar tərtib olunarkən idraki taksonomiya əsas götürülmüşdür. Standartlar bacarıqların ifadə edilməsində çox mühüm göstəricidir. Standartlar bacarığın xüsusiyyətinin müəyyənləşdirilməsində biz müəllimlərə öz fəaliyyətimizi düzgün təşkil etməkdə yardımçı vasitədir. Onun əsasında təlimin təşkili və şagird nailiyyətlərinin qiymətləndirilməsi ilə bağlı bütün mühüm məlumatlar əldə edilir.

Məzmun standartlarının mahiyyətinə məzmun və fəaliyyət xətləri daxildir.

Məzmun xətti–fənn üzrə ümumi təlim nəticələrinin reallaşdırılmasını təmin etmək üçün müəyyən edilmiş məzmunun zəruri hissəsidir.

Məzmun standartları müəyyənləşdirilərək fəaliyyət istiqaməti ilə əlaqəliliyi nəzərə alıram. Məsələn: ana dili məzmun xətti şagirdlərdə danışanın fikrini dinləyib-anlamaq və buna münasibət bildirmək bacarığını formalaşdırır. Bununla yanaşı, dil duyumunun inkişafını, əlifbanın öyrənilməsini, düzgün, sürətli və şüurlu oxu üzrə bacarıqların formalaşdırılmasını, Azərbaycan xalqının dili, tarixi, mədəniyyəti və incəsənəti, adət-ənənələri haqqında ilkin təsəvvürlərin yaradılmasını təmin edir. Bütün bunların dərk olunaraq fərqləndirilməsini və təcrübəmdə tətbiqini təmin edirəm. Oxu prosesində qazanılan bacarıqları yazı ünsiyyəti vasitəsilə genişləndirərək qarşılıqlı əlaqəyə çevirirəm. Mühakiməli xarakterli mətnlər qurulmasını təmin edirəm. Bütün bu vərdişlər oxu və yazı qabiliyyətinin, rabitəli nitq inkişafının, ümumiyyətlə, kommunikativ mədəniyyətin formalaşmasında şagirdin fəaliyyətini məzmun xətti və standartlar təşkil edir. Ona görə də təlim standartlarını həmişə əsas götürürəm.

I sinfin “Azərbaycan dili” dərsliyinin 112-ci səhifəsindəki Ç. Məmmədovun “Cücə və tülkü” mətninin öyrədilməsi zamanı standartların necə reallaşmasına nəzər yetirək.

Motivasiya:

Toyuq-cücənin, ev quşlarının düşməni nədir?

“Tülkü həccə gedir” cizgi filmindən bir fraqment göstərirəm.

Şagirdlər tülkünün hiyləgərliyindən, toyuq-cücəni necə aldadıb tutmasından, onların düşməni olmasından danışırlar.

Mətni aydın, ifadəli, intonasiya ilə

oxuyuram.

St.2.2.1. (Kiçikhəcmli mətnləri düzgün tələffüz etməklə oxuyur)- Mətn hissə-hissə şagirdlər tərəfindən oxunur.

Sual: Mətn nəzm və nəsrlə yazılmışdır?

St.2.2.2. (Müxtəlif bədii mətnləri (nəzm, nəsr) fərqləndirir–şeirin əsas struktur elementlərini bənd, misra, qafiyəli sözləri göstərərək mətnin nəzmlə yazıldığını deyirlər.

St.2.2.5. (Mətnin məzmununu nəql edir)

Şagirdlər şeiri nəsrə çevirib nəql edirlər.

St. 1.2.3. (Nitqi müvafiq mimika və jestlərlə müşayiət edir) - Mətn üç şagird tərəfindən (aparıcı, tülkü, cücə) səhnələşdirilir. Tülkü və cücə rolunu ifa edən şagirdlər jest və mimikalardan yerində istifadə etməklə tamaşanı nümayiş etdirirlər.

St.2.2.4. (Mətndəki əsas fikri müəyyənləşdirir və sadə formada ifadə edir)- Cücə ağılla fikirləşib hiyləgər tülküyə qalib gələ bildi.

St.2.1.1. (Mətndə rast gəldiyi yeni əşya və hadisələri adlandırır)–xırpaladı-qamazladı, tutdu.

St. 2.1.3. (Mətndə öyrəndiyi yaxınmənalı sözləri cümlədə işlədir) - Əli qapıya vurulan topu cəld tutdu.

St. 3.1.2. (Əl yazısı şəklində olan sözləri və kiçikhəcmli mətnləri üzündən köçürür)–Şagirdlər əl yazısı ilə verilmiş mətni üzündən köçürürlər.

“Cücələrim” mahnısını oxutmaq.

Tapşırıq: Mətndən sual cümləsini tapıb, nəqli və ya əmr cümləsinə çevirin.

Qiymətləndirmə.

Təhsil–öyrənən və öyrədənin qarşılıqlı pedaqoji işinin nəticəsidir. Biz ibtidai sinif müəllimləri pedaqoji elmi nə qədər dərindən mənimsəsək, Milli Kurikulum fənlərinin tədrisində bir o qədər yüksək nəticə əldə edə bilərik.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında ümumi təhsil sistemində qiymətləndirmə konsepsiyası (Azərbaycan müəllimi, 6 fevral, 2009).

2. Kərimov Y. Təlim metodları. Bakı: RS Poliqraf, 2010.

3. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı, 2008.

4. Ümumtəhsil pilləsinin dövlət standartları (kurikulumları). / Azərbaycan məktəbi, 2011, № 6,

**Р.Бабаева**

**Из опыта обучения стандартов в учебном процессе**

**Резюме**

В статье говорится об учитывании в обучении стандартов интерактивного метода, основанного на логику. Отмечается, что решение проблемы характеризуется обучением содержательных линий и стандартов.

Выдвигается мысль о роли образования в таких важных задачах, как формирование гражданина и подготовке молодого поколения к жизни.

**R.Babayeva**

**From the practice of teaching standards**

**Summary**

In the article is spoken about the results of interactive teaching which is based on logic. It is noted that solving problem within the lesson is characterized by the standards. The role of education for making good citizens is noted. At the same time the information is given about two important components of education.

***Pedaqogika***

# YENİ İNSAN VƏ MÜASİR TƏHSİLİN PROBLEMLƏRİ

**Humeyir Əhmədov**
***pedaqogika üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *qloballaşma, modernləşdirmə, paradiqma, müqavimət, təhsil islahatı, innovasiya.*

***Ключевые слова:*** *глобализация, модернизация, парадигмы, сопративления, реформа образования, инновация.*

***Key words:*** *to globalise, to modernize, paradigm, opposition, educational reforms, innovation.*

Yeni insan və müasir təhsil problemləri pedaqoji elmi məşğul edən problemli məsələlərdəndir. Bəşəriyyət dəyişən iqtisadi, sosial-mədəni və siyasi dəyişikliklərin əhatəsində yaşayır. Nəticədə Yer kürəsində yaşayan bütün xalqların, millətlərin və ölkələrin inteqrasiyası qloballaşmanı zəruri amillərdən birinə çevirmişdir.

“Qlobal” sözü latın dilində “globe” – kürə anlamını verir. Müasir siyasi etimologiya “genişəhatəli”, “planetar” və s. kimi yozulur. Məsələn: qlobal ekoloji problem, qlobal iqlim dəyişməsi, qlobal ərzaq çatışmazlığı, qlobal təhlükəsizlik və s. Bu gün mədəniyyətlərin dialoqu, beynəlxalq sülh və təhlükəsizlik kimi anlayışlar da qloballaşmanın təzahürlərindəndir.

Dünyanın yeni coğrafi kəşfindən sonra ənənəvi cəmiyyətdən müasir cəmiyyətə makrokeçid prosesi baş verdi. Sosial mənada üç müxtəlif anlamı məlumdur:

Qərbi Avropa;

Şimali Amerika;

Müasir Avropa.

Qərbi Avropada protestant əmək etikası bazar iqtisadiyyatı liberal hüquq münasibətlərinin formalaşması zəminində meydana gəldi. Bu proses bir neçə əsr çəkdi: ənənəvi cəmiyyətdən (sənayeyə qədərki) XIX əsrin birinci yarısındakı, sənaye inqilabınadək ingilis inqilabı (1640-1642-ci illər), Amerika inqilabı (1776-ci il) və böyük Fransa inqilabı (1789-cu il) XVI-XVIII əsrlərdə baş verən bu hadisələr Qərbi Avropada modernləşmə makroprosesini sürətləndirdi. Həmin vəziyyət belə xarakterizə olunur:

1. Manifaktura və ya erkən sənaye dövründə modernləşmə (XVI, XVII əsrin ortaları).

2. Sənayenin inkişafı dövründə modernləşmə (XVII əsrin sonu, XIX əsr).

3. Erkən sənayeləşmə dövründən sonrakı modernləşmə, ictimai cəmiyyətin yaranması (XX əsrin birinci yarısı).

4. İri sənayeləşmədən sonrakı dövrdə modernləşmə (XX əsrin ortalarından bu günədək).

Modernləşmə dedikdə müasir dövrün tələblərinə uyğunlaşmaq, yeni tələb və normalara, texnoloji proseslərə uyğunlaşmaq kimi başa düşülür. Artıq XIV əsrdən

etibarən dünyada Qərbi Avropanın siyasi və intellektual təsiri hiss olunmağa başladı. XIX əsrin ikinci yarısı, XX əsrin birinci yarısında imperiyaların müstəmləkəçilik siyasəti həyata keçirilirdi. Burada qeyd edə bilərik ki, Qərbə yaxınlaşmaya dair I Pyotrun islahatları, Yaponiyada Meydzin inqilabı, Türkiyədə M. K. Atatürkün islahatları, Latın Amerikası və Fars körfəzində ərəb ölkələrinin xammal bazası əsasında qərbləşmə, SSRİ-nin sənayeləşməsi, avtoritar rejimlərdə və XX əsrin 50-90-cı illərində Cənub-Şərqi Asiya ölkələrində modernləşmə və s. Yaponiya, Koreya və Çinin öz milli xüsusiyyətlərini saxlamaqla müasirləşmə prosesində aktiv iştirak edirlər. Bəzi alimlərin fikrincə, dünyada gedən modernləşməni iki qrup ölkələrə şamil etmək olar: "isti" və "soyuq"(avtoritar və demokratik) ölkələrə.

Qloballaşma insanlarda təfəkkürün yeni reallıqlara uyğunlaşmasını önə çəkir, əhatəli informasiyanı qiymətləndirərək çevik qərar qəbul edən, dövlətin bir sıra vacib sahələrinin perspektivini proqnozlaşdıra bilən yeni nəsil kadrların hazırlanmasının vacibliyini gündəmə gətirir. Bu şəraitdə ali təhsil sistemi xüsusi funksiya yerinə yetirir. Çünki təhsil siyasəti elə şəkildə yenidən qurulmalıdır ki, informasiya-texnoloji, texniki, mədəni sahələrdə innovasiya proseslərinin genişlənməsi şəraitində düzgün istiqamət götürmək qabiliyyətinə malik mütəxəssislər hazırlana bilsin.

Qloballaşmanın dinamikliyini artıran və ona yeni çalar verən əsas amil informasiya texnologiyalarının güclü inkişafıdır. Ümummilli lider Heydər Əliyev hələ ötən əsrin 70-ci illərində informasiya texnologiyalarının inkişafının insan həyatında mühüm dəyişikliklərə səbəb olacağını hiss edərək bu sahəyə xüsusi diqqət yetirmiş və bugünkü inkişafın təməlini qoymuşdur. Heydər Əliyevin təbirincə, dövlət müstəqilliyinin xalqımıza bəxş etdiyi nemətlərdən biri də təhsil sistemimizin xalqımızın, millətimizin tarixinə, mənəviyyatına, ənənələrinə uyğun qurulmasıdır. Doğrudur, bu proses çox mürəkkəbdir. Ona görə də, qarşıya bir vəzifə kimi qoyulmuşdur ki, təhsil işçiləri tezliklə təhsil sistemində işlərin müstəqil Azərbaycanın prinsipləri əsasında qurulmasına nail olsunlar (1).

XXI əsrin ilk illərində siyasi və iqtisadi sahələrdə Azərbaycanın potensialının güclənməsi əhalinin rifahının yüksəlməsinin əsas şərtlərindən biri oldu. Qloballaşmaya istiqamət götürən müasir dövlətlər qarşısında duran vəzifə beynəlxalq rəqabətə uyğunlaşmaq bacarığı, ölkənin uğurlu və davamlı inkişafı mühüm əhəmiyyət kəsb edir. Yüksək səviyyədə inkişaf etmiş ölkələrin rəqabət üstünlüyü başlıca olaraq yüksək təhsil amili ilə müəyyənləşən insan potensialının inkişafı ilə bağlıdır. İndiki zamanda ölkəmizin iqtisadi inkişafının təminatı məhz bu sahə ilə əlaqəlidir. Hazırda ölkəmizdə bütün sahələrdə olduğu kimi, təhsil sahəsində də sürətli dəyişikliklər baş verir. Lakin hələ həll olunmalı bir sıra problemlər qalmaqdadır. Onların aradan qaldırılması yollarını əvvəlcədən müəyyənləşdirmək çətindir. Çünki əldə olunan yeni biliklər sürətli dəyişikliklər baxımından tez bir zamanda əhəmiyyətini itirir və təhsilin paradiqması ona uyğun olaraq dəyişilir. Məhz bu amilə əsasən insanların əldə etdiyi ali təhsil bilikləri də yeniləşir. Aktual məsələlərdən biri də indiki dövrdə universitetlərdə innovativ ideyaların tətbiqi və beynəlxalq rəqabətə davamlılıq yaratmaqdır. Bunu nəzərə alan dövlətimiz, dünyanın bir çox nüfuzlu ölkələrində olduğu kimi, ali təhsil sahəsinə də diqqəti daim artırır.

1999-cu ildə Heydər Əliyev tərəfindən təsdiq edilmiş "Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı", Azərbaycanın vahid Avropa təhsil məkanına daxil olması bir tərəfdən tədris-təhsil modellərinin

müasir tələblərə uyğunlaşdırılması, digər tərəfdən isə formalaşmış təhsil sisteminin etik-mədəni özünəməxsusluğunun qorunması kimi zərurəti irəli sürdü.

III minilliyin əvvəllərində planetin ictimai-siyasi, iqtisadi, elmi və mədəni həyatının müxtəlif sahələrində yaranmış situasiyanın ciddi təhlili dövrün əsas məzmununu təşkil edən qloballaşma kontekstində aparılır. Söhbət artıq sosial mövcudluğun ənənəvi milli dövlət qurumları çərçivələrinə sığmayan yeni keyfiyyətindən gedir.

Təhsilə yönəldilən dövlət vəsaitinin ilbəil artması Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin təhsili dövlət siyasətinin əsas prioritetlərindən biri hesab etməsi ilə birbaşa bağlıdır. “Təhsil əsri” elan edilən XXI əsrdə yüksək intellektə malik insan kapitalının formalaşması və güclü iqtisadiyyatın qurulmasında onun rolu heç vaxt indiki qədər aktual olmamışdır. Prezident İlham Əliyev bununla bağlı deyir: “Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik”(1).

Ulu öndər Heydər Əliyevin təhsil siyasətini uğurla həyata keçirən Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev cənablarının diqqət və qayğısı sayəsində hazırda təhsil sistemində əsaslı islahatlar həyata keçirilir, müxtəlif problemlər üzrə 16 Dövlət Proqramı yerinə yetirilir. Bunlardan “Azərbaycan Respublikasının ali təhsil müəssisələrinin Avropa ali təhsil məkanına inteqrasiyası”, “2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı”, “Təhsil sisteminin informasiyalaşdırılması Proqramı (2008-2012-ci illər”, “Elmin inkişafı üzrə Milli strategiyanın həyata keçirilməsi ilə bağlı Dövlət Proqramı (2009-2015-ci illər)” xüsusi yer tutur. Təhsil sisteminin bütün sahələrində vəziyyətin təhlili, mühüm faktorların nəzərə alınması qloballaşma proseslərinin intensivləşdiyi şəraitdə Azərbaycanın ali təhsil sisteminin modernləşdirilməsinə əsas oldu (1).

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev demişdir: “Qloballaşma təbii prosesdir və yəqin ki, bu proses müəyyən düzəlişlərlə davam edəcəkdir. Xüsusilə belə olan halda milli dəyərlərə önəm vermək, gənc nəsli milli dəyərlər əsasında tərbiyə etmək xüsusi əhəmiyyət daşıyır. Mən çox şadam ki, Azərbaycanda milli ənənələr güclənir, möhkəmlənir və bu prosesləri daha da sürətləndirmək üçün kompleks tədbirlər görülməlidir. Əlbəttə, təhsil bu işlərdə ən prioritet məsələdir”(1).

Son illərdə Azərbaycan Respublikasında aparılan sosial siyasət bir daha bunu təsdiq edir ki, yaxın zamanlarda müəllimlərimizin sosial vəziyyəti digər qabaqcıl ölkələrdəki həmkarların durumu ilə bərabərləşəcəkdir. Ölkəmizin dinamik inkişaf edən iqtisadi potensialı bunu həyata keçirməyə real zəmin yaradır. Son illərdə hökumətimiz tərəfindən pedaqoji işçilərin əmək haqqlarının sistemli və mütəmadi şəkildə artırılması dediklərimizi təsdiq edir.

Akademik R.Ə. Mehdiyev “İctimai və humanitar elmlər: zaman kontekstində baxış” məqaləsində yazır: “Qloballaşma, informasiya texnologiyaları, internetin hökmranlığı əsrində dövlətlərdə ictimai-siyasi və humanitar sahələrdə islahatların fəlsəfəsini, cəmiyyətdə rolunu və statusunu köklü surətdə dəyişmiş, bu sahədə potensial artıq strateji resursa çevrilmişdir”(3). Təhsilin modernləşdirilməsi milli ənənələr kontekstində müstəqil düşüncə predmeti idisə, yeni mərhələdə islahatların parametrləri müəyyən dərəcədə Avropa təhsil sistemi tərəfindən müəyyən olunur. Azərbaycanın SSRİ tərkibinə daxil olduğu dövrdə yaranmış elmi-intellektual, maddi-texniki potensialın inventarlaşdırılması, təhsil sisteminin modernləşdirilməsində optimal strategiyanın seçil-

məsinə imkan verdi (1).

Ali təhsilin modernləşdirilməsinin əsas məqsədi ölkənin ali təhsilinin Avropa təhsil məkanına inteqrasiyası, onun məzmununun Boloniya prosesinin prinsiplərinə uyğun qurulması, cəlbediciliyin və rəqabət qabiliyyətinin təmin edilməsi, ölkə iqtisadiyyatının inkişaf tələblərinə uyğun ali təhsilli kadrlara yaranan tələbatın ödənilməsi, habelə informasiya cəmiyyətinin və müasir biliklərə əsaslanan iqtisadiyyatın tələblərinə uyğun olaraq kadr potensialının yaradılması, əhalinin müasir tələblərə cavab verən ali təhsil almaq imkanlarının təmin edilməsi üçün iqtisadi və sosial baxımdan səmərəli ali təhsil sisteminin formalaşdırılmasıdır. Müasir təhsilin modernləşdirilməsi vacibdir. Biz bunu gündəlik işimizdə görürük və hiss edirik. Amma nə qədər ki, cəmiyyətdə hər şeyin "maddi dəyərləndirilməsi" sindromu mövcuddur, şagirdlərin şüurunda dönüş yaratmaq çətin olacaqdır.

Modernləşdirmənin üç əsas məhfum üzərində aparıldığını qeyd edək: Cəmiyyət, ictimai şüur və iqtisadiyyat. Əgər bu sahələrdə modernləşmə baş verməsə, onda bütün aparılan işlər hədər zəhmətdən savayı bir şey deyildir. Sevindirici haldır ki, hökumət və cəmiyyət belə dəyişikliklərin lazım olmasını diqqət mərkəzində saxlayır. Lakin orta təhsili modernləşdirməmiş ali təhsildə aparılan islahatlar varislik, ardıcıllıq baxımından fayda verməz.

Bir qədər məktəb təhsilinin mövcud vəziyyətinə nəzər salaq. İdeal didaktikaya hələ nail ola bilməmişik. Şagird özü biliklərə elə can atır ki, onun qarşısında heç bir maneə davam gətirə bilmir. Hətta adi bəhanə olan "işıqlar sönsə" belə, o, mütləq şam işığında oxuyacaqdır.

İdeal idarəçiliyi belə formalaşdırmaq olar: idarəçiliyin funksiyaları yerinə yetirilir. Hər kəs bilir ki, nə etməlidir və hər kəs öz işini görür, çünki özü bunu istəyir.

Alimlərin bir qismi belə hesab edir ki, müəllimlərimizin bir qrupu öz vəzifələrinin öhdəsindən layiqincə gələrək, cəmiyyətdə hörmət və ehtiram qazanaraq, işlərində peşəkardırlar. Digər qrup isə indiki təhsil sistemini tənqid etməklə kifayətlənirlər.

Gəlin, bəzi fundamental problemlərə nəzər salaq:

• İnformasiyanın əsas etibarilə müəllimin monoloqu şəklində çatdırılması üsulu köhnəlmişdir;

• sinif-dərs sistemi dinamik inkişafda olan dünyanın tələblərindən geri qalır;

• şagirdlərin məktəbdə təhsil almaq motivasiyası, müəllimlərin isə öz işinə marağı lazımi səviyyədə deyildir.

Ümumtəhsil məktəblərinin fəaliyyətini məzunların ali məkəblərə qəbuluna görə qiymətləndirilməsi prinsipi düz deyil. Nəzərə alsaq ki, hər il təxminən 100 min şagird ümumtəhsil müəssisələrini bitirir, ali məktəblərə plan yeri isə bunun dörddə biridir.

Danılmaz faktdır ki, test üsulu ilə qəbul cəmiyyətdə ali məktəblərə təmənnasız qəbul aparılması inamını birmənalı şəkildə təsdiqlədi. Nəzərə almalıyıq ki, orta məktəbin vəzifəsi vətəndaş yetirməkdən ibarət olmaqla, onlara digər pillələrdə təhsillərini davam etdirmək imkanı yaradır. Avropa Birliyinə daxil olan ölkələrdə məqsəd əhalinin 60%-nin ali təhsilli olmasıdır. Qloballaşan dünya bunu tələb edir. Elm və texnika elə sürətlə inkişaf edir ki, artıq orta təhsilli insan çətinliklərlə üzləşməli olur.

Bu mənada köhnə təhsil sistemini dirçəltmək cəhdlərinin heç bir mənası yoxdur. "Ən yaxşı nümunələri kor-koranə şəkildə təkrarlamağa" da lüzum yoxdur! Təhsil böhranı, xüsusən orta məktəb təhsili böhranı inkişaf etmiş bütün ölkələrdə təzahür edir. Üstəlik, istənilən surət həmişə orijinaldan pisdir.

Yaxşı təhsil almış adam bir qayda olaraq həyatda daha uğurlu olur. Bu tezisi

çox az sayda adam inkar edə bilər. Lakin başqa bir deyim: “ziyalı cəmiyyət daha uğurludur” tezisi min dəfə tutarlı və dürüstdür. O, daha çox ixtira edir, daha yaxşı tətbiq edir, insanlarla dil tapmağı, ünsiyyət qurmağı və paylaşmağı bacarır..., uğurlu olmağın konkret amilləri həddən artıq çoxdur.

“Yüksək əyarlı” gələcəyə yalnız o ölkələr nail olacaqlar ki, həmin dövlətin və ictimai təsisatların birgə səyləri təhsilə yeni yanaşmanın formalaşmasına gətirib çıxaracaq.

Hər bir yeni dəyişiklik müqavimət qüvvəsi ilə rastlaşır, toqquşur. Hazırda kurikulum islahatı həyata keçirilir, burada da müəyyən problemlər var. Kurikulum islahatı cəmiyyətdə birmənalı qarşılanmadı. Belə ki, hamı möcüzə gözləyir, ancaq prosesin iştirakçısı olmaq lazımdır. Burada obyektiv və subyektiv amillər özünu büruzə verir. Həm müəllimlər, həm də valideynlər islahatlara hazır olduqlarını nümayiş etdirməlidirlər. Yalnız o zaman uğur qazanmaq olar. İslahatın məqsədi təlim yükünün azaldılmasına və nəticəyönümlüyə istiqamətlənmişdir. Dəyişmə və müqavimətin vəhdəti qanunu sosial sistemlər dəyişdikdə tamamilə aşkar şəkildə təzahür edir. Məsələn, Le Şatelye prinsipinin təbiətdə təzahürü, mexanikada Nyutonun üçüncü qanunu, elektrodinamikada Lorens qanunu və s. Enerjinin saxlanması qanunu ilə müqayisədə bu formulda ümumiləşdirmə gücü daha çoxdur. Hətta vaxtı çoxdan çatmış və mütərəqqiliyi göz qabağında olan sosial islahatlar da müqavimətlə qarşılaşır. Rusiyada təhkimçilik hüququnun ləğv edilməsi, vətəndaş cəmiyyətinin yaradılması üçün atılan addımlar və s. buna parlaq misaldır.

İslahatlar insan maraqlarına və müqavimətinə zor gücünə üstün gəlmək yolu ilə yeridilirsə, onda “xəstəlikdən betər dərman” əldə olunur. Məqsəd və vəsaitin olduğu, lakin müqavimətin, əks-təsirin, qarşı hərəkətin nəzərə alınmadığı planların heç bir qiyməti yoxdur. Bax, problemləri bir-birinə zidd olan tələbləri eyni bir formulda cəmləməyə imkan verən ziddiyyətlər formasında təsvir etmək buna görə faydalıdır. Dəyişmə və müqavimətin vəhdəti qanunu ziddiyyətlər formulunda gizlənir.

Uşaqlarda istedad, maraq dairəsi, bu və ya digər qabiliyyətin və marağın nə zaman üzə çıxacağı, ən yaxşı qavrama kanalları və yaddaş baxımından çox müxtəlifdirlər. Təhsildə uşağın fərdi qabiliyyət və maraqlarının həlledici dərəcədə nəzərə alınması tələb olunur. Onda motivasiya probleminin həlli, tədrisə qarşı müqavimətin olmaması, tamamilə fərqli tədris dinamikası ortaya çıxır. Lakin eyni zamanda müəyyən təhsil standartlarını, mədəniyyətin ümumiliyini qorumaq lazımdır. Yəni burada da ziddiyyət göz qabağındadır: insanlar mədəniyyətin daşıyıcıları kimi müxtəlifdirlər, mədəniyyət isə ümumidir. Ona görə də, təhsil sisteminin yeni paradiqması bu ziddiyyəti aradan qaldırmalıdır. Mədəniyyət standartlarını əldən verməmək şərti ilə tədrisin dinamizmi, forma müxtəlifliyi və mahiyyəti vəhdət halına gətirilməlidir. Təhsil müəssisələrinin müxtəlif formaları, təlim texnologiyaları, fənnə müxtəlif dərəcədə yiyələnməyi nəzərdə tutan külli miqdarda fənn seçimi imkanları və standart tələblər, “qızıl bilik fondu” çərçivəsində imtahanlar keçirilməlidir.

Bu gün müəllimin əsas funksiyası biliyin mənbəyi, daha dəqiq desək, biliyin carçısı, ikinci əsas funksiyası biliyin nəzarətçisi olmaqdır. Hər iki funksiya səmərəli yerinə yetirilməlidir. Yaxşı seçilmiş elmi-populyar film, məsələn, dərin sularda üzən balıqlar haqqında film məktəb müəllimlərinə nisbətən daha canlı, əyani və maraqlı söhbət açır. Eyni sözləri, əslində, bütün dərs mövzuları haqqında demək olar. Bütün dərs mövzularını əhatə edən filmlərdən ibarət kitabxanaya sahib olmaq da bu qəbildəndir. Üstəgəl ən yaxşı müəllim və şagirdlərin video və audio-

mühazirələri, üstəgəl dərs mövzuları ilə bağlı müzakirələrin getdiyi, biliyi yoxlama sistemli ixtisaslaşdırılmış saytlar və internet-portallar və bütün bu sadalanan funksiyaları müəllimin üzərindən götürüb onun yükünü xeyli azaltmaq olar. Yeni təhsil sistemində müəllim bilik yolunun mühəndisinə, fərdi təhsil trayektoriyası üzrə məsləhətçiyə çevrilir. Mövcud şagird – müəllim münasibətindəki nisbəti nəzərə alsaq, belə məsləhətçilər standart təhsil sahəsindəki müəllimlərlə müqayisədə xeyli dərəcədə az tələb olunur.

Biliklərin hər bir vətəndaş üçün məcburi olan minimum standartları hazırlanmalıdır. Məsələn, hansı sürətlə yazıb-oxumalı, "ədəbiyyatın qızıl fondundan" nə qədər, dövlətin, xalqın, dünyanın tarixindən nə qədər məlumatlı olmalı... Həmin bu biliklərə nəzarət vasitəsi yaradılmalıdır. Biliyin zahiri motivləri yaradılmalı, yüksəksəviyyəli təhsil dəbə salınmalıdır. Doğrudur, bu sahədə müəyyən işlər görülməyə başlanıb. Lakin bu, çox cüzidir. Bunun üçün zəruri olan bütün vasitələrimiz, ilk növbədə televiziya vardır. Daha yüksək standartlar, o cümlədən peşəkar standartlar sahə institutları, peşəkar özünütənzimləyən təşkilatlar tərəfindən yaradılır. Bu işi onlardan yaxşı heç kəs edə bilməz. Hər bir səviyyənin özünün bilik və bacarıq standartları olmalıdır. Şagird ali məktəbə oxumağa gələndə artıq bir xeyli imtahan vermək təcrübəsi olur (yaxud əlavə fənlərə, keçdiyi kurslara imtahansız buraxılır). Məsələn: instrumental səviyyədə tətbiqi riyaziyyat, fizika, kimya, texnika, milli ədəbiyyat, ölkə tarixi, yaradıcılıq səviyyəsində xüsusi "elektrodinamika", "yüksək enerjilər fizikası", tanışlıq səviyyəsində xüsusi dilçilik və şeir üslubu kursları. İdeal təhsil sisteminin həyata keçirilməsinin şərti inkişaf etmiş innovasiya iqtisadiyyatıdır ki, bu da eyni dərəcədə innovasiyalı olan təhsil sistemindən nəticələr tələb edəcəkdir. İnnovasiya iqtisadiyyatında peşəkar cəmiyyətlər tərəfindən təhsil sisteminə pul yatırılması hazırda reklam çarxlarına vəsait yatırılması qədər təbii və sərfəli vasitəyə çevrilir. Təhsilə yönələn ümumi vəsait axınına dövlət, sahə institutları, peşəkar özünütənzimləyən təşkilatlar və xeyriyyə fondları şərait yaradır, valideynlər də imkan daxilində öz istəyi ilə bu işə qoşulurlar.

Ədalət naminə qeyd edək ki, təhsil sistemində yeniliklər innovasiya iqtisadiyyatının təşəkkülünun nəticəsi kimi avtomatik surətdə peyda olmur. Əksinə, innovasiya iqtisadiyyatının təşəkkülü layihələndirmə və onunla bağlı müvafiq təhsil sisteminin təşəkkülü olmadan mümkün deyildir. Təhsil və iqtisadiyyat bir çox baxımdan bir-birini qarşılıqlı surətdə tamamlayır.

Təhsil sistemi özlüyündə mürəkkəb məhsuldur, üstəlik, başqa mürəkkəb ictimai sistemlərlə - iqtisadiyyat, siyasət və sairlərlə sıx surətdə bağlıdır. Buna baxmayaraq, insanların yaratdıqları digər sistemlər kimi o da, ola bilsin, mühəndis təhlilinə, proqnozuna və sintezinə meyillidir. Metodiki vəsaitlərə nəzər saldıqda görünür ki, ali təhsil müəllimlərinin hazırlığına da fikir verilməlidir. Mənim prinsipim belədir: çox bilmək lazım deyil, əsas olanı öyrənmək lazımdır. Məsələn, Pifaqor teoremini, qiymətli kağızlar bazarını öyrənməyə ehtiyac yoxdur, məktəblilərin həndəsi silsiləni bilməsi kifayətdir. Çox vaxt müəllim biliyin təkrarlayıcısı və nəzarətçisi kimi çıxış edir. Öz təcrübəmdə, demək olar ki, hər dərsdə mövzu ilə bağlı videoçarx və ya film nümayiş etdirirəm.

Ali təhsil səviyyəsində qiyabi təhsildə vəziyyət daha çətindir. Belə ki, tələbələr sərbəst şəkildə tapşırıqları yerinə yetirə bilmir, çətinlik çəkirlər. Bu, iqtisadiyyatda aşağısəviyyəli mütəxəssislərin yaranmasına səbəb olur. Məsələnin kökündə valideynlərin mövqeyi durur. Onlar öz uşaqlarına nəzarət etməyi və onları yüksək keyfiyyətli

təhsili almağa yönləndirə bilmirlər. Belə bir problem də var: şəhər və vilayət səviyyəli elmi-praktik konfranslarda şagirdlərin işləri heç də həmişə obyektiv qiymətləndirilmir. Bu da istedadlı uşaqların eksperimental və tədqiqi işlərə həvəsini azaldır. İnanmaq istərdim ki, təhsilin müasirləşdirilməsi müsbət nəticə verəcək və əksinə, daha da dalana dirənməyəcək.

Təhsil sistemində müasir dünyanı, yeni tələbləri və çağırışları üzə çıxarmaq, sabahın və o birigünün tələblərini hiss etmək, duymaq və qiymətləndirmək lazımdır. Cəmiyyətin inkişaf səviyyəsi bir sıra iqtisadi, siyasi, hüquqi, mənəvi-əxlaqi meyarlarla ölçülsə də gələcəyimiz tələb edir ki, bu meyarlar içərisində müəllimin nüfuzu əsas meyar olsun, müəllim sözü müqəddəs sayılsın. Lazımi nəticələrə nail olmaq və müqavimət gücünü müəyyənləşdirmək üçün resurslar dəyərləndirilməli, təsadüfi olan kəsilib atılmalı, strategiya və meyarlar, inkişaf planı hazırlanmalı və təhsilimizin yolu konkret müəyyənləşdirilməlidir.

Elm və təhsil festivalları, uşaqlar üçün təcrübələr nümayiş olunan müxtəlif sərgilər uşaqların, adətən isə təhsil haqqında geniş təsəvvürü olmayan valideynlərin (hansı ixtisas üzrə təhsil barədə) görüş dairəsini genişləndirir. Cəmiyyətdə savadlı insanlara, yüksəkixtisaslı mütəxəssislərə tələb artdıqca, bu məsələnin də öz həllini lazımi qaydasında tapacağına ümid və inam öz yerini tutacaqdır.

*Rəyçi: prof. Ə.Ağayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan müəllimlərinin qurultayları (I-XII). Bakı: Çaşıoğlu, 2008, s.385

2. Əhmədov H. Azərbaycan təhsilinin inkişaf strategiyası. Bakı: Elm, 2010, s.800

3. Гин А. Семь противоречий нового образования // Народное образование. 2004. № 8. С. 51.

4. Березина В., Викентьев И., Модестов С. Детство творческой личности: Встреча с чудом. Наставники. Достойная цель. СПб.: Изд-во Буковского, 1995.

**Г.Ахмедов**

**Новый человек и проблемы современного образования**

**Резюме**

Модернизация современного образования необходима, мы видим и ощущаем это в своей ежедневной работе. Необходимо мотивировать родителей, ведь многие не особо заинтересованы в широком образовании своих детей. В настоящее время радует то, что государство и общество пришло к осознанию необходимости таких перемен.

**H.Ahmadov**

**New personality and problems of modern education**

**Summary**

In the article it is spoken about modernization and duties of education. Teachers mustn't be only facilitators but they must direct students to investigation. Parents don't understand their duties and reforms. Therefore parents must be motivated. Internet recourses should be used creatively.

It is also noted that innovations must be used to carry fundamental reforms.

# ДИДАКТОГЕНИЯ: НАУЧНЫЕ ИНТЕРПРЕТАЦИИ И ПЕДАГОГИЧЕСКИЕ АСПЕКТЫ

**Гейдар Джафаров**
***доцент АГПУ, доктор философии по педагогике***

***Əsas sözlər:*** *didaktogeniya, psixogeniya, valeologiya, şəxsiyyətyönümlü təhsil, təhsilin məzmununun təkmilləşdirilməsi, maddi təhsil nəzəriyyəsi, formal təhsil nəzəriyyəsi, intensiv, ekstensiv, elmdə monopoliya, mənəvi sağlamlıq, cismani sağlamlıq, pedaqoji zorakılıq.*

***Ключевые слова:*** *дидактогения, психогения, валеология, личностно-ориентированное образование, совершенствование содержания образования, теория материального образования, теория формального образования, интенсивный, экстенсивный, монополия в науке, духовное здоровье, физическое здоровье, педагогическое насилие.*

***Key words:*** *didactic genius , psychogenic, vale logy, education forming personality, perfection maintenance of education, material educational theory , formal education theory, intensive, extensive, monopoly at science, spiritual (moral) health, physical health, pedagogical violence.*

Понятие “дидактогения” впервые было введено в научный обиход (1937, 1946) украинским психологом Константином Ивановичем Платоновым (1877-1969). Чтобы внести ясность в само понятие, целесообразно обратиться к некоторым компетентным научным источникам, ибо по сей день в азербайджанской психолого-педагогической литературе оно не упоминалось. Следовательно, в частности, педагогические аспекты дидактогении остались вне научного поля зрения и не исследованы отечественными учеными. Поэтому главная цель в данной статье преимущественно заключается именно в том, чтобы привлечь внимание, в частности, молодых специалистов (магистрантов, диссертантов, докторантов) к проблемам дидактогении. Исследование и разработка педагогических проблем дидактогении в Азербайджанской республике, на наш взгляд, во многом способствовали бы устранению имеющихся в системе образования недостатков и как следствие улучшению и повышению качества учебно-воспитательного процесса, приведению их в соответствие с новыми современными требованиями европейских и мировых образовательных стандартов. По сути проблемы дидактогении вытекают из педагогических недостатков и представляют собой совокупность и результат психологических, педагогических и методических ошибок учебно-воспитательного процесса.

В научной литературе имеются различные подходы к значению и содержанию понятия “дидактогения”. Обратимся к некоторым из них.

Дидактогения – (от греч. didaktikos – научающий и gen:es – рождающий, рожденный), негативное психическое состояние учащихся, вызванное нарушением педагогического такта со стороны воспи-

тателя (учителя, наставника, тренера). Выражается в фрустрации, страхах, подавленном настроении и т.п. В основе Д. лежит психическая травма, полученная учеником по вине педагога. Д. нередко перерастает в невроз и в этом случае может потребовать специального лечения, в частности методами психотерапии. Для предотвращения возникновения Д. у учащихся педагог должен стремиться к максимальной тактичности в общении, учитывать возрастные и индивидуально-психологические особенности (2).

В большой энциклопедии по психиатрии дается следующая интерпретация: дидактогения (греч. didaktikos genesis - происхождение), означающий психотравмирующее детей и их родителей поведение педагога (систематически неуважительное, пренебрежительное, равнодушное отношение, прилюдное высмеивание, занижение способностей и оценок и т.п., а таже подчеркивание негативных сторон явлений, которые педагог при изложении учебного материала представляет учащимся). Важное значение приобретает ныне тенденция в политике образования, которую защищают власти и некоторые школьные учителя, - разделение школы на два потока: для детей элиты, избранных, материально обеспеченных родителей и для детей простых людей – риск дидактогении для последней категории детей существенно возрастает (3).

Дидактогения (греч. didasko - учить, genesis - происхождение). Разновидность психогении, при которой травмирующим психику учащихся фактором является поведение педагога. Это может проявиться в особенностях личностного контакта (неуважительное отношение к ученику, студенту, подавление его инициативы, прилюдное вышучивание его ответов) и в том, как преподносятся знания (подчеркивание отрицательных моментов того или иного явления, которым может столкнуться в своей жизни ученик, утверждение о недоступности для него изучаемого материала и т.д.). Важное значение имеют и особенности личности учащегося, его повышенная сензитивность, незрелость суждений, их несамостоятельность. (К.И.Платонов 1937, 1946).

В энциклопедическом словаре педагога дано следующее толкование: дидактогения (гр. – рождающийся от учения) – это негативное психическое состояние учащегося, ученическая боязнь учения, школы, учителя. Проявляется в подавленном настроении, страхе, испуге перед посещением школы, урока, перед контрольной работой, получением отметки и в других случаях школьной жизни. Дидактогения возникает по причине бестактности учителя, его дидактизма {гр. – поучительный: фетишизация научных рекомендаций, приемов и методов обучения. Это формальное соблюдение требований дидактики в процессе обучения и воспитания и требование от учеников единственно правильного поведения. Такой стиль отношений учителя и учащихся ведет к дегуманизации образования, денатурализации обучения и детской болезни дидактогении. Дидактизм приводит к потере интереса к учению, он противопоказан развивающему обучению и личностно ориентированным образовательным технологиям (10) (добавлено нами – Г.Д.)}, грубости, от непонимания ученика, неверия в его силы и возможности, которые передаются учащемуся. Есть случаи возникновения этой болезни от чрезмерно высоких требований к учебным успехам своих детей со стороны родителей. Дидактогения – результат слабой взаимной адаптации и дезадаптации ученика и учителя друг к другу. Этот ученический

страх может вызывать заболевание неврастенией, задержку психического развития ребенка. Дидактогения есть разновидность психогении, при которой травмирующим психику фактором является поведение педагога и методика его преподавания. Такое состояние иногда называют дидактофобией (5).

Дидактогения – вызванное нарушением педагогического такта со стороны воспитателя, педагога, тренера, руководителя и прочих, негативное психическое состояние учащегося (угнетенное состояние, страх и пр.), отрицательно сказывающееся на его деятельность и отношениях межличностных. Может быть причиной неврозов (6).

В словаре "Психология развития" дается следующее толкование: дидактогения (греч. didaktikos - поучительный +genos – род, происхождение) – негативное психологическое состояние учащегося, вызванное неправильными педагогическими действиями воспитателя (педагога, тренера, руководителя и т.д.). Дидактогения проявляется в угнетенном настроении, страхе, фрустрации и др., отрицательно сказывающихся на деятельности и межличностных отношениях ребенка. Она может являться причиной неврозов (7).

Дидактогения – негативное психическое состояние учащегося, вызванное нарушением педагогического такта со стороны учителя (воспитателя). Выражается в повышенном нервно-психическом напряжении, страхах, подавленном настроении и т.п. Отрицательно сказывается на деятельности учащихся, затрудняет общение. В основе возникновения дидактогении лежит психическая травма, полученная учеником по вине педагога. Эти объясняется близость симптоматики дидактогении и неврозов у детей, причем дидактогения нередко перерастает в неврозов, и в этом случае может возникнуть необходимость в специальном лечении, в частности методами психотерапии (8).

Дидактогения (греч. didaktikos - поучительный; genes - порождаемый) – психоэмоциональное напряжение учащегося, вызванное нарушением педагогического такта со стороны учителя (воспитателя, тренера), неадекватными требованиями и (или) неумеренным педагогическим воздействием с информационной перегрузкой. Д. усугубляет умственное утомление, накапливает его, приводя к переутомлению, нарушениям деятельности межличностных отношений, создавая предпосылки проявления неврозов. Д. может стать причиной школьных проблем у детей без отклонений в развитии познавательных функций (9).

Из сказанного вытекают следующие выводы. Во-первых, как видно из вышеприведенных толкований, объединяющим началом во всех случаях выступает нарушение педагогического такта со стороны субъектов воспитательного процесса, которое оказывает негативное влияние на психическое состояние учащихся. На наш взгляд, исходя из этого, нарушения в сфере межличностных отношений и общений именно в воспитательном процессе (бестактность, грубость, непонимание ученика, неуважительное отношение к нему, подавление инициативы, прилюдное вышучивание ответов ученика и т.д.), логично было бы назвать этот термин тактогенией, а нарушения педагога в обучении, в сфере дидактики (дидактизм, занижение оценок, утверждение о недоступности для ученика изучаемого материала, информационная перегрузка, нарушение норм домашних заданий, не соблюдение закономерностей и принципов обучения, дальнейшее совершенствование содержа-

ния системы образования без учета природных возможностей учащихся и т.д., то есть все то, что связано с учением, обучением) – дидактогенией. И не случайно, что в Древней Греции учителей называли именно “дидаскалами”. В современном турецком и русском языках это соответственно звучит как “юйрятмян” и “учитель”. Возможно, именно поэтому Катков Е.С. в качестве синонима этого понятия предложил (1938) термин дидаскогения. Вместе с тем, в соответствующей научной литературе де-факто этот термин именуется дидактогенией.

Во-вторых, не умаляя научно-педагогическое значение вышеприведенных толкований, считаем, что наиболее полная и всесторонняя интерпретация этого понятия дана в энциклопедическом словаре педагога {см. Безруков В.С. Основы духовной культуры (энциклопедический словарь педагога) 2000 г.} (4). В нижеприведенных источниках можно ознакомиться с другими альтернативными толкованиями термина.

В-третьих, на наш взгляд, в приведенных толкованиях не учтен двусторонний характер учебно-воспитательного и образовательного процессов (воспитатель-воспитанник, учитель-ученик, преподаватель-студент). Поэтому и во всех недостатках склоняется только педагогическая деятельность учителя. Однако, не умаляя допущенные учителями погрешности по объективным (в результате случайного выбора этой профессии) и субъективным (слабое знание педагогики, психологии и владение нюансами методики преподавания, воспитания и обучения и др.) причинам, приводящим к дидактогении, следует отметить и то, что нередки и случаи в учебно-воспитательном процессе, когда учителя становятся свидетелями неуважения, бестактности, неучтивости, а порою и грубости со стороны учащихся. Во многих случаях нарушение педагогического такта учителем, воспитателем происходит непосредственно по вине нерадивых учащихся, которые его подстрекают. Как это было в школе № 17 г. Сумгайыта, когда нескольким старшеклассникам “удалось” вывести из себя опытного учителя с 38-летним стажем педагогической деятельности до такой степени, что тот потерял психологическое равновесие, педагогическую бдительность и проявил рукоприкладство, за что был уволен с работы.

Примечателен в этом отношении и инцидент, который произошел летом 2011 года в Бакинской школе № 226 (посёлок Амирджаны) перед “последним звонком” на уроке классного руководителя. После завершения урока ученики начали танцевать в классе, на что учитель предложил продолжать репетицию в актовом зале. Но ученики не обращали внимания на предложения учителя. На видео, записанном посредством мобильного телефона, видно, как ученики начинают танцевать в классе, несмотря на замечания учителя, находящегося в этот момент в классе. Учитель, видя такое поведение учеников, пытается покинуть класс, но ученики преграждают дорогу, не дают выйти и приглашают присоединиться к танцам. В результате учитель вынужден отойти в сторону и наблюдать за происходящим.

Примеров тому множество. Именно поэтому к дидактогении следует отнести также негативные психологические, эмоциональные состояния и переживания учителя, возникающие в результате несоблюдения правил поведения и внутреннего распорядка учащимися. Высокая нервно-психологическая напряженность, подавленное настроение оказывают отрица-

тельное влияние на всю педагогическую, в частности, учебно-воспитательную деятельность учителя, затрудняют взаимопонимание, взаимное общение, в конечном итоге, и взаимоотношение с учащимися. В действительности же одна из главных обязанностей обучающихся состоит в "уважительном отношении к чести и достоинству педагогических работников" (32.5.2) (1,43) хотя бы во имя "приобретения знаний, умений и навыков, соответствующих государственным образовательным стандартам" (32.5.1) (1,43). Обучающие, учителя, воспитатели, мастера, тренеры и др. достойны всякого уважения независимо от возраста, пола, расовой и национальной принадлежности.

Таким образом, в большинстве случаях основными факторами, негативно влияющими на психологическое состояние учителя (воспитателя, тренера), травмирующими его психику, становятся поведения некоторых нерадивых учащихся, несоблюдение ими элементарных правил поведения школьников и внутреннего распорядка образовательного учреждения. Это в свою очередь приводит к дидактогении педагогических работников, в частности учителей. Определенные недомогания в состоянии здоровья учителей, в частности, сердечно-сосудистой и нервно-психологической системе, являются результатом напряженного взаимоотношения учителей и учащихся в учебно-воспитательном процессе. В то время как учеными установлено, что здоровье человека на 80 % зависит от его умственного состояния (комфорта).

Обобщая вышеприведенные интерпретации, следует отметить, что, на наш взгляд, кроме перечисленных к дидактогении в целом надо отнести все недостатки, которые встречаются на всех ступенях образования от дошкольного до докторантуры, а именно: 1) дальнейшее совершенствование содержания системы образования без учета естественных (природных) психологических, физиологических возможностей и интеллектуального уровня обучающихся; 2) недорозумения во взаимоотношених учителя и учащихся; 3) отсутствие проверки пригодности, специальной подготовки и способностей абитуриентов при приеме в высшие и средне специальные педагогические учебные заведения; 4) овладение педагогической профессией случайных людей; 5) слабая психолого-педагогическая и методическая подготовленность учителей, не компетентность в применении новых информационных и коммуникационных технологий обучения; 6) привлечение в обучение повсеместно всех детей с 6-летнего возраста независимо от индивидуального физического, психологического, биологического, умственного, интеллектуального уровня развития; 7) составление расписания занятий без учета повышения и понижения энергетической напряженности обучающихся; 8) несоблюдение норм домашних заданий; 9) отсутствие в некоторых случаях нормальных учебных условий; 10) наличие (или увеличение количества) экзаменов, оказывающих негативное влияние на здоровье и психику обучающихся вместо формирования у них сознательного отношения к обучению; 11) чрезмерно высокие требования к учебным успехам своих детей со стороны родителей; 12) случаи бестактности, неучтивости, грубости и неуважительного отношения к учителям и воспитателям со стороны учащихся и др.

*Рецензент: дос. В.Баширов*

**Использованная литература**

1. Закон "Об образовании" Азербайджанской Республики. Баку, 2012. – 64 с.
2. http:/www.ped.vslovar.ru/574.html
3. vocabulary.ru/diktionary/978
4. www.edutic.ru/psh/1/5/p/10/
5. didacts.ru/diktionary/1010/word/didaktogenija
6. vocabulary.ru/diktionary/25/word/-didaktogenija
7. www.encyclopedia.ru/cat/online/-detail/38682
8. www.gumer.info/bibliotek_Buks/-Psihol/stepan/index.php
9. www.insai.ru/slovar/2418?page=4
10. didacts.ru/diktionary/1010/word/-didaktizm
11. tskk.spider.ru/content/section/…/-458/
12. technologies.su/istoriya_razvitiya_it
13. e-readinq-lib.orq/…/Mihaiilov_-_Konse…
14. ru.wikipedia.org/wiki/Информационные _технологии
15. cde.osu.ru/demoversion/cource94-/glava_1_3.html

**H.Cəfərov**

**Didaktogeniya: elmi şərhləri və pedaqoji aspektləri**

**Xülasə**

Məqalədə müxtəlif mötəbər elmi mənbələrə istinad etməklə "didaktogeniya" terminінə aydınlıq gətirilir; müəllim və şagirdlərin təlim prosesinin bərabərhüquqlu subyektləri, təlim və tərbiyənin isə ikitərəfli hadisə olması nəzərə alınaraq müvafiq ədəbiyyatda verilən izahların onun məzmununu tam əks etdirmədiyi əsaslandırılır.

**H.Jafarov**

**Didactic genius: Scientific interpretations and pedagogical aspects**

**Summary**

In this article the term "didactic genius" is investigated. This term is explained like training based on equal rights. It means that in the process of learning both teacher and students are equal. The role of literature in upbringing of students is also noted, because literature helps students to become perfect.

* * *

***Psixologiya***

# MƏNLİK ŞÜURU VƏ YENİYETMƏLİK YAŞI DÖVRÜNDƏ ÖZÜNÜDƏRKETMƏNİN PSİXOLOJİ XÜSUSİYYƏTLƏRİ

**Rəna Qasımova**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin Ümumi psixologiya kafedrasının müəllimi***

***Açar sözlər:*** *mənlik şüuru, şəxsiyyət, özünüdərketmə.*
***Ключевые слова:*** *самосознание, личность, самопознание.*
***Key words:*** *dignity consciousness, personality, self-understanding.*

Mənlik şüuru insanın özünü şəxsiyyət kimi tanıması və dərk etməsi prosesidir. Mənlik şüuru insanın özünün tələbat və qabiliyyətlərinə, fikir və hislərinə, davranış və fəaliyyət motivlərinə şüurlu münasibətidir. Onun əsas əlamətləri insanın özünü bütün ətraf aləmdən, yəni "mən"ini "qeyri-mən"dən ayırması, özünün fiziki, psixi və mənəvi keyfiyyətlərini qiymətləndirməsi və dərk etməsi, psixi həyatının bütün cəhətlərinə şüurlu münasibət bəsləməsidir.

Mənlik şüurunun strukturunda aşağıdakı üç cəhəti xüsusilə fərqləndirmək lazımdır:

1. "Mən obraz" – insanın özü haqqında təsəvvürləri (başqa sözlə, psixoloji avtopartret).

2. Özünüqiymətləndirmə - insanın özünün özü haqqındakı təsəvvürlərinin adekvat surətdə qiymətləndirməsi.

3. Potensial davranış reaksiyaları – insanın "Mən obrazı" və özünə verdiyi qiymətlərin onun davranış və rəftarında təzahür etməsi.

Mənlik şüuru şəxsiyyətin inkişafından ayrı, müstəqil inkişaf yoluna malik deyildir, bu proses şəxsiyyətin inkişafına daxildir.

Mənlik şüurunun şəxsiyyətin psixi həyatında mühüm rolu olduğunu qeyd edən S.Y.Rubinşteyn hesab edir ki, "əgər şəxsiyyəti mənlik şüuruna, "Mən"inə müncər etmək olmazsa, onları bir-birindən ayırmaq da mümkün deyildir. Mənlik şüuru subyekt keyfiyyətində insanın bütün etdiklərini mənimsəyir. O, şəxsiyyətin psixi həyatına qarışaraq, insanın digər psixi prosesləri ilə qırılmaz surətdə əlaqədardır" (2).

Ə.Əlizadə mənlik şüurunun strukturunda dayanan mənəvi keyfiyyətləri refleksiya ilə bağlayır. "Yeniyetmədə mənlik şüurunun formalaşması öz davranışını, özünün mənəvi keyfiyyətlərini, xarakter və qabiliyyətlərini dərk etməsi ilə başlayır. Onun rüşeymlərini hələ kiçik məktəbli yaşı dövründə yeni xüsusiyyət kimi meydana çıxan refleksiya təşkil edir" (3).

Ləyaqət hissi də insanın mənlik şüurunun formalaşmasına mühüm təsir göstərir.

İnsanın özünüdərketməsi, ilk növbədə "mənlik şüuru"nun, "Mən obrazı"nın, "Mən konsepsiya"sının, özünüqiymətləndirmənin inkişafı və təşəkkülü ilə sıx bağlıdır.

Məlumdur ki, özünüdərketmənin mərkəzi elementini, onun nüvəsini "Mən" təşkil edir. "Mən" anlayışı ilk dəfə psixologiyada U.Ceyms tərəfindən formulə edilmişdir.

U.Ceyms qlobal "Mən"i (self) iki təşkil elementdən – "Mən dərk edən" (l) və "Mən - obyekt"dən (Me) ibarət olduğunu göstərmişdir.

Müəllifin fikrincə, bu iki elementin diferensiasiyası əslində qeyri-mümkündür. Çünki birinci halda (l) insanın şüura malik olduğunu göstərir, ikinci halda isə (Me) özünü varlığın bir elementi kimi dərketməsini ön plana çəkir.

Özünüdərketmə problemi müxtəlif aspektlərdə araşdırılmışdır. Problemlə bağlı mövcud tədqiqatlar içərisində aşağıdakılar diqqəti cəlb edir.

İlk növbədə şəxsiyyətin formalaşmasında özünüdərktemənin rolu və mövqeyi öyrənilmişdir. Burada özünüdərketmə və mənlik şüurunun ümumi nəzəri və metodoloji aspektləri şəxsiyyətin inkişafı və formalaşması kontekstində təhlil edilmişdir. Bu kontekstdə Amerika və Avropada aparılmış tədqiqatlarda, ilk növbədə şəxsiyyətin strukturunda, onun psixoloji portretində "Mən"i mərkəzi element kimi ön plana çəksələr də, ortaya çıxan neqativ halların yaranmasını fərdin özünüdərketməsində, özünümünasibətində axtarmışlar.

Problemə həsr edilmiş ikinci istiqamətin leytmotivini yaş və pedaqoji psixologiyada, təlim-tərbiyə işinin təşkilində özünüdərketmənin öyrənilməsi təşkil edir. Bu istiqamətin nümayəndələri müxtəlif yaş dövrlərində özünüdərketmənin formalarının, səviyyələrinin dəyişilməsinin hansı istiqamətdə getdiyini tədqiq etmişlər.

Keçmiş sovet psixoloqları ayrı-ayrı yaş dövrlərində "Mənlik şüuru" və özünüqiymətləndirmənin tərkibində özünüdərketmənin təzahür mexanizmini açıqlamağa səy göstərsələr də, ümumiyyətlə, həmin mövzunu müstəqil tədqiqat obyektinə çevirməmişlər. Lakin bütün bunlarla yanaşı, ayrı-ayrı tədqiqatlarda kiçik və böyük məktəblilərdə özünüdərketmənin müxtəlif aspektləri məhdud səviyyədə öyrənilmişdir. Qeyd etməliyik ki, Avropada və Amerikada problemlə bağlı bu sahədə aparılmış tədqiqatlarda isə fərqli nüanslar özünü göstərir. Burada əsasən "Mən - konsepsiya" və digər inteqrativ sistemlərin öyrənilməsi diqqət mərkəzində dayanır. Çünki son illərdə aparılmış tədqiqatlar göstərir ki, insanın özünüdərketməsi hər bir yaş dövründə özünəməxsus çalarlara malik olur. Hətta əksər tədqiqatçılar bu prosesin yeniyetməlik yaş dövründə formalaşdığını iddia edirlər. Yaş və pedaqoji psixologiyada aparılmış tədqiqatlar özünüdərktemənin təlim fəaliyyətinə təsiri məsələlərini diqqət mərkəzinə gətirsələr də, onun hərtərəfli tədqiqinə nail olmamışlar.

Nəzərdən keçirdiyimiz III istiqamət fəlsəfi yanaşmadır. Burada əsasən əxlaqi mənlik şüuruna, özünüdərktemənin metodoloji əsaslarına, tarixi-mədəni aspektlərinə, eləcə də sosioloji tərəflərinə diqqət yetirilir . Bu sahədəki tədqiqatlarda özünüdərketmə əxlaqi şüurun tərkib elementi kimi nəzərdən keçirilmiş, onun fəlsəfi-etik məzmununun araşdırılması başlıca məqsəd olmuşdur. Xüsusilə, özünüdərketmə nəzəri planda hərtərəfli tədqiq edilərək insanın özünü idarə etməsinin başlıca atributu kimi təsvir edilmişdir.

Təsnif etdiyimiz dördüncü istiqamət psixokorreksiya işinin təşkilində özünüdərketmənin bir sıra cəhətlərinin tədqiqinə yönəlmişdir. Bu tədqiqatların başlıca qayəsini "Mən"in, özünüdərketmənin və "Mənlik şüuru"nun psixi sağlamlığa təsiri məsələləri təşkil edir. Bu tədqiqatların müəllifləri yeniyetmələrin psixi sağlamlığı, həmçinin onların şəxsiyyət kimi formalaşmasının önəmli məsələlərindən biri kimi "real mən"lə "ideal mən"in uyğunluğunu əsas götürmüşlər.

Özünüdərketmə mürəkkəb və çoxtərəfli prosesdir. Onun mürəkkəbliyi silsilə amillərlə şərtlənmişdir. Onları aşağıdakı kimi qruplaşdıra bilərik:

1. İnsan idraki qabiliyyətlərini inkişaf etdirdikdən, müvafiq vasitələr əldə etdikdən sonra onları özünüqiymətləndirmənin obyekti edə bilər.

2. Dərketmə üçün müəyyən material əldə olunmalıdır. Bu isə insanın biliklərə, təsəvvürlərə malik olması zəminində mümkündür. Belə olan halda fərd fasiləsiz olaraq dəyişir, inkişaf edir, özünüdərketmə isə həmişə öz obyektindən kənarda qalır.

3. Özü haqqında müəyyən məlumatların əldə olunması artıq subyekti (insanı) dəyişir: özü haqda nə isə bilən şəxs artıq "başqalaşır". Ona görə də özünüdərketmə dinamik proses olmaqla son məqsədə - özünüinkişafa, özünütəkmilləşdirməyə, özünügerçəkləşdirməyə yönəlir.

1993-cü ildə Moskvada nəşr olunmuş psixologiya lüğətində özünüdərketməyə aşağıdakı kimi tərif verilir: "özünüdərketmə insanın öz fikir və arzularına, emosiya və yaşantılarına, eləcə də öz davranışının dərk olunmuş münasibətidir" (4).

Hesab edirik ki, özünüdərketmə fərdin şəxsiyyətə çevrilməsi prosesində aparıcı törəmələrdən biridir.

Azərbaycan psixoloqu M.Həmzəyev (5) özünüdərketmə və mənlik şüurunun şəxsiyyətin inkişafının və formalaşmasının əsas vasitələrindən biri olduğunu qeyd edir. Müəllif yazır: "Yeniyetmənin mənlik şüurunun formalaşması onun öz davranışının mənəvi keyfiyyətlərini, xarakter və qabiliyyətlərini dərketməsi ilə başlayır. İlk növbədə yeniyetmənin mənlik şüurunun əsasını başqa adamların mülahizələri təşkil edir. Yaş artdıqca yeniyetmə özünün şəxsiyyətini müstəqil təhlil etməyə və qiymətləndirməyə başlayır".

Yeniyetməlik yaşını adətən, "keçid yaşı", "böhranlı yaş" kimi səciyyələndirirlər. Yeniyetməlik yaşında bir-birilə ziddiyyət təşkil edən müxtəlif meyillər özünü göstərir. Yeniyetməlik yaşı, bir tərəfdən, sosializasiya yaşıdır: yeniyetmə bəşəriyyətin mədəniyyət aləminə qovuşur və sosial sərvətləri mənimsəyir, digər tərəfdən yeniyetməlik yaşı fərdiləşmə yaşıdır: yeniyetmə özünün bənzərsiz və təkrar olunmaz Mən-ini kəşf edib həyatının hər bir məqamında onu bütün aydınlığı ilə göstərir.

Yeniyetmənin mənlik şüurunun xüsusiyyətlərini aydınlaşdırarkən bir cəhəti ayrıca qeyd etmək lazımdır. Yeniyetməlik yaş dövründə özünüdərketmə tələbatı xüsusi məna kəsb etsə də, onun özü haqqındakı obyektiv biliklərinin səviyyəcə aşağı olması diqqəti cəlb edir. Yeniyetmənin bir çox hallarda özünün şəxsi keyfiyyətlərini düzgün təhlil edə bilməməsinin köklərini, birinci növbədə, məhz burada axtarmaq lazımdır. Bu əsasda da bəzən yeniyetmənin iddia səviyyəsi ilə kollektivdəki real mövqeyi arasında, özünə münasibəti ilə başqa adamların – yaşlıların və yoldaşların ona münasibəti arasında ziddiyyətdən nəşət edən münaqişələr meydana çıxır.

Yeniyetmə öz davranış və xüsusiyyətlərini dərk etdikcə, onda özünütərbiyə tələbatı yaranır ki, bu prosesdə də ayırd edilmiş nümunə və əxlaqi etalon müstəsna rol oynayır.

Yeniyetmənin özünün mənəvi keyfiyyətləri haqqındakı təsəvvürləri çoxcəhətlidir. Onlar mənlik şüuru ilə əxlaqi şüurun formalaşması zəminində inkişaf edib yeni keyfiyyətlər kəsb edirlər.

Müəyyən edilmişdir ki, yeniyetmələr əvvəlcə təlim fəaliyyətinin icrası ilə bağlı keyfiyyətləri (əməksevərlik, təkidlilik, diqqətlilik, səy), sonra başqa adamlara münasibəti ifadə edən keyfiyyətləri (yoldaşlıq hissi, həssaslıq, təmkinlilik, tərslik), daha sonra özünəmünasibəti ifadə edən keyfiyyətləri (təvazökarlıq, özünətənqidi yanaşma, yaltaqlıq, lovğalıq) və nəhayət, şəxsiyyətin çoxcəhətli münasibətlərini ifadə edən mürəkkəb keyfiyyətləri (şəxsi ləyaqət, şərəf hissi,

prinsipiallıq və s.) ayırd edir və dərk etməyə başlayırlar. Onların özləri haqqında təsəvvürləri də valideynlərin, müəllimlərin, həmyaşıd uşaqların vasitəsilə bu məcrada formalaşır.

Yeniyetməlik dövründə uşaqların davranış və rəftarında əvvəlki yaş dövründə müşahidə edilməyən yeni xüsusiyyətlər meydana çıxır: oğlanlarla qızların yaşlılarla və yoldaşları ilə münasibətlərinin xarakteri dəyişir, onlar yaşlıların münasibətləri timsalında formalaşmağa başlayır, yoldaşları ilə münasibəti yeniyetmə üçün həyatın mühüm subyektiv sahəsinə çevrilir.

D.B.Elkonin və T.V.Draqunova uşağın yaşlı adam kimi inkişafı dedikdə, onun yaşlılar cəmiyyətində (kollektivində) yaşamağa hazırlığını nəzərdə tuturlar. Onlar bu prosesdə iki cəhəti fərqləndirirlər: uşağın yaşlılar aləmində yaşamağa obyektiv surətdə hazır olması (obyektiv yaşlılığın ilk əlamətləri) və özünü yaşlı adam kimi aparmaq hissinin və meyilinin (subyektiv yaşlılığın ilk əlamətləri) inkişafı.

Yeniyetmənin yaşlılıq hissinin və meyilinin ilk yaşantıları onun həyatının müxtəlif sahələrində ifadə olunur.

Yeniyetmə ailənin həyatında yaşlı adam kimi iştirak edir, biliklərə müstəqil surətdə yiyələnməyə başlayır.

L.İ.Rojoviçin fikrincə, yeniyetmədə özünüdərketmə tələbatının yaranmasının əsas səbəblərindən biri onların davranış və təlim fəaliyyətinə tələbin artması, ictimai münasibətlər sistemində öz yerini tutmaq səyi ilə yanaşı, başqa adamlara, xüsusi ilə əkscins nümayəndələrinə marağın təşəkkülü ilə bağlıdır. L.İ.Rojoviçin tədqiqatları inandırıcı surətdə göstərir ki, özünüdərketmə inkişaf edir və yeniyetmədə öz inkişafının keyfiyyət etibarilə yeni formasını kəsb edir.

Nəhayət, bizim varlığımızın mənası həqiqətən dərketmədən asılıdır, xüsusilə subyektin həyatın mənasını axtarmaq, onun mənasını başa düşmək vəzifəsidir. Dünyanı dərk etdikdə, insan özünü obyekt kimi yox, daxilən, öz varlığının mənası nöqteyi-nəzərindən dərk etməlidir.

*Rəyçi: prof. Ə.Əlizadə*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əliyev M. Psixologiya atlası. B., 2009.

2. Рубинштейн С. Основы общей психологии. М.,1989.

3. Психологический словарь. Под. Ред. В.Зинченко, Б.Мещеракова, 2-еизд. М. Педагогика. Пресса, 1999.

4. Həmzəyev M. Yaş və pedaqoji psixologiyanın əsasları. B., 2003.

5. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. B., 1998.

**Р.Касумова**

**Самосознание и психологические особенности самопознания в подростковом возрасте**

**Резюме**

В статье раскрыто значение самосознания, его структурные компоненты, отражены психологические особенности самопознания в подростковом возрасте.

**R.Gassimova**

**Dignity consciousness and psychological features of self-understanding at the age of adolescence**

**Summary**

The article is dedicated to dignity consciousness, its structure components, and psychological features of self-understanding at the age of adolescence.

***Metodika, qabaqcıl təcrübə***

# ŞAGİRDLƏRİN İDRAK FƏALİYYƏTİNİN İNKİŞAF ETDİRİLMƏSİ YOLLARI

**Nuriyyə Hümmətova**
***Bakı şəhəri 202 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *müasir təlim, idrak fəaliyyəti, dərketmə, standart, dərs, təlim metodları.*
***Ключевые слова:*** *современное обучение, сознавательная деятельность, осознание, стандарт, урок, методы обучения.*
***Key words:*** *modern training, cognitive activity, cognition, standard, lesson, training methods.*

Müstəqil Azərbaycan Respublikasının yaranmasından sonra dövlətimizin apardığı məqsədyönlü islahatlar sırasında təhsil islahatları xüsusi yer tutur. Gələcək cəmiyyətin inkişafı gənc nəslin necə istiqamətləndirilməsindən asılıdır. Uğurla aparılan təhsil islahatlarının nəticəsidir ki, tədris 2008-ci ildən etibarən yaranmış fənn kurikulumları əsasında aparılır. Əgər əvvəllər bilikləri əldə etmək üçün şagirdi iki əsas bilik mənbəyi-müəllim və dərslik qane edirdisə, müasir dövrün tələbləri bunu mümkünsüz edir. Ənənəvi təlim zamanı şagirdlərin dərketmə fəallığı passiv, reproduktiv xarakter daşıyır. Ənənəvi təlimlə, eləcə də həyatın real tələbatlarından kənar olan təhsil şəraitində müasir dövrün şəxsiyyətinin formalaşması çətindir. Müasir informasiya-kommunikasiya dövründə elmin müxtəlif sahələrində toplanmış bilik kütləsi elə sürətlə artır ki, onları ənənəvi prinsiplər əsasında öyrənənə çatdırmaq mümkünsüzdür. Bu səbəbdən müasir təlimin başlıca vəzifələrindən biri öyrənməyi öyrətməkdir, yəni şagirdləri bilikləri müstəqil əldə etməyə yiyələndirməkdir.

Ölkəmizdə milli təhsil sahəsində islahatların əsas istiqamətləri və strategiyasının işlənilib hazırlanması Azərbaycan Respublikası Konstitusiyasının əsas prinsiplərinə, beynəlxalq standartlara cavab verən “Azərbaycan Respublikasının Təhsil Qanunu” və təhsilin üstün, strateji sahə kimi inkişafını nəzərdə tutan Dövlət Təhsil Proqramına əsaslanmışdır.

Bu istiqamətdə həyata keçirilən əsas tədbirlərdən biri respublikanın ümumtəhsil məktəblərində Azərbaycan tarixi fənninin tədrisinə diqqətin artırılması olmuşdur.

Kurikulumun tətbiqi tədris prosesinə çoxsaylı yeni metod və üsullar gətirib. Müasir müəllim forma və üsullardan istifadə etməklə şagirdlərin idraki fəallığını inkişaf etdirir. Kurikulumlarda fənnin məzmunu nəticəyönümlü yanaşma əsasında hazırlanmışdır. Burada əsas diqqət nəticəyə nail olduğunu göstərmək üçün şagirdlərin nümayiş etdirməli olduğu fəaliyyətə yönəldilmişdir. Bu bacarıqlar şəklində müəyyən olunan standartlar və onların yerinə yetirilməsini təmin edən alt standartlar sistemi vasitəsi ilə ifadə olunur. Belə sistem şagird

nailiyyətlərinin ardıcıl izlənməsini, onun fəaliyyətindəki irəliləyişlərin müntəzəm qiymətləndirilməsini təmin edir.

Müasir dövrdə cəmiyyətin, həm də onun hər bir üzvünün yaşaması və inkişafında başlıca dəyər yaradıcı, özünü inkişaf etdirən şəxsiyyətdir. Hazırki dövrdə həyatın tələbləri və təlimin məqsədləri uşaqda özünüinkişaf qabiliyyəti formalaşdırır. Bu da öz növbəsində uşaqda məntiqi düşünmə, hadisələrə tənqidi yanaşma, bilikləri müstəqil əldə etmə, müstəqil olaraq qərar çıxarma və sair qabiliyyətlərə əsaslanır.

İdrak proseslərinin inkişafı şagirdlərin mənimsədikləri fəaliyyət növünün məzmunundan asılıdır. Təlim fəaliyyəti səmərəli təşkil edildikdə, yeniyetmə yaş dövründə şagirdlərin idrak fəaliyyətində bir sıra keyfiyyət dəyişikliyi əmələ gəlir. Yəni şagirdlər təlim fəaliyyətinin bütün ünsürlərinə yiyələnirlər: özləri öz qarşılarına təlim tapşırığı qoyur, onu icra edir, yoxlayır, qiymətləndirir, səhvlərini müəyyən edir, aradan qaldırırlar. Bununla bərabər, onlarda təlim-idrak motivləri təşəkkül edir.

İdrak proseslərinin inkişafı fəaliyyət növündən asılı olduğu kimi, həmin fəaliyyətin necə təşkil edilməsindən, istiqamətləndirilməsindən də asılıdır. Belə ki, Azərbaycan tarixi fənni beş məzmun xətt üzrə, əsas standartlar əsasən dəyişməz qalmaqla, alt standartlar şəklində şagirdlərin inkişaf dinamikasına uyğun olaraq dəyişir.

Şagirdlərin inkişaf dinamikasına uyğun olaraq tədris prosesində idrak fəallığının həm yaradılması, həm də saxlanılması üçün xüsusi psixoloji mexanizmlər mövcuddur.

Dərketmə və biliklərin mənimsənilməsi prosesində təfəkkürün fəallaşdırılması nəticəsində şagirdlərdə sərbəstlik, biliklərin müstəqil qavranılmasına imkan yaranır və təlim daha səmərəli olur. Fəal (interaktiv) təlimin mexanizmləri standartların həyata keçirilməsini təmin edir.

Müəllim Azərbaycan tarixi dərslərində keçirilən mövzuların səmərəliliyini təmin etmək, qarşısına qoyduğu məqsədə çatmaq üçün ardıcıl və məqsədyönlü şəkildə şagirdlərlə əməkdaşlıq edir: problemli vəziyyəti təşkil edir, tədqiqat məqsədlərinin qoyuluşunda şagirdlərə istiqamət verir, bunların həllində metodik kömək göstərir, biliklərin əldə edilməsi və mənimsənilməsi yollarını öyrədir. Təlim prosesində müəllimin şagirdlərə psixoloji dəstək verməsi onlarda özünəinamsızlıq hissini aradan götürə bilir. Bu da öz növbəsində şagirdlərdə idrak fəallığı yaradır, onların tədqiqat fəaliyyətini artırır.

Bütün bunlar Azərbaycan tarixi dərslərinin günün tələblərinə uyğun olaraq qurulmasına və daha səmərəli keçməsinə, baş verən hadisələrin ümumi, mühüm və fərqləndirici əlamətlərini öyrənməyə imkan verir.

Fikrimizi VII sinif “Salarilər dövləti” mövzusu əsasında şərh edək. Şagirdlərə izah edilir ki, əsarətə qarşı baş vermiş üsyanlar Xilafəti xeyli zəiflətmişdi. Ərəb zülmünə qarşı mübarizə uğurla başa çatdıqdan sonra Azərbaycan ərazisində Şirvanşahlar, Sacilər, Salarilər, Şəddadilər, Rəvvadilər dövlətlərinin yaranması qədim dövlətçilik ənənələrinin dirçəlməsi baxımından böyük əhəmiyyətə malikdir (hadisənin ümumi və mühüm əlaməti).

Bundan sonra hər hansı bir tarixi hadisələrin mahiyyəti açılarkən əsas fərqləndirici əlamətlərini göstərən bir sıra mülahizələr söyləmək mümkün olur. Psixologiya elmi öyrədir ki, mülahizələr idrak fəaliyyətini inkişaf etdirir və nəticələrin çıxarılması üçün mühüm əhəmiyyət kəsb edir. İdrak fəallığı prosesinin inkişafına yönəlmiş texnikalardan istifadə imkanlarını aydınlaşdırmaq üçün dərsin tam gedişini aşağıda veririk.

Mövzu: Salarilər dövləti.

Standartlar:

1.1.1.Mühüm hadisə, proses və təza-

hürlərin xronoloji çərçivələrini müqayisə edir.

2.1.1.Azərbaycanın coğrafi mövqeyi və təbii amilləri ilə müxtəlif təsərrüfat sahələri və istehsal münasibətlərinin inkişafı arasında əlaqələri izah edir.

3.1.2. Azərbaycanda dövlətçilik ənənələrinin inkişafı xüsusiyyətlərini dəyərləndirir.

4.1.2.Tarixi şəxsiyyətlərin oxşar və fərqli cəhətləri ilə bağlı sxem və cədvəllər hazırlayır.

Məqsəd: a) Salarilər dövlətinin yaranmasının xüsusiyyətlərini şərh edir, Mərzban ibn Məhəmmədin Azərbaycan tarixindəki rolunu müəyyənləşdirir və fəaliyyətini dəyərləndirir.

b) Sacilər dövlətinin hökmdarı Yusif ibn Əbu Sac ilə Salarilər dövlətinin hökmdarı Mərzban ibn Məhəmməd haqqında müqayisəli sxem hazırlayır.

İnteqrasiya: Azərbaycan dili – 3.1.3, təsviri incəsənət – 2.1.2, fəndaxili şaquli inteqrasiya.

İş forması: kollektiv iş, qruplarla iş.

İş üsulu: Ümumi sorğu, karusel, venn diaqramı, müzakirə, suallar, beyin həmləsi.

Resurslar: Dərslik, audiovizual dərs vəsaiti, xəritə, iş vərəqləri, kompyuter. (digər ləvazimatlar: marker, test tapşırıqları)

Dərsin gedişi:

I Motivasiya

Feodal dövlətlər ağacı təsviri verilir, sorğu yolu ilə IX-XI əsr feodal dövlətlərin adı şagirdlər tərəfindən cavablandırılaraq ağacın üzərinə yazılır və sual olunur :

İlk hecası vəhşi heyvan adını, ikinci hecası göl adını, üçüncü hecası titul, dördüncü hecası cəm şəkilçisini bildirən feodal dövləti müəyyən edin?

■ Şirvanşahlar dövləti

Bütün Azərbaycan torpaqlarını ilk dəfə vahid dövlət tərkibində birləşdirmiş, üç hecalı feodal dövləti müəyyən edin?

■ Sacilər dövləti

Şirvanşahlar və Sacilər dövləti haqqında keçmiş dərslərimizdə müəyyən biliklər qazanılıb. Beləliklə, yeni öyrənəcəyimiz feodal dövlətin adını müəyyən etmək üçün sual olunur:

Doqquz hərifli, dördhecalı, ilk iki hecasında əlifbamızın ilk hərifi olan feodal dövləti müəyyən edin?

■ Salarilər dövləti

Bundan sonra lövhəyə tədqiqat sualı yazılır.

Tədqiqat sualı:

Salarilər dövlətinin yaradıcısı Mərzban ibn Məhəmməd Sacilər dövlətinin hökmdarı Yusif ibn Əbu Sacdan fərqli olaraq hansı işləri görmüşdür? Onun fəaliyyətini təhlil edərək Azərbaycan tarixindəki rolunu müəyyən edin.

Müəllim mövzu haqqında qısa şərh verir, sonra audiovizual dərs vəsaitindən istifadə etməklə yeni mövzu barədə məlumat toplanır.

Bundan sonra müəyyən üsullardan istifadə etməklə şagirdləri qruplara bölür və lövhəyə tapşırıq yazılır:

Mərzban ibn Məhəmmədin fəaliyyətini səciyyələndirən xüsusiyyətləri müəyyən edin.

II Tədqiqatın aparılması

Şagirdlər 4 qrupa bölünür və “kim daha çox” oyununa dəvət edilir. Hər bir qrupa iş vərəqləri paylanır. Şagird qrupları mətndən istifadə edərək onlara verilən vaxt (10 dəqiqə) ərzində Mərzban ibn Məhəmmədin fəaliyyəti ilə bağlı faktlara əsaslanaraq daha çox xüsusiyyət yazmağa çalışırlar. Sonra karusel üsulundan istifadə edərək yazdıqları vərəqələri növbə ilə digər qruplara ötürürlər, hər qrup yazılanlara öz əlavələrini edir.

III Qazanılan biliklərin mübadiləsi

Tədqiqat işi üçün ayrılmış vaxtın başa çatması elan edildikdən sonra qruplar növbə

ilə öz işlərini lövhədən asır və məlumat verirlər.

IV Məlumatın müzakirəsi və təşkili

Müzakirə zamanı qarşıya qoyulan məqsədə nail olmaq üçün şagirdlərə müəllim tərəfindən istiqamətləndirici suallar verilir. Sonra hansı qrupun daha çox və önəmli xüsusiyyət yazdığı müəyyənləşdirilir. Şagirdlər təxminən aşağıdakı xüsusiyyətləri müəyyən etməlidirlər. Mərzban ibn Məhəmmədin fəaliyyətini səciyyələndirən xüsusiyyətləri:

1. Salarilər sülaləsinin nümayəndəsi və Deyləm hakimi idi.

2. Azərbaycanın feodal qrupları arasındakı çəkişmələrdən istifadə edərək axırıncı Sacilər dövlətinin hökmdarı Deysəmə qalib gəldi və Sacilər sülaləsinin Azərbaycanda hakimiyyətinə son qoydu.

3. 941-ci ildə paytaxtı Ərdəbil şəhəri olan Salarilər dövlətinin əsasını qoydu.

4. Azərbaycanın şimal-qərb torpaqlarını və Şirvanşahlar dövlətini də özlərindən asılı hala saldı.

5. Dərbəndi ələ keçirdi.

6. Şərqi Gürcüstanı tabe etdi.

7. Dövlətin sərhədləri şimalda Dərbənddən, cənubda Dəclə və Fərat çaylarının yuxarı axarlarına qədər uzandı.

8. Ölkənin iqtisadi və mədəni inkişafına, ticarət əlaqələrinin genişlənməsinə diqqət yetirdi.

9. Xəzər dənizində Azərbaycanın ticarət gəmiləri üzməyə başladı.

V Nəticənin çıxarılması

Müəllim tərəfindən sinfə aşağıdakı sualla müraciət edilir:

Mərzban ibn Məhəmmədin fəaliyyətində hansı xüsusiyyətləri daha mühüm hesab edirsiniz? Şagirdlərin cavabı təxminən aşağıdakı kimi ola bilər.

1. Sacilər sülaləsinin Azərbaycanda hakimiyyətinə son qoydu.

2. Salarilər dövlətinin əsasını qoydu.

3. Bütün Azərbaycan torpaqlarını vahid dövlət daxilində birləşdirdi.

4. Xəzər dənizində Azərbaycanın ticarət gəmiləri üzməyə başladı.

Beləliklə, Mərzban ibn Məhəmmədin Azərbaycan tarixində əsas rolu nədən ibarət oldu?



Cavab:

■ Mərzban ibn Məhəmməd yeni bir dövlətin əsasını qoydu və qalibiyyətli müharibələr nəticəsində bütün Azərbaycan torpaqlarını vahid dövlət daxilində birləşdirdi.

VI Yaradıcı tətbiqetmə

Şagirdlərə qazandıqları biliklərin möhkəmləndirilməsi məqsədi ilə aşağıdakı məzmunda tapşırıq verilir:

Salarilər dövlətinin yaradıcısı Mərzban ibn Məhəmməd və Sacilər dövlətinin hökmdarı Yusif ibn Əbu Sacın fəaliyyətlərinin fərqli və oxşar xüsusiyyətlərini venn diaqramı vasitəsi ilə müqayisə edin.

Şagirdlərin hazırlayacağı venn diaqramı təqribən 71-ci səhifədə verildiyi kimi olmalıdır.

VII Qiymətləndirmə

Dərsin sonunda bütün qruplar üzrə şagirdlərin bilikləri aşağıdakı meyarlar əsasında qiymətləndirilir: 1. Dövlətin yaranması və inkişafının tarixi şəraitini şərh edir; 2. Mərzban ibn Məhəmmədin Azərbaycan tarixindəki rolunu dəyərləndirir; 3. Müqayisəli sxem hazırlayır.

Beləliklə, verilmiş bu dərs nümunəsi belə bir nəticəyə gəlməyə imkan verir ki, Azərbaycan tarixi dərslərində fəal təlimin mexanizm və metodlarının yaradıcı şəkildə tətbiqi müasir kurikulum islahatının tələblərini özündə ifadə edir ki, bu da şagirdlərin idrak prosesinin inkişafında mühüm rol oynayır. Pedaqoji prosesin əməkdaşlıq əsasında təşkili nəticəsində müəllim şagirdlərin idrak proseslərinin (məntiqi, tənqidi, yaradıcı təfəkkürün, hafizə, diqqət və bunlarla əlaqədar əsas bilik, bacarıq və vərdişlərin) inkişafına nail olur. Bütün bunlar təlim prosesinin nəticəyönümlü olmasını təmin edir.

*Rəyçi: dos. H.Cəfərov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Bayramov Ə., Əlizadə Ə. Psixologiya. Bakı: Çinar-Çap, 2006.

2. Veysova Z. Fəal / interaktiv təlim. Müəllimlər üçün vəsait. Bakı: UNİCEF, 2007.

3. Mahmudlu Y., Yusifov Y., Əliyev R., Qocayev Ə. VII sinif Azərbaycan tarixi. Dərslik. Bakı, 2012.

**Н.Гумматова**

**Пути развития осознанной деятельности учащихся**

**Резюме**

Масса знаний, собранная в современном этапе в разных областях науки, увеличивается с такой скоростью, что невозможно обучить это всё традщионными методами. С этой точки зрения одной из главных задач учебы это учить самостоятельнему обучению, чтобы учащиеся справлялись самостоятельно достижениями науки.

**N.Hummatova**

**The ways of developing students' cognitive activity**

**Summary**

The article is dedicated to the educational reforms. It is noted that development of future society depends on the direction of young generation.

Developing information-communication technologies help students to learn more information which is impossible to learn without them. Therefore one of the main tasks is to teach learning independently. Thus students must gain knowledge independently.

# TƏDRİS PROSESİNDƏ ELEKTRON DƏRS VARİANTININ TƏTBİQİ

**Şəfayət Rüstəmova**
***Yevlax şəhəri 4 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *təhsil islahatı, diyarşünaslıq, coğrafiya dərsləri, diyarşünaslıq materialları, informasiya texnologiyaları.*

***Ключевые слова:*** *реформа образования, краеведение, уроки географии, краеведческие материалы, информационные технологии.*

***Key words:*** *education reform, country study, geography lessons, information technologies.*

Azərbaycan təhsil sistemində islahatların aparılmasında başlıca məqsəd cəmiyyət və onun inkişafı üçün yeni insan formalaşdırmaqdır. Bu proses məktəbəqədər tərbiyə müəssisələrindən və ümumtəhsil məktəblərindən başlayır. Müasir dövr elmi-texniki tərəqqi (ETT) dövrüdür. Sirr deyil ki, ETT-nin nailiyyətləri tətbiq edilmədən hərtərəfli insan yetişdirmək mümkün deyil. ETT özü intellektin məhsuludur. Ona görə də təhsil islahatlarının həyata keçirilməsində əsas tələblərdən biri təlimdə texniki vasitələrdən istifadəni genişləndirməkdir. Bu gün tədris prosesində ənənəvi əyani vasitələrdən istifadə nə qədər əhəmiyyətini saxlasa da, kompyuter texnikasından istifadəyə ehtiyac bir o qədər artmışdır. Sanki zaman bizə diktə edir ki, ümumtəhsil məktəblərində bəsit dərslərə son qoyulmalı, yeni – müasir informasiya texnologiyalarına əsaslanan dərslər hazırlanmalıdır. Deməli, kompyuter texnologiyalarından istifadə günümüzün zəruri tələbinə çevrilmişdir. Görkəmli pedaqoq K.D.Uşinskinin təbirincə desək, "uşağın təbiəti aydın bir surətdə əyanilik tələb edir". Odur ki, əksər fənlərdə olduğu kimi coğrafiya fənnində də elektron dərslərin təşkili labüddür. Coğrafiya dərslərində dünya və onun ayrı-ayrı hissələrinin təbiəti və təsərrüfatına həsr olunmuş hazır disklərdən istifadə olunur. Bununla yanaşı, hər bir müəllim yaşadığı ərazinin coğrafiyasına həsr olunmuş disklərdən də istifadə etməlidir. Belə disklər olmadığından onların hazırlanma prosesi əsasən coğrafiya müəllimlərinin üzərinə düşür. Diyarşünaslıq materiallarının elektron variantının hazırlanmasında məqsəd coğrafiya dərslərində "məlumdan məçhula", "yaxından uzağa" didaktik qayda üzrə əyaniliyi təmin etmək, doğma diyarın təbiəti və təsərrüfat qanunauyğunluqları haqqında təsəvvürlər aşılamaq, əsl elmi, həyati və tədqiqat xarakterli müşahidələr əsasında gerçəkliyə nail olmaq, doğma diyar və dünya ölkələrinin coğrafiyası arasında müqayisəli əlaqəlilik yaratmaq, şagirdlərdə doğma yurda bağlılıq və vətənpərvərlik hissini möhkəmləndirmək və s. bu kimi məsələləri əhatə etməsidir. Bunu əsas götürərək, Yevlax rayonunun coğrafiyasından bəhs edən diyarşünaslıq materialı üzrə əlavə dərs vəsaiti işləyib hazırlamışıq. Məktəblilər arasında yeri gəldikcə bu vəsaitdən istifadə çox böyük effekt verir. Vəsaitin oxu materialı ilə yanaşı, elektron versiyası da hazırlanmışdır.

Diyarşünaslıq materiallarının elektron versiyası dərslərin keyfiyyətini yüksəldən amillərdəndir. Elektron variantın həyata

keçirilməsində ilk iş doğma diyarın təbiəti və təsərrüfatının öyrənilməsindən–yerli materialların toplanmasından başlayır. Doğma diyarın öyrənilməsi ilə bağlı mənbələr–müxtəlif kitablar, jurnallar, yerli qəzetlər, arxiv və muzey materialları, yerli icra hakimiyyəti orqanının müvafiq şöbələri, idarə və müəssisələrdən əldə olunmuş bəzi məlumat və faktlar, plan və xəritələr və s. olmaqla yanaşı, müəllimin özünün şəxsi elmi müşahidələri, elmi-tədqiqat işləri də ola bilər. Söz yox ki, informasiyanın əldə olunmasında texniki vasitələrin (fotoaparat və videokamera) rolu əvəzsizdir. Həmin vasitələrin köməkliyi ilə çəkilən şəkillər və canlı görüntülər yazı materialları ilə birlikdə məntiqi və metodiki baxımdan ardıcıl olaraq yığılıb sistemləşdirilir və sonda bütöv halda təqdim olunur. Öyrənilən ərazinin təqdim olunması tipik plan üzrə–ardıcıllıqla aparılmalıdır.

Diyarşünaslıq materialları kompyuterə daxil edilərkən yazı və görüntü materialları bir-birini elə tamamlamalıdır ki, vəhdət təşkil etsin. Diyarşünaslıq coğrafiyanın tərkib hissəsi sayılmaqla, eyni zamanda yerli elmi-kütləvi informasiya xarakteri daşıyır. Yəni şagirdlərin öz yaşadıqları ərazi üzrə görə bilmədiyi (və ya eşitmədiyi) coğrafi obyektlər ekrana gətirilir və bu da nəticə etibarilə şagird qəlbinə və ruhuna, ən əsası yaddaşına birbaşa təsir edir. Diyarşünaslıq – doğma yerin–məhəllin hərtərəfli öyrənilməsi ilə əlaqədar əldə olunmuş bütün məlumatlar, müşahidələr, tədqiqatlara əsasən yerli materialların toplanması və ümumiləşdirilməsi sahəsidir. Görkəmli rus coğrafiyaçısı, metodist A.S.Barkov yazmışdır: "Coğrafiyanın və məhəlşünaslığın öyrənmə obyekti və metodları bir-birinə uyğun gəlir. Məhəlşünaslığa "kiçik coğrafiya", daha dürüst "kiçik vətənşünaslıq" kimi baxmaq olar və belə də baxılmalıdır".

Müəllim istəsə diyarşünaslıq materiallarının tədrisini elektron dərs səviyyəsindən televariant səviyyəsinə yüksəldə bilər. Bu işdə o, təkcə pedaqoq kimi deyil, həmçinin jurnalist, ssenarist, rejissor, hətta operator kimi çıxış etməyi bacarmalıdır. Diyarşünaslıq materiallarının tədrisi gündəlik dərslik materiallarının tədrisindən fərqli olaraq, tam sərbəst yanaşılan bir sahədir. Burada üstün cəhət odur ki, dərslik müəlliflərində olduğu kimi, diyarşünaslığın tədrisində də müəllim müəllif qismində iştirak edir. Çünki onun yaşadığı ərazi ona daha çox doğma və əziz olduğu üçün bu işin birbaşa təşkilatçısı, tədqiqatçısı və yaradıcısı da məhz müəllimin özü olur. Ümumtəhsil məktəblərində diyarşünaslıq materiallarının hazırlanması və tədrisi şagirdlərdə mənimsəmə keyfiyyətini artırır. Beləliklə, kompyuterdə elektron informasiyanın yerləşdirilməsi iki əsas formada ola bilər: l. Səsli-görüntülü informasiya. 2. Səssiz-görüntülü informasiya. Səsli informasiyada məlumatlar əvvəlcədən yazılmış mətn, şəkil və canlı görüntülər üzərində sinxron edilir. Səssiz informasiyada görüntülər (mətn, şəkil, sxem, cədvəl, diaqram və s.) sadəcə nümayiş etdirilir. Unutmaq olmaz ki, nümayişlər məntiqi və metodiki baxımdan sistemli və ardıcıl olmaqla coğrafi qanunauyğunluqlara cavab verməlidir.

Diyarşünaslıq materiallarının tədrisində elektron variantın tətbiq edilməsinin başlıca üstünlükləri aşağıdakılardır: Şagirdlərdə mənimsəmə və qavrayışı asanlaşdırır; Əyaniliyi təmin edir; Biliklərin yaddaşda daha yaxşı qalmasına şərait yaradır; Şagirdlər diyarşünaslıqla bağlı daha ətraflı bilik və məlumatlar əldə edir; Kompyuter variantı operativ texniki informasiya vasitəsi kimi şagirdləri özünə cəlb edir; Şagirdlərin doğma yurda olan sevgi və məhəbbət hissini artırır.

Diyarşünaslıq məktəbin həyatla əlaqəsini həyata keçirmək üçün çox qüdrətli vasitədir (K.F.Stroyev). Bəllidir ki, bu gün

məktəbdə təhsil alan şagird sabahın mütəxəssisidir. Odur ki, məktəbi qurtardıqdan sonra yerli istehsal və qeyri-istehsal sahələrində çalışmağa gedən məzun bu sahələrdə işləməzdən əvvəl onlarla tanış olmaq imkanına malik olur, digər tərəfdən bəzi peşə biliklərinin qazanılması və şagirdlərin real əməyə psixoloji cəhətdən hazırlanmasında çox böyük imkanlar yaradır. Ən əsası şagird öz diyarını nə qədər dərindən öyrənsə, bir o qədər doğma yurda bağlılıq hissi inkişaf etmiş olar.

Beləliklə, diyarşünaslıq coğrafiyanın tədrisini həyata yaxınlaşdırmaq vəzifəsini qarşıya qoyur ki, bu da regionlarda sosial-iqtisadi inkişafın daha yaxşı həyata keçirilməsinin, yerlərdə təcrübəli ixtisaslı kadr hazırlığının əhəmiyyətini artırır. Kurikulum islahatı şagirdləri daha məntiqli və müstəqil düşünməyə alışdırır. Odur ki, digər fənlərdə olduğu kimi, məktəb coğrafiyasının daha maraqlı və düşündürücü olması zəruri məsələlərdəndir. Təlim metodikasında coğrafiyanın inkişafı üçün mövcud reallıqlardan biri kimi məhz diyar coğrafiyasının öyrənilməsi və işlənib hazırlanması vacib amillərdən birinə çevrilmişdir. Bu gün məktəb coğrafiya dərslikləri nə qədər bəşəri olub, Yer kürəsini təşkil edən sferalardan, materiklərdən, dünya ölkələrindən geniş bəhs etsə də, xəlqiliyə, vətənpərvərliyə həmişə ehtiyac vardır.

Nəticə etibarı ilə dərsliklərdə bölgələrə dair geniş məlumat verilməsi də məqsədəuyğun sayıla bilər. Diyarşünaslıq ədəbiyyatlarının yaranmasına da ehtiyac duyulur. Bu məqsədlə coğrafiya-diyarşünaslıq mərkəzlərinin yaradılması da arzu olunur.

*Rəyçi: dos. İ.İsmayılov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Bibik A. və b. "Orta məktəbdə coğrafiya təliminin metodikası". K.F.Stroyev "Coğrafiyanın məktəb kursunda məhəlşünaslıq və məhəlşünaslıq prinsipi". Bakı: Maarif, 1973, 423 səh.

2. Eminli K. Biliklərin möhkəmləndirilməsində təlimi texniki vasitələrinin rolu. Bakı, 1997, 220 səh.

3. Əliyarzadə R. İKT əsaslı innovativ tədris yanaşmaları // Kurikulum. 2011, № 1, səh. 69-73.

**Ш.Рустамова**

**Применение варианта электронного учебника в учебном процессе**

**Резюме**

В статье речь идет об организации электронного учебного пособия по использованию краеведческих материалов на уроках географии. В рассматриваемой работе автор отмечает важность применения электронного учебного варианта с целью претворения в жизнь образовательной политики и повышения качества образования.

**Sh.Rustamova**

**Applying electron lesson variants in teaching**

**Summary**

This article deals with the application of electron-lesson variants in teaching country study. It is noted that applying electron-lesson variants is useful in realization of education policy and enhancing the quality of education.

***Pedaqoji fikir tariximizdən***

# MƏNƏVİ XƏZİNƏMİZƏ BİR NƏZƏR

**Mehparə Quliyeva**
***Bakı Dövlət Universitetinin dosenti***

***Açar sözlər:*** *H.Cavid, müəlim, valideyn, uşaq, birgə tərbiyə.*
***Ключевые слова:*** *Г.Джавид, учитель, родители, дети, совместное воспитание.*
***Key word:*** *H.Javid, teacher, parents, children, joint education.*

Azərbaycan klassiklərinin əsərlərində mənəvi tərbiyə məsələlərinə dair çoxlu nümunələr vardır. O cümlədən Hüseyn Cavidin bədii irsində də tez-tez tərbiyə məsələlərinə toxunulmuşdur.

Bilik, elm, idrak sahibi olmaq hər şeydən əvvəl tərbiyədən asılıdır. Müdriklik və kamillik dövrünün zirvəsində olan H.Cavid bilirdi ki, uşaqların tərbiyəsi ən vacib problemlərdəndir. Onların həyatının mənasıdır. Platon deyirdi ki, "Yaxşı tərbiyə görmüş insan, yaxşı da oxuyub oynayar".

H.Cavid öz yaradıcılığında dövrünün nadanlığını dərindən dərk edərək xalqın, millətin tərəqqisini məktəbdə, müəllimdə və onun yaxın köməkçisi ailədə görürdü. H.Cavid elmin, müəllimin əvəzsiz rolunu sübut etmək üçün çox ibrətamiz, maraqlı və inandırıcı faktları təhlil edərək göstərirdi ki, dünyada hər bir iş və hərəkət bir qanuna, bir rəhbərə möhtacdır. Rahat və xoşbəxt yaşamaq üçün işləmək, bir peşəyə sahib olmaq vacibdir. Hər bir peşə sahibi yaxşı işləməklə yanaşı, nöqsanlarını da anlayıb sənətində mahir olmalıdır. Belə bir məharəti, qabiliyyəti insanlar ailədən, elmdən və məktəbdən öyrənirlər. Elmi-iqtisadiyyatı bilməyən bir tacir mənfəət yerinə zərər çəkər. Tarixi, fəlsəfəni bilməyən bir xoca hidayət, şəriət yerinə zəlalət toxumu səpər. Təsərrüfat elmindən baş çıxarmayan əkinçi buğda əkərsə çovdar biçər, həndəsə elmini bilməyən memar qübbə qura bilməz.

H.Cavid dövrünün məktəblərini ətalətxana hesab edərək, deyirdi ki, bir çox məktəblərdə müəllimlər vaxt öldürməkdən başqa bir şeyə yaramırlar. Belə müəllimlər daim şagirdləri itaətdə saxlamağa çalışırlar. Dərsləri tutuquşu kimi əzbərlətməyi yeni üsul, yeni metod zənn edib özlərini aldadırlar.

H.Cavid öz konsepsiyasında Con Lokk, Kant və Spenserin tərbiyənin məqsədi haqqında fikirlərini qarşı-qarşıya qoyub belə bir nəticəyə gəlmişdir ki, hər üç filosof yaşadıqları zamana görə bir-birindən xeyli aralı olsalar da, fikirlərinə görə bir-birinə çox bənzəyirlər. Tərbiyə işinin məqsədi insanları bəxtiyar etmək, parlaq və məsud bir həyata hazırlamaqdır. H.Cavid tərbiyənin yaxşı nəticə verməsini, belə bir məqsədin yerinə yetirməsini tərbiyəçilərdə, müəllimlərdə, onların elmi səviyyəsində, təşəbbüslərinin ciddiliyində görürdü. Ona görə həmin məqsədə nail olmaq üçün müəllim "elmi-həyat", "elmi-ruh", "elmi-əxlaq" kimi məsələləri dərindən bilməlidir. Elmi-həyat şagirdlərin yeyib-içmək, gəzib-oturmaq, zəif və qüvvətli olmaq kimi hallarından bəhs edir. Bədənin və bədəndə olan nəşvi-nümanın hansı təsirlə və nə səbəblə dəyişə bilə-

cəyini göstərir.

Elmi-ruh çocuqların fikrini, həyatını, əxlaqını öyrənib bilmək üçün böyük bir vasitədir. Onunla (elmi-ruh ilə) bu təbii halların oyanması, başqa şəklə keçməsinin hansı təsirlərlə dəyişdiyini və nə surətdə tərbiyə və islah ediləcəyi bir dərəcəyə qədər bilmək mümkündür. Elmi-əxlaq isə xeyir və şərin nədən ibarət olduğunu, tərbiyədə necə bir qayə təqib edildiyini və həyatın nə tərəfə sürükləndiyini öyrədir. Bu üç elm fənni tərbiyə üçün mühümdür.

H.Cavid uşaqların fərdi xüsusiyyətlərini, qabiliyyətlərini nəzərə almağı müəllimlərə tövsiyə edirdi. Onun fikrincə, şagirdlərin çöhrə fizionomiyalarına diqqət edilsə, bir-birinə bənzəmədikləri dərhal gözə çarpar. Çöhrələr müxtəlif olduğu kimi, əxlaq və xarakterlər də müxtəlif olur. Bəzi uşaqlar inadcıl, bəziləri həlim, dalğın, kimisi avara, yaramaz, kimisi də düzfikirli və zərif olur. Deməli, müəllim şagirdlərinə tərbiyə verərkən yekrənglikdən qaçmalıdır. Müəllim nəzəriyyə ilə kifayətlənməməli, həm də axtarış aparmalı, istedada da malik olmalıdır.

H.Cavid müəllimlərə valideynlərin də kömək etməsini zəruri sayırdı. Çünki onun fikrincə, ailə tərbiyəsi və bədənin sağlamlığı həyati-bəşəriyyətin əsasını təşkil edir. Övladın sağlam olması ata və analardan asılıdır. Uşaqlara sirayət edən xəstəliklərdən ən dərini fəlakətlərə yol açan analardır. Çocuq tərbiyəsinə diqqət vermək üçün tərbiyə görmüş analar lazımdır. Onlar da məktəblərimizdə yetişdirilməlidir. Vətənin qiymət və əhəmiyyəti, tərəqqi və səadəti də uşaqların düzgün tərbiyəsi ilə bağlıdır.

...Vətənə, millətə, millətin gələcəyinə ağlayacaq, tərəqqisinə çalışacaq olsa-olsa, ancaq ana qucaqlarında, məktəb sıralarında (skamyalarında) çırpınan məsumlar ola bilər. İnsanların doğulub törəməsinə, böyüməsinə qadınlar səbəb olduğu kimi, mənəviyyatca da münəvvərpərvər, tərəqqipərvər olmalarına yenə yeganə vasitə qadınlardır, deməli, tərəqqinin ilk vasitəsi qadın və qızlarımızın tərbiyəsidir.

Qadınların bəşəri cəmiyyətdəki qiymət və əhəmiyyəti bir hikmətli cümlə ilə ifadə edilə bilir ki, Peyğəmbərimizin (s.ə) sözündə ifadə olunmuşdur: "Cənnət anaların ayaqları altındadır". Qızını, oğlunu tərbiyə etməkdə diqqətsizlik göstərən valideyn qanun və əxlaq nəzərində şiddətlə məsul tutulmalıdır. Çünki bəşər cəmiyyəti üçün cinayətkar adam hazırlamış olurlar.

H.Cavid məktəblərdən, müəllimlərdən gənc nəslin təlim və tərbiyəsi qayğısına qalan ata-analar tərbiyə etməyi tələb edirdi. Ona görə də məktəblərin təmiz, müəllimlərin savadlı olması vacibdir. Məktəb binası mümkün qədər günəşli yerlərdə olmalıdır, rütubəti çox olan yerlərdən həzər edilməlidir. Çünki "günəş girməyən yerə təbiblər girər".

H.Cavidə görə, müəllim öz mənəviyyatını, özünün vicdanını təsfiyə və islaha çalışmalıdır. Belə olduqda onun dediyi sözlərin, verdiyi nəsihətlərin faydası ola bilər. Hər söz sahibinin sözü ilk öncə ruhu və vicdanı ilə uzlaşmalıdır. Ürəkdən gələn sözlər ürəyə nüfuz edə bilir. Deməli, sözün təsirli olması üçün söz deyənin, yəni müəllimin və onun yaxın köməkçisi valideynin təmiz qəlbə, parlaq vicdana, gözəl əxlaqa malik olması vacibdir.

Müəllimin uşağı anlayacağı tərzdə bir ata kimi tövsiyə və tənbehləri çox gözəl nəticə verir. Müəllim dinc, namuslu, həlim, səlim bir əfəndi olursa, təbii, dörd-beş il ərzində yalnız bir ibtidai məktəbi deyil, məktəblə əlaqədar olan böyük bir kəndi, kəndin camaatını tamamilə islaha müvəffəq olar.

H.Cavid Qafqazda fəaliyyət göstərən müəllimləri üç qismə bölürdü. O, birinci qismə Arazı keçib gələn fanatizm dəllallarını, ikinci qismə seminariyanı bitirmiş əfəndiləri, üçüncü qismə isə yeni üsulda tərbiyə

görüb müəllimliyə həvəskar olan gəncləri daxil edir və hər bir qisim müəllimləri səciyyələndirərək ən çox üçüncü qisim müəllimlərə üstünlük verirdi. Birinci qisim adamları o, müəllim hesab etmirdi. İkinci qisim müəllimlər rusca təhsil aldıqlarına görə azərbaycanca danışmağa çətinlik çəkir, fikirlərini səlis ana dilində ifadə edə bilmirdilər.

Üçüncü qisim müəllimləri də o, üç qrupa bölürdü. Bir qrup müəllim ibtidai təhsili həm türkcə, həm də rusca almışdır. Onlar çox səylə çalışırlar, lakin sayları lap az, xidmətləri isə çoxdur. Bir hissəsi də vaxtı ilə yalnız mədrəsələrdə işləyib yorulmuş əfəndilərdir ki, indi işin mahiyyətini anlayıb candan, ürəkdən gecəli-gündüzlü çalışıb irəliləmək istəyirlər. Onlar bir tərəfdən türk tarixinə, ədəbiyyata, ana dilinə diqqət edirlər, digər tərəfdən də xüsusi olaraq ruscaya həvəs göstərirlər. Onlar yaşadıqları əsrin mədəniyyətini bilməyərək, yaxud da bilmək istəməyərək azacıq etinasız kimi görünürlər. H.Cavid deyirdi ki, maarifpərvər şəxslərin borcudur ki, hər yerdə onları şirin dil ilə, məhəbbət ilə çalışıb irəliləməyə təşviq etsinlər. Elə buradaca Cavid qeyd edir ki, məhəbbət bəşəriyyətin ən dərin, ən ülvi bir ümidgahıdır.

Cavid müəllimləri uşaqları belə bir məhəbbətlə sevməyə, elmin tərəqqisinə çalışmağa çağırırdı.

H.Cavid xalq üçün elm çırağına dönmüş müəllimləri yüksək qiymətləndirir, A.Surun vaxtsız ölümündən kədərlənir, onun xalq üçün necə şam kimi yanmasından həyəcanlanırdı. H.Cavid yazırdı ki, dəfn mərasimində türk dili müəllimi Əli bəy A.Suru işıqlı bir elm çırağına, uşaqları isə onun (o çırağın) ətrafına dönüb dolaşan pərvanəyə bənzədirdi.

H.Cavid Abdulla Tofiq Surun dəfn mərasimində dərin düşüncələrə dalır, çocuqlara elm öyrədən gənc müəllimin belə vaxtsız ölmünə təəssüflənir, “müəllim kimdir?”, “müəllim nədir?” sualına cavab axtarmağa çalışır. Yapon milləti Mikadonun şərəfinə deyil, yapon müəllimlərinin şərəfinə qədəh qaldırdılar, həm də insanı sərsəm edən, əql və şüurunu məhv edən şərab, raki (vodka) içməyib, ən təmiz, saf və gözəl su içdilər. Yaponiyanın tərəqqisi, maarifpərvərliyi müəllimlər sayəsində olmuşdur.

Bismark da Almaniyanın tərəqqisini müəllimlərdə görür, onlardan gözləyirdi. Harun ər-Rəşid bir müəllim üçün, əvət, yalnız bir hikmət və riyaziyyat müəllimi əldə etmək üçün Bizans hökuməti ilə böyük müharibə etmiş, qalib gəldikdən sonra təzminatı-hərbiyyə olaraq yenə müzkur müəllimi əldə etmişdir. Romalılar vaxtı ilə müharibələr zamanı əsirlər içərisindən ən alim və zəki adamları öz uşaqları üçün müəllim təyin edərmişlər. H.Cavid bu kimi tarixi faktlarla müəllimin rolunu, böyüklüyünün təsdiqinə çalışır və deyirdi ki, bizlərdə mühitimizdəki müəllimlərin qədri, heysiyyəti, halı-məişəti nəzərə alınsa, insan ağlamaqdan özünü saxlaya bilməz.

Ata-anası bir-iki çocuğun nazını çəkə bilmədiyi halda, müəllim müxtəlif psixoloji xassələrə, tərbiyəyə malik yüzlərlə millət balalarının nazını çəkib, səs-küyünə, qışqırığına səbr etməli, dözməlidir. H.Cavid müəllimlərə müraciətlə deyirdi: “Ey müəllimlər, ey möhtərəm əfəndilər! Sizlər millətimizin, mühitimizin bu etinasızlığına diqqət verməyin. Daima çalışın ki, millət, vətən uğrunda canınızdan keçmək belə lazım gəlsə əsirgəməyiniz”.

H.Cavid məktublarında da müəllimə, müəllim hazırlığı məsələlərinə diqqət yetirmişdir. M.T.Sidqiyə məktublarında bu məsələyə daha çox yer vermişdir. Müəllimin şagirdlərə qayğıkeşliyi onun böyüklüyünü azaltmaz.

H.Cavid M.T.Sidqiyə “böyük ustad və cəlallı atamız”, - deyə müraciət edir, ondan sədaqətlə kiçiyinin ürək məhəbbətini və

mənəvi münasibətlərini onun tərcümeyi-hal və şərh-əhvalında qeyd edərək öz tükənməz məhəbbəti və mərhəməti ilə onu yad etməsini xahiş edirdi.

H.Cavid XX əsrin əvvəllərində Azərbaycanda yaranmış milli intibahı, dirçəlişi, demokratik və humanist tələbləri, milli özünüdərki böyük bir məhəbbətlə təqdir etməklə yanaşı, cahilliyi, xurafatı, avamlığı kəskin tənqid atəşinə tutmuş, bu milli sosial bəlalardan çıxış yolunu elmdə, təhsildə, maarif və tərbiyədə, ən başlıcası isə ziyalı, savadlı adamların yetişdirilməsində görürdü. Ümumiyyətlə, H.Cavidin konsepsiyasında “Sürüklənən bəşəriyyətin qadınla yüksələcəyi” ideyası əsas yer tutur və buna görə də cəmiyyətin özülü, bünövrəsi olan ailədə qadının – ananın roluna yüksək qiymət verir.

H.Cavid ailədə uşaqların düzgün tərbiyə edilməsini onlara valideyn qayğısında görür və deyirdi ki, uşaqları təmiz, saf və açıq havada gəzdirmək, sərbəstliyinə mane olmamaq lazımdır. H.Cavid valideynləri uşaqlara ana dilini öyrətməyə çağırır. H.Cavid fikirlərini ümumiləşdirib belə bir qənaətə gəlir ki, tərbiyənin yaxşı nəticə verməsi tərbiyəçilərin, valideynlərin, müəllim əfəndilərin bilik səviyyəsi və birgə işi ilə bağlıdır.

*Rəyçi: dos. S.Hüseynoğlu*

### İstifadə edilmiş ədəbiyyat

1. H.Cavid. Seçilmiş əsərləri. I-IV cild, Bakı, 1982-1985.
2. M.Əlioğlu. H.Cavidin romantizmi, 1979.
3. M.Cəfər. Hüseyn Cavid. 1960.

**М.Кулиева**

### Взгляд на духовные ценности

### Резюме

По словам Гусейна Джавида, педагог должен направлять все свои знания и морально-духовные качества на совершенствование образования. Только в этом случае может быть польза от высказанных им нравоучений и назиданий. Слово педагога должно, прежде всего, соответствовать его духу и совести. Слова, исходящие из сердца, способны воздействовать на сердца. Следовательно, сила воздействия слова напрямую зависит от чистосердечности, высоких нравственно-этических качеств педагога и родителей.

**M.Guliyeva**

### New glance to moral treasure

### Summary

According to Hussein Javid teacher should direct all his knowledge and morally-spiritual qualities to education. Only in this case moral edifications must be efficient. Teacher’s word first of all should correspond to his (her) spirit and conscience. The words which are starting from heart are capable to influence hearts. And force of a word influences directly depends on frankness, high moral-ethical qualities of teacher and parents.

*Tərbiyə məsələləri*

# ÖYRƏNMƏYİ ÖYRƏTMƏK ƏSAS VƏZİFƏDİR

**Akif Xalıqov**
***Lənkəran şəhəri 6 nömrəli məktəb-liseyin direktoru, pedaqogika üzrə fəlsəfə doktoru, əməkdar müəllim***

***Açar sözlər:*** *müəllim, şagird, təlim prosesi, dərsin didaktik məqsədi, pedaqoji və psixoloji qabiliyyət, pedaqoji təsir vasitələri.*

***Ключевые слова:*** *учитель, ученик, учебный процесс, дидактическая цель урока, педагогическая и психологическая способность, педагогические средства вмияния.*

***Key words:*** *teacher, student, teaching process, didactic aim of the lesson, pedagogical and psychological ability, means of pedagogical influence.*

Yeni texnologiyalar əsri olan XXI əsrdə ümumtəhsil məktəbinin başlıca vəzifəsi yüksək intellektual hazırlığa malik olan, qazandığı biliklərdən istifadə etməyi bacaran, dünyagörüşü hərtərəfli inkişaf etmiş, milli və ümumbəşəri mənəvi keyfiyyətlərə yiyələnmiş şəxsiyyətin, əsl vətəndaşın yetişdirilməsindən ibarətdir. Ölkəmizdə tədris prosesinin təşkilinin yeni, daha səmərəli formalarının tətbiq edilməsi də bu məqsədə xidmət edir. Təhsilin keyfiyyətini yüksəltmək və onun dinamik inkişafını təmin etmək üçün yeni pedaqoji texnologiyalardan, yeni təlim metodlarından istifadəyə üstünlük verilir. Təqdirəlayiq haldır ki, müəllimlər yeni axtarışlara qoşulur, işini müasir dərsə qoyulan tələblər səviyyəsində qurmağa çalışırlar.

İnkişaf etmiş ölkələrin təhsil təcrübəsinə nəzər salsaq görərik ki, məktəbdə hər bir dərsə şagirdlər üçün, sözün əsl mənasında, təfəkkür və intellekt məkanı kimi baxılır. Bu məqsədlə müasir təlim metodlarının, interaktiv təlim texnologiyalarının düzgün və məqsədyönlü tətbiqi başlıca şərt hesab edilir. Əgər ənənəvi dərs üsulunda əsas biliklər müəllim tərəfindən verilirdisə, interaktiv təlimdə üstünlük şagirdlərə verilir. Şagirdlər daim axtarışda olur, fikirlərini aydın şəkildə ifadə etməyə, əldə etdikləri bilik və bacarıqların düzgün tətbiqinə çalışırlar.

Tədris prosesində müəllimlərin qarşıya qoyduğu məqsədin aydın və sadə, şagirdlərin başa düşəcəkləri səviyyədə olması vacib şərtdir. Tələbyönümlülük, şəxsiyyətyönümlülük və nəticəyönümlülük prinsipləri əsasında qurulan dərslər daha çox səmərə verir. Şagirdlərin maraqları əsasında qurulan bu cür dərslər onlara yeni-yeni biliklər qazanmaqda, qarşıya qoyulmuş problemin həllini axtarıb tapmaqda, uğurlu nəticələr əldə etməkdə yardımçı olur. Belə dərslər uzun müddət şagirdlərin hafizəsindən silinmir.

İslahatın tələblərindən irəli gələn vəzifələrin müvəffəqiyyətlə həyata keçirilməsində müəllimlərin üzərinə çox böyük məsuliyyət düşür. Nəzərə almaq lazımdır ki, gələcəyimiz olan gəncləri milli adət-ənənələr ruhunda tərbiyə etmək, onları müasir elmi-pedaqoji biliklərlə silahlandırmaq üçün, ilk növbədə müəllimin özü yeniliyə hazır ol-

malı, dünyada baş verən prosesləri izləməli, innovasiyaların mahiyyətini düzgün dərk etməli, şagirdlərin yüksək savadı və mənəvi yetkinliyi uğrunda çalışmalı, sistemli elmi axtarışlar aparmaqla daim öz üzərində işləməlidir.

İnkaredilməz həqiqətdir ki, intellektual potensiala, yüksək mənəviyyata, geniş erudisiyaya, milli-mənəvi dəyərlərə malik müəllimi olan xalq tarixin müxtəlif mərhələlərində üzləşdiyi çətinliklərdən çıxmaq üçün həmişə özündə qüvvə və iradə tapa bilib. “Siz bilik öyrədən adamı böyük sayın”,- deyən Məhəmməd Peyğəmbər biliyi bilməyənlər arasında yaymağı ən böyük savab kimi dəyərləndirib. Böyük mütəfəkkir N.Tusinin də müəllimlik peşəsi ilə bağlı fikirləri olduqca aktualdır: “... bu dünyadakı mövcudatın ən şərəflisi olan insanı kamilliyə çatdırmaq məqsədi güdən sənət dünya sənətlərinin ən şərəflisi olmalıdır”. Böyük mütəfəkkirlər tərəfindən əməyinə həmişə bu cür yüksək qiymət verilən, gənc nəslin maariflənməsi, təlim-tərbiyəsi işi ilə məşğul olan müəllimlər cəmiyyətin inkişafında insan amilinin rolunu nəzərə alaraq dövrün tələbinə uyğun mənəvi–psixoloji iqlimin sağlamlaşdırılmasına xüsusi diqqət yetirmişlər. Müəllimin təlim-tərbiyə prosesində əsas sima olması artıq bütün pedaqoqlar tərəfindən öz təsdiqini tapmışdır.

Hər dövr müəllimin qarşısında yeni tələblər qoyur, ondan zamanın tələblərinə uyğun olaraq müasirləşməyi, yüksək mənəvi-əxlaqi keyfiyyətlərə malik olmağı tələb edir. Müasir dövrün şagirdləri bu gün informasiya-kommunikasiya texnologiyalarının ən müasir yeniliklərindən xəbərdardırlar. Deməli, onların müəllimləri də müasirləşməli, yenilikçi olmalıdır. Müəllimlik işi pedaqoji ədəbiyyatlarda şərəfli, məsuliyyətli, yaradıcı, çətin və mürəkkəb iş kimi səciyyələndirilir, pedaqoji fəaliyyətdə müəllimin şəxsiyyəti yüksək qiymətləndirilir. Onun başlıca keyfiyyətləri sırasında yüksək intellekt, əqidə, mədəniyyət və mənəviyyat, dərin bilik, erudisiya, fənni, peşəsini və yetirmələrini sevmək, yüksək nüfuz sahibi və uşaqlara nümunə olmaq kimi keyfiyyətlər qeyd olunur. Deməli, XXI əsrin müəllimi tədris etdiyi fənnin nəzəri əsaslarını dərindən bilməklə yanaşı, dünyada gedən sürətli inkişaf tendensiyalarını düzgün qiymətləndirməyi bacarmalı, elmi-texniki və ictimai-sosial tərəqqi ilə ayaqlaşmalı, uşaq və gənclərin psixologiyasına yaxşı bələd olmalı, öz fəaliyyətinə yaradıcı yanaşmalı, peşəkar olmalıdır. O, şagirdlərin müstəqil, yaradıcı təfəkkürünün, idrak qabiliyyətinin inkişafına qayğı göstərməlidir.

Müasir dövrdə gənc nəslin elmi dünyagörüşü onun hərtərəfli hazırlığı, məntiqi gücü ilə bərabər emosional təsir gücü ilə də səciyyələnir. Gənc nəslin həyata, cəmiyyətə, informasiyaların qavranılmasına yanaşma tərzi yeni çalarlar kəsb edir. Nəzərə almaq lazımdır ki, elmi-texniki inkişafın, qloballaşma prosesinin sürətləndiyi bir vaxtda köhnə metodlarla işləmək yolverilməzdir. Deməli, müəllimin özünün yeni yanaşmalarla və ideyalarla işləməyə hazır olması zamanın tələbidir. Əgər müəllim həm öyrətmək, həm də öyrənmək səriştəliliyinə malik olarsa, qarşıya qoyulan məqsədə çatmaq da asan olar. Pedaqoji ədəbiyyatlardan da məlum olduğu kimi, müəllim təqlid və ya nümunə modelidir, gənc nəslin öz gələcəyinə baxdığı pəncərədir. Bu səbəbdən şagirdlər müəllimin yeniliyə, öyrənməyə və öyrətməyə nə dərəcədə həvəsli olduğunu görür, öz fəaliyyətlərini buna uyğun qurmağa səy göstərirlər.

Təhsil islahatının aparıldığı bir vaxtda şagirdləri motivləşdirmək daha çox aktuallıq kəsb edir. Çünki motiv və ya niyyət insanı müəyyən hərəkətə yönəldən qüvvədir, belə demək mümkünsə, öyrənmək arzusunu həyata keçirən enerjidir. İstənilən nəticəni

əldə etməkdən ötrü bu enerjini hərəkətə gətirmək vacibdir. Fənnə maraq oyatmaq, şagirdlərin mövzuya bələdləşməsini həyata keçirmək müəllim üçün çox önəmlidir. Motivasiya insan fəaliyyətinə istiqamət verən ən mühüm amillərdən biridir. Bu da sübut olunmuşdur ki, şagirdlərin potensialını gerçəkləşdirməyə imkan yaratmaqla, istedadlarını, qabiliyyətlərini aşkar etməyə kömək göstərməklə onların həyatını dəyişmək, özünəinam hissini gücləndirmək olar. Belə olduğu təqdirdə onlar öz qabiliyyətlərini asanlıqla üzə çıxara bilərlər. Müəllim üçün şagirdinin emosiyalarını duymaq, onu başa düşmək çox önəmlidir. Ən çətin situasiyalarda belə müəllimin üzündə təbəssüm olmalıdır. O, hər bir arzuolunmaz hadisələrdə də müsbət cəhətləri görməlidir. Nəzərə almaq lazımdır ki, şagirdlərin bəzilərində müşahidə olunan aqressiya və neqativ münasibətlərin kökləri var. Müəllim bunu diqqət mərkəzində saxlamaqla hər bir vəziyyətdə sakitliyi və özünənəzarəti təmin etmiş olar. Tələsik cəza vermək çıxış yolu deyil, əksinə, təmkinli olmaq, düşünərək qərar vermək daha güclü tərbiyəvi təsir göstərir. Əsl müəllim uşaq qəlbinə humanizmi ilə nüfuz etməklə öz şərəfli vəzifəsini yerinə yetirir, şəxsi nümunəyə çevrilir.

Təlim-tərbiyənin səviyyəsinin yüksəldilməsinə müəllim-şagird münasibətlərinin düzgün qurulmasının güclü təsiri vardır. Bu zaman bir sıra amillər nəzərə alınmalıdır. İlk növbədə müəllim yetirmələrinə biliyi mexaniki şəkildə ötürməməlidir. O çalışmalıdır ki, uşaqlar təlimdə fəallıq göstərsinlər. Müəllim özünü şagirdinə tədris etdiyi fənni nəzəri və praktik cəhətdən mükəmməl səviyyədə bilən insan kimi tanıtmağı bacarmalıdır. Müəlliminə nümunə kimi baxan şagirdin aldığı tərbiyə və bilik də güclü olur.

Təlim prosesində rast gəlinən çətinliklərin düzgün diaqnozu müəllimin pedaqoji bacarığından asılıdır. Şagirdlərin fikir və düşüncələrinə hörmətlə yanaşmaq, onlara düzgün istiqamət vermək hər bir müəllimin peşə borcudur. Təşkilatçılıq bacarığı vaxtdan səmərəli surətdə istifadə, planlı şəkildə hərəkət etməkdə önəmli yer tutur. Şagirdlərin təsəvvürlərində yaratdıqları müəllim obrazını öyrənmək üçün aparılan sorğulardan belə nəticəyə gəlmək olar ki, əksər uşaqlara görə əsl müəllim dərs prosesində müasir təlim metodlarından, informasiya - kommunikasiya texnologiyalarından düzgün və səmərəli istifadə edən müəllimdir. Bu, həqiqətən belədir. Ona görə ki, İKT-nin tədris prosesinə tətbiqi bu gün informasiyalı cəmiyyətin, qloballaşan dünyanın zəruri tələblərindən və ehtiyaclarından irəli gəlir. Müasir texnologiyalardan istifadə yeni ünsiyyət formalarını meydana çıxarır ki, bu da “müəllim-şagird”, “şagird-şagird“ əməkdaşlığının tənzimlənməsi üçün çox əlverişlidir.

Müəllimlər bəzi hallarda şagirdlərin dərslərdə sakitliyə riayət etməmələrindən şikayətlənir, şagirdlər isə bunu fənnə qarşı marağın olmaması və ya dərsin cansıxıcı olması ilə izah edirlər. Amma, əslində, bunun əsas səbəbi kimi müəllimlərin tədris prosesində ənənəvi metodlardan istifadəyə üstünlük vermələrini göstərmək olar. Halbuki müasir müəllim şagirdlərin yaradıcılıq qabiliyyətlərinin inkişafı üçün şərait yaratmalı, onlara müstəqil düşünməyi öyrətməli, “öyrənməyi öyrətmək” qabiliyyətini formalaşdırmalıdır. Gənc nəslin təlim-tərbiyəsi işi ilə məşğul olan pedaqoji kollektiv yeni dövrün nəbzini tutaraq mənəvi–psixoloji iqlimin sağlamlaşdırılmasına nail olmalıdır.

Dünyada baş verən sürətli inkişaf prosesində müəllimin öz vəzifəsini lazımi tələblər səviyyəsində yerinə yetirməsi onun nəzəri hazırlığından, yetkinliyindən, yenilikləri qəbul etmək səriştəliliyindən asılıdır. Qloballaşmanın geniş vüsət aldığı bir dövrdə tədris etdiyi fənnin əsaslarını bilməklə

bərabər müasir vəziyyəti, ictimai-sosial tərəqqini dərk edən, bu tərəqqidə tədris etdiyi fənnin rolunu qiymətləndirməyi bacaran, öyrətdikləri uşaq və gənclərin psixologiyasına yaxşı bələd olan, öz fəaliyyətinə yaradıcı yanaşan müəllimin işi səmərəli ola bilər.

İnkişafa və tərəqqiyə nail olmaq üçün dərsin təşkili zamanı elə metodları seçib tətbiq etmək lazımdır ki, öyrənənlərin müstəqil təfəkkürünün inkişafına şərait yaratmaq, idrak qabiliyyətini inkişaf etdirmək mümkün olsun. Ona görə də daim yeni üsullar, ideyalar, sistemlər və yanaşmalar axtarışında olmalıyıq. İnteraktiv metodları öyrənib təlim prosesində düzgün tətbiq etməyi bacarmalıyıq. İnteraktiv təlim metodları dedikdə, müzakirə metodları, məntiqi təfəkkürün inkişafına yönəldilən metodlar, beyin həmləsi metodları, təşkilati metodlar və s. nəzərdə tutulur. Yalnız fəal təlim metodlarından istifadəyə xüsusi diqqət yetirən, qabaqcıl ölkələrin təhsil sistemindəki mütərəqqi üsul və metodlardan xəbərdar, daim yenilik axtarışında olan və qazandıqları nəzəri bilikləri praktik fəaliyyətə çevirə bilən müəllim yenilikçi müəllim kimi yetirmələrinin sevimlisi ola bilər. Yaradıcı olmaq müəllim üçün önəmli xüsusiyyətdir.

Bu da önəmlidir ki, müəllim şəxsi problemləri sinfə gətirməməli, hiddət və şiddət kimi ünsürlərdən uzaq durmalı, şagirdlərlə humanist rəftar etməli, cəmiyyətdə nüfuza malik olmalı, yüksək təhsillə yanaşı, müasir texnologiyalardan istifadəni bilməlidir. Belə olarsa, gələcəyimiz olan məktəbliləri milli adət-ənənələr ruhunda, qloballaşmaqda olan dünyanın tələblərinə cavab vermək əzmində hazırlamaq, əsl vətəndaş kimi yetişdirmək mümkün olar.

*Rəyçi: p.e.d. İ.Novruzlu*

**İstifadə edilmiş ədəbiyyat**

1. Rzayev O. və b.Təhsilin idarə olunmasının əsasları. Bakı: Mütərcim, 2010.
2. Əliquliyev R., Mahmudova R. Şəxsiyyətin informasiya mədəniyyətinin formalaşdırılmasında təhsil sisteminin vəzifələri. //Azərbaycan məktəbi, 2012, № 2.
3. Veysova Z. Fəal/interaktiv təlim. Bakı, 2007.
4. Ağayev Ə. Ənənə və müasirlik. Bakı: Adiloğlu, 2006.

**А.Халыгов**

**Учить учиться - главная задача**

**Резюме**

В статье говорится о важности педагогического мастерства в вопросах учебы и воспитания. Также показывается роль научно-педагогической подготовленности, личных качеств учителя в этом деле. Отмечается, что работающий с новыми технологиями учитель получает высокие результаты.

**A.Xaligov**

**Main duty is teaching learning**

**Summary**

In the article it is spoken about the influence of teacher’s pedagogical mastery on the quality of education. It is noted that the teacher who works with new teaching technology achieves more results. The author recommends teachers to meet the demands of new reform. Because teachers’ main goal is to form personality, and it depends on the pedagogical mastery and creativity of teachers.

# GƏNC NƏSLİN HƏYATA HAZIRLANMASINDA MƏKTƏBİN ROLU

**Rəcəb Ağayev**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***Naxçıvan Dövlət Universitetinin dosenti***

***Açar sözlər:*** *ahəngdar inkişaf etmiş, sağlam düşüncə, kamil şəxsiyyət, düşündürərək öyrətmək, düşündürərək tərbiyələndirmək, düşündürərək inkişaf etdirmək.*

***Ключевые слова:*** *гармоничное развитие, здоровое мышление, совершенная личность, учить мыслить, воспитание мышления, развитие мышления.*

***Key words:*** *harmonically developed, thinking, a perfect personality, teaching thinking, teaching upbringing, making a good citizen.*

Ahəngdar inkişaf etdirilmiş, hərtərəfli inkişafa malik, kamil şəxsiyyət və habelə xalqımıza,vətənimizə gərəkli vətənpərvər övladların formalaşdırılmasında şagirdləri düşündürərək öyrətmək, düşündürərək əqli mühakimələr yürütdürmək zəminində, şüurluluq əsasında təhsilləndirmək, tərbiyələndirmək, psixoloji inkişaflarına nail olmaq, günün, zamanın tələbləri ilə səsləşən ən optimal təlim-tərbiyə fəaliyyətinə elmi-pedaqoji baxımından müasir yanaşma yoludur. Bu yol müasir şəraitdə təlim-tərbiyə işində şagirdlərin təhsillənməsində, tərbiyələnməsində psixoloji inkişafa nail olmalarına real zəmin yaratmış olur. Şagirdləri düşündürərək təlim-tərbiyə işinə yeni müasir yanaşma yolundan düzgün, məqsədyönlü şəkildə istifadə etdirmək üçün hər bir müəllim insani fəaliyyət olan yüksək, sağlam düşüncə tərzinə, mənəvi ünsiyyət mədəniyyətinə, metodik ustalığa, fənni ilə bağlı bilik, bacarıq vərdişlərinə, yüksək intellektual mənəvi mədəniyyətinə malik olmalıdır. Məktəbin direktoru, onun müavinlərindən tutmuş pedaqoji kollektivin hər bir üzvü yaxşı bilməlidir ki, təhsilin baza sənədlərinə (tədris planı, tədris proqramı, dərslik) müvafiq şəkildə şagirdlərə bilik, bacarıq, vərdişlər aşılamaq, unutqanlığın qarşısını almaq, şəxsiyyət bütövlüyünü təmin edən tərbiyə komponentləri (əqli, əxlaqi, fiziki, estetik, ideya-siyasi, iqtisadi, hüquqi, ekoloji) baxımından yüksək səviyyədə tərbiyəvi təsir göstərmək üçün onları şüurlu fəaliyyət göstərməyə səfərbər etmək, onlarda müstəqil şəkildə düşünmək, yaradıcı fəaliyyət göstərmək, əqli nəticələrə gəlmək qabiliyyətlərini inkişaf etdirmək nəinki vacibdir və hətta zəruridir. Pedaqoji kollektivin hər bir üzvü yaxşı bilməlidir ki, şüurlu, düşüncəli fəaliyyət şagirdləri təhsilləndirici, tərbiyələndirici və habelə inkişafetdirici təlimə qəlbən, ruhən yönəldir, səfərbər edir. Təlim təhsilləndirici (bilik, bacarıq, vərdişlər aşılamaq), tərbiyələndirici (tərbiyə komponentləri baxımından), inkişafetdirici (psixoloji inkişaf baxımından) vəzifələr daşıyır. Bu vəzifələrin müvəffəqiyyətli həlli də müəllimdən ixtisası ilə bağlı yüksək bilik, bacarıq, vərdişlər, metodik ustalıq, intellektual səviyyəli mədəniyyət, sağlam düşüncə, təfəkkür qabiliyyəti tələb edir. Hər bir məktəb rəhbəri, hər bir müəllim qarşısında duran təlim-tərbiyə vəzifələrini müasir tələblər səviyyəsində müvəffəqiyyətlə, emosionalcasına yerinə yetirmək üçün fasilələrə yol vermədən öz üzərində daima işləməli, axtarıcı, yaradıcı fəaliyyət göstərməlidir. Müəllim bilməlidir ki, intellektual səviyyəli dünyagö-

rüşünə, düşüncə tərzinə, mənəvi zənginliyə malik olmadan xalqımız, vətənimiz üçün gərəkli, kamil şəxsiyyətlər formalaşdırmaq qeyri-mümkündür. Onu da bilməliyik ki, bütün tarixi dövrlərdə xalqı irəli aparmağa, sabitlik yaratmağa, nahaq qan tökülməsinin, çoxçalarlı çətinliklərin qarşısını almağa qadir kamil, böyük şəxsiyyətlərə xalqımızın ehtiyacı olmuşdur və hələ də vardır. Bu ehtiyacın ödənilməsi məktəbdə aparılan təlim-tərbiyə işinin yaxşı, düşünülmüş şəkildə, məqsədyönlü qurulması ilə daha çox bağlıdır. Türk xalqının böyük oğlu, böyük şəxsiyyət, Azərbaycan xalqının sevinci sevincimiz, kədəri kədərimizdir söyləyən Mustafa Kamal Atatürk xatırlatmışdır ki, böyük şəxsiyyətləri olmayan millət iqtisadi cəhətdən nə qədər inkişaf etmiş olsa belə, müəyyən fəlakət və sarsıntı qarşısında məhv olub gedər. Böyük şəxsiyyətlərin formalaşdırılmasında düşünülmüş, məqsədyönlü qurulmuş təhsilin özünəməxsus rolu, dəyəri vardır. Əgər biz gələcəyimizi xoşbəxt görmək istəyiriksə, təhsil ocaqlarında, təlim-tərbiyə prosesində yaradıcı şəkildə düşünən, mühakimə yürüdən, vətənini, xalqını qəlbən, ruhən sevən, intellektual səviyyəli gənclərin formalaşdırılmasına fasilələrə yol vermədən yüksək diqqət və qayğı göstərməliyik. Təlim-tərbiyə prosesində şüurluluğun, düşüncəli fəaliyyətin təmini şagirdlərin ahəngdar şəkildə kamil şəxsiyyət kimi formalaşmasına öz müsbət təsirini göstərir. Ümummilli liderimiz Heydər Əliyev demişdir ki, təhsil millətin gələcəyidir, ən qiymətli, əvəzolunmaz milli sərvətimizdir. Onu da bilməliyik ki, elmi-texniki inkişaf əsrində–kompyuter əsrində şagirdlərə bilikləri hazır şəkildə çatdırmaqla kifayətlənmək olmaz. İnformasiya axınının yüksəldiyi müasir dövrdə övladlarımız əvvəlki əsrlərlə müqayisədə çox böyük inkişaf yolu keçmişdir. Buna görə də şagirdlərə sağlam düşüncə əsasında öyrənməyin yollarını öyrətməliyik, onları təlim prosesində müəllimlə səmimi ünsiyyətə girərək əməkdaşlıq etməyə səfərbər etməliyik. Bunun üçün hər bir müəllim sözün həqiqi mənasında öz fənnini, ona aid əlavə ədəbiyyatı, onun metodikasını dərindən bilməklə yanaşı, təlim-tərbiyəsi ilə məşğul olduğu şagirdlərin fərdi psixoloji xüsusiyyətlərini bilmək əsasında onlarla mənəvi ünsiyyətə girmək, qəlblərində məhəbbət tonqalı şölələndirmək, inteqrativ təlim üsullarından metodik ustalıqla istifadə etmək mədəniyyətinə, səriştəliliyinə, qabiliyyətinə malik olmalıdır. Öyrənilən məsələlərlə bağlı hər bir adam özündə fikir, mülahizə aydınlığı yaratmaq üçün beyin fəaliyyəti olan düşüncəyə, təfəkkür fəaliyyətinə geniş yer verməlidir. Hər bir şəxs yaxşı bilməlidir ki, sağlam düşüncəyə sahib olmaq üçün qazanılan elmi bilik, bacarıq və vərdişlərin rolu, dəyəri xeyli böyükdür. Onu da xatırlatmağı vacib sayıram ki, sağlam düşüncə qabiliyyəti müəllim üçün də, şagird üçün də gərəkli, əvəzolunmaz mənəvi keyfiyyətdir. Bu insani keyfiyyətə sahib olmadan elmi bilik, bacarıq və vərdişlərə əsaslı şəkildə yiyələnmək, yiyələndirmək, şagirdlərdə unutqanlığın qarşısını almaq qeyri-mümkündür. Hər bir insanın, o cümlədən əsasən məktəblilərin mənimsəyərək yiyələndikləri elmi biliklərlə bağlı bilik, bacarıq və vərdişlər sağlam düşüncənin mənbəyidir. İnsanda formalaşan bilik və sağlam düşüncə bir-birini tamamlayır, biri-birinin təkamülünə, formalaşmasına, inkişafına yaxından kömək və yardım göstərir. Məhəmməd peyğəmbərin xatırlatdığı kimi, hər bir insan fasilələrə yol vermədən beşikdən qəbirədək elmi biliklərə və habelə sağlam düşüncə tərzinə dərindən yiyələnməyə cəhd və təkid göstərməlidir. Qazanılan elmi biliklər düşüncənin hərəkətə gətiricisi, nizamlayıcısı olmaqla yanaşı, xoş arzulara, istəklərə çatmağın, qovuşmağın açarıdır. Sağlam düşüncə şagirdləri axtarıcı, yaradıcı fəaliyyətə cəlb edir, onu insanlığa

sığmayan əməllərdən, hərəkətlərdən kənarlaşdırır və habelə ülvi hislərlə yaşayıb–yaratmağa, inkişafa nail olmağa səfərbər edir. Pedaqoji kollektivlərin hər bir üzvü başa düşərək bilməlidir ki, müstəqil şəkildə həm əqli, həm də fiziki cəhətdən yaradıcı əməklə məşğul olacaq hər bir gənc ümumtəhsil məktəbində formalaşaraq, müstəqil fəalliyyət göstərməyə vəsiqə alaraq, müasir həyata qədəm qoyurlar. Hər bir peşə sahibi dərin, çoxçalarlı elmi biliklərə, yaradıcı şəkildə düşünməyə ehtiyac duymuş, duyur və duyacaqdır. Bu ehtiyacı, bu tələbatı düşündürərək öyrətmək, tərbiyələndirmək, psixoloji inkişafa nail olmaq qabiliyyətinə, mədəniyyətinə, səriştəliliyinə malik olan müəllimlər müvəffəqiyyətlə yerinə yetirə bilərlər.

Təlim prosesində əsaslı, şüurlu şəkildə bilik, bacarıq və vərdişlərə yiyələnmək, mənən zənginləşmək, psixoloji baxımdan inkişafa nail olmaq müəllimin sağlam düşüncə, təfəkkür fəaliyyəti, fənnini dərindən bilməsi, metodik ustalığı ilə daha çox bağlıdır. Bu cəhətdən məktəb pedaqoji kollektivlərinin hər bir üzvü apardığı təlim-tərbiyə işinin şagirdlərin özünütəhsili və özünütərbiyəsi, özünüinkişafı ilə nəticələnməsinə xüsusi səy, təlaş və cəhd göstərməlidir. Bilməliyik ki, təhsilin ən yüksəyi özünütəhsil, tərbiyənin ən yüksəyi özünütərbiyə və habelə inkişafın ən yüksəyi özünüinkişafdır. Çünki bu prosesdə öyrədən və öyrənənin fəaliyyəti bir orqanizmdə cəmləşmiş olur. Bunun üçün uşaqlara yaş, bilik, anlam səviyyələrinə müvafiq şəkildə başa salınmalıdır ki, güc hər şeyə qalib gələ bilirsə də, elm və onun əsasında yaranmış sağlam düşüncə gücə qalib gəlir. Dahi Nizami Gəncəvinin xatırlatdığı kimi, "qüvvət elmdədir, başqa cür heç kəs, heç kəsə üstünlük eyləyə bilməz". Onu da bilməliyik ki, insanın ağlı sağlam düşüncə əsasında təlim prosesində qazandığı elmi biliklər, bacarıqlar, vərdişlər əsasında münbitləşərək zənginləşir. Ağıl arzulara, istəklərə çatmağın, qovuşmağın açarıdır və habelə səbəbkarıdır. Ona görə də ağıl şəxsiyyət bütövlüyünün təminində birinci yerdə durur. Həzrəti Əli öz sağlığında xatırladırdı ki, ən qiymətli mal ağıl, ən gözəl dost gözəl xasiyyət, ən qiymətli miras ədəb, ən xeyirli yol – həqiqət yolu, ən böyük şərəf elmdir. Təhsilin məzmunu təhsil müəssisəsində həyata keçirilən pedaqoji prosesdə reallaşır" (1, s.11). Təhsil pedaqoji prosesin ayrılmaz tərkib hissəsidir. Təhsil müəssisələrində şagirdlərin sağlam düşüncə əsasında təhsillənməsinin günün, zamanın tələbləri səviyyəsində reallaşdırılmasına nail olmaq üçün yeniliklərdən bacarıqla, metodik ustalıqla istifadə etmək lazımdır. "Təhsil sistemində yeniləşmə əsasən üç istiqamətdə aparılır: təhsilin humanistləşdirilməsi, diferensiallaşdırılması, inteqrasiya edilməsi" (2, s.17).

Təhsil sistemində yeniləşmə vasitəsi kimi dəyərləndirilən humanizm latın sözüdür, humanis sözündən götürülmüşdür. Lüğəti mənası insani, bəşəri deməkdir. İnsani, bəşəri keyfiyyətlərə malik uşaqlar formalaşdırmaq üçün müəllim özü, ilk növbədə, insani, bəşəri keyfiyyətlərə malik olmalıdır. Həyat gör-götür dünyasıdır. Müəllimin insani, bəşəri keyfiyyətlərə malik olması onun şagirdlərlə mənəvi ünsiyyətə girməsi, şagirdləri onunla təlim prosesində əməkdaşlıq etməyə dəvət etməsi işinin keyfiyyətini yaxşılaşdırır. Müəllimdə ünsiyyət mədəniyyətinin yüksəkliyi təlimin həm təhsilləndirmə, həm də tərbiyələndirmə mədəniyyətini yüksəltmiş olur. Böyük rus pedaqoqu K.D. Uşinski xatırladırdı ki, şagirdlərlə səmimi, mənəvi ünsiyyətə girmədən onlara tərbiyəvi təsir göstərmək mümkün deyildir.

Təhsilin müasir tələblər səviyyəsində, müasir yanaşma əsasında, düşündürülərəkdən aşılanmasında, formalaşdırılmasında təhsillənmədə yenilik kimi dəyərləndirilən diferensial təlimin də rolu, dəyəri xeyli böyükdür. Diferensial təlim prosesində şagird-

lərin maraq və meyilləri, istək və arzuları daha əhatəli şəkildə nəzərə alınır. “Diferensial təlim–orta ümumtəhsil məktəbinin yuxarı siniflərində dərs planları və proqramlarının istehsalat hazırlığı istiqamətinə müvafiq olaraq müəyyənləşdirilməsi ilə daha çox bağlıdır. Məktəblilərin dövlət təhsil sisteminə uyğun komplektləşdirilməsi şagirdlərin meyil və marağı nəzərə alınmaqla həyata keçirilir. Dövlət təhsil məktəblərində şagirdlər istehsalat hazırlığı və şagirdlərin ixtisas üçün nəzəri əhəmiyyəti olan fənləri daha geniş öyrənməklə yanaşı, tədris planı üzrə tam orta təhsil alırlar” (5, s.379).

Təhsilin yeniləşməsində, təlim prosesində inteqrasiya fəaliyyətinin də rolu, dəyəri xeyli böyükdür. İnteqrasiya–latınca integratio–bərpa olunma, integrationis–tam, vahid mənasını daşıyır. Müasir dünyada ölkələrin təsərrüfatlarının obyektiv birləşmə prosesi olmaqla, onun ali məqsədi iqtisadi artım templərin davamlılığına rəğmən əldə olan resurslardan maksimum dərəcədə effektli istifadəni təmin etməkdir. İnteqrasiyanın mühüm forması kimi ölkə təsərrüfatının beynəlmiləlləşməsi nəticəsində onun dünya təsərrüfatının bir hissəsinə çevrilməsidir. İnteqrasiyanın əlaməti kimi iqtisadiyyat sferasında ümumi siyasətin formalaşması və reallaşmasıdır. İnteqrasiyanın müxtəlif növləri (siyasi, iqtisadi, hüquqi, sosial) mövcuddur. İnteqrasiya müəyyən mənada öyrənilən bilik, bacarıq, vərdişlər sahəsində müəyyən dəqiqləşdirmələr aparılmasını tələb edir.

Məktəb pedaqoji kollektivinin hər bir üzvü yaxşı bilməlidir ki, şagirdlərdə düşündürmək, mühakimə yürütdürmək, müəyyən dəqiqləşdirmələr aparmaq qabiliyyətini inkişaf etdirmək məsələsini təkcə dərslə məhdudlaşdırmaq olmaz. Bu, aktual, vacib, gərəkli məsələdə diyarşünaslıq və ətraf mühitlə tanışlıq vaxtlarında da həyata keçirmək vacib, gərəkli və pedaqoji prosesə müasir yanaşma yollarından biridir. “Uşaqlar diyarşünaslıq materialları ilə tanışlığa kiçik yaşlarından başlayırlar. Bu, əvvəl məhdud ərazini, rayonu əhatə edir, get-gedə onun dairəsi genişlənir” (3, s.5). Məktəblilərin boş və asudə vaxtlarını şən və məzmunlu keçirmək və düşüncə tərzlərini inkişaf etdirmək üçün ətraf mühitlə tanış edilməsi də əlverişli yollar sırasındadır. “Uşaqda öz kəndinə, yaxud şəhərinə, atasının, yaxud anasının işlədiyi zavoda, sonra isə bütün ölkəmizə, onun tarixinə, onun görkəmli xadimlərinə mümkün qədər tez maraq oyatmaq lazımdır. Bu məqsədə çatmaq üçün təkcə düşünmək azdır. Uşaq çox şey görməli, çox şey haqqında düşünməlidir. Onun bədii təəssüratı artmalıdır. Bədii ədəbiyyat, kino, teatr bu məqsədə çox müvafiq gələn vasitələrdir” (4, s.349).

Diyarşünaslıq və ətraf mühitlə sağlam düşüncə əsasında yaxşı, ətraflı tanışlıq uşaqlarda doğma vətənə, doğma təbiətə məhəbbət hislərini gücləndirir. Sağlam düşüncə əsasında doğma diyara məhəbbət hissinin yaradılması onlarda vətənin tarixini dərindən öyrənməyə olan həvəsi, səyi qat-qat yüksəldir.

Düşüncə insani fəaliyyətdir. Müəyyən problemli suallar ətrafında düşünmə fəalliyyəti insan beynini inkişaf etdirir. Təlim-tərbiyə işini zamanın, günün tələbləri səviyyəsində aparmaq üçün məktəbdə pedaqoji kollektivin hər bir üzvü sağlam düşüncəyə yiyələnməli və bunun səmərə və keyfiyyətini yüksəltmək üçün məktəbin ən ali orqanı olan pedaqoji şuradan başlayaraq, metodik yığıncaqlarda, konfranslarda və digər tədbirlərdə düşündürərək öyrətməyin, düşündürərək tərbiyələndirməyin, düşündürərək psixoloji inkişafa nail olmağın ən aktual yol və vasitələri haqqında fasilələrə yol vermədən maarifləndirmə işi aparılmalıdır.

İnsani fəaliyyət olan düşüncənin hər bir adamın kamil şəxsiyyət kimi formalaşmasında, başqalarında ikrah hissi oyadan iş və əməllərdən kənarlaşmasında, mənəviy-

yatca zənginləşməsində də rolu, dəyəri xeyli böyükdür. Akademik Vasim Məmmədəliyevə nəyə nifrət edərdiniz? sualı ilə müraciət etdikdə o, mənəviyyatsızlığa demişdir. İnsanda mənəviyyatın zənginliyi onun şəxsiyyət bütövlüyünün təmininə, adlı-sanlı insan kimi formalaşmasına yüksək təsir göstərir. "Çünki bütün naqislik və pisliklər mənəviyyatsızlıqdan törəyir. Mənəviyyatsız insanda hər bir naqis hərəkət özünü göstərir. İstər riyakarlıq, istər yaltaqlıq, istər yalançılıq, istər oğurluq, əyrilik və bu kimi digər pis əməllər. İnsan mənən zəngin olanda o, müqəddəsləşir. Mənəviyyatı zəngin olan insan gözəl ailə başçısıdır, gözəl vətəndaşdır, dərrakəli insandır, böyük şəxsiyyətdir. Mənəviyyatı olmayan insandan heç nə gözləmə" (6, s.9).

Gələcəyimizi xoşbəxt görmək istəyiriksə, məktəbəqədər yaş dövründən başlayaraq, o cümlədən məktəb illərində tərbiyə və habelə təlim-tərbiyə işi ilə məşğul olan pedaqoji kollektivin hər bir üzvü uşaqları düşüncəli, şüurlu fəaliyyətə istiqamətləndirməlidir. Uşaqların düşüncəli fəaliyyətə cəlbi onlarda təlim əməyinə münasibəti yaxşılaşdırır. Azərbaycan məktəbinin yeni inkişaf mərhələsində qarşıda duran təxirəsalınmaz vəzifələrdən biri şagirdləri sağlam düşüncə əsasında yaradıcı fəaliyyətə səfərbər etmək sayəsində mənimsənilən bilik, bacarıq və vərdişlərin keyfiyyətini yüksəltməkdir. "Bunun üçün hər bir şagirdin sərbəst düşünməyə, mühakimə yürütməyə, əqli nəticələrə gəlməyə ehtiyacı vardır" (180, s.3).

Fikrimə yekun olaraq bildirirəm ki, düşüncə insani fəaliyyətdir. Düşüncə insanı mənəviyyatsızlıqdan xilas edir. Düşüncə unutqanlığın qarşısını alır. İnsan beyninin fəaliyyətsizliyi orada olan çoxsaylı neyronların fəaliyyətdən düşməsi ilə nəticələnir. Sonradan onların fəaliyyətə gətirilməsi prosesində insan çoxsaylı çətinliklərlə rastlaşmış olar.

*Rəyçi: A.Muradov, əməkdar müəllim*

**İstifadə edilmiş ədəbiyyat**

1. Rüstəmov F., Dadaşova T. Ali məktəb pedaqogikası. Bakı: Nurlan, 2007.
2. Abdullayeva Ş. Uşaqların qabiliyyətlərinin inkişaf etdirilməsində məktəbəqədər tərbiyənin rolu. // İbtidai məktəb və məktəbəqədər tərbiyə. Bakı, 2004, № 2.
3. Həsənov O. Şagird şəxsiyyətinin formalaşdırılması prosesində diyarşünaslıq materiallarından istifadənin sistemi. Bakı: Elm, 2002.
4. Makarenko A. Seçilmiş pedaqoji əsərləri, I cild. Bakı: Maarif, 1983.
5. ASE, III cild, Bakı, 1979.
6. Паламарчук В. Школа учит мыслить. М.,1987.

**Р.Агаев**

**Роль школы в подготовке молодого поколения к жизни**

**Резюме**

В статье говорится об образовательном и воспитательном значении обучения учащихся, и о воспитании и развитии их мышления. В ней далее констатируется, что учить мыслить учащихся – это задача каждого члена педагогического коллектива сегодняшней школы.

**R.Agayev**

**The role of school in preparation of the youth to the life**

**Summary**

The article is dedicated to the development of thinking, especially critical thinking. It is noted that the main goal of school is to make a good citizen.

# MÜTALİƏ İNSANI KAMİLLƏŞDİRİR

**Pərvinə Əzizova, Zərifə Məmmədova**
***Azərbaycan Tibb Universitetinin dosentləri***

Mütaliə bütün insanların, o cümlədən gənc nəslin tərbiyəsində mühüm əhəmiyyət kəsb edir. Məlumdur ki, bədii əsərlər oxucunun hislərinə, şüuruna və davranışına güclü təsir göstərir. İnsanlar bədii ədəbiyyatın köməyi ilə bir sıra həyat hadisələrini daha yaxşı mənimsəyir və onun mahiyyətini düzgün anlayırlar. Mütaliə edilən hər bir kitab oxucunun təfəkkürünü inkişaf etdirir, yeni bilik qazandırır, marağını, mənəvi tələbatını ödəyir. Nəticədə onun şəxsiyyət kimi formalaşmasına kömək edir. O da danılmaz faktdır ki, kiçik yaşlarından kitaba olan maraq uşaqları, yeniyetmələri, həmçinin gəncləri həyat həqiqətlərini dərk etməyə sövq edir və ardıcıl davam edən bu hallar onlarda mütaliə mədəniyyətini inkişaf etdirir.

Pedaqoji, psixoloji baxımdan mütaliə mahiyyətcə fərdi psixoloji proses olsa da, o, yeni ideyaların yaranmasına və yayılmasına imkan yaradır, mədəni səviyyəni yüksəldir. Aydındır ki, gündən-günə dünyanın qabaqcıl ölkələrində istehsal sahələrinin mütərəqqi texnika ilə silahlanması, tarixi kəşflərin, böyük elmi nailiyyətlərin, Nobel mükafatına layiq görülmüş əsərlərin meydana gəlməsi, yeni-yeni bilik sahələrinin yaranması, dünyada gedən ictimai-siyasi proseslər mütaliəni obyektiv sosial zərurətə çevirir. İndi heç kəs inkar etmir ki, mütaliə mədəniyyəti, hər bir insanın mütaliə tələbatı müasir insanın mənəviyyatını şərtləndirən ən başlıca amillərdəndir. Təsadüfi deyildir ki, hazırda bütün dünyada mütaliə problemi öncül yerlərdən birini tutur. Məhz bunun nəticəsidir ki, mütaliə həm də tədqiqat problemi hesab olunmaqdadır. Bu sahədə ciddi araşdırmalar aparılır. Artıq sübut olunmuşdur ki, istər ümumtəhsil, istərsə də ali və orta ixtisas məktəblərinin tədris proqramlarında nəzərdə tutulan biliklər insanın sosial həyata fəal müdaxiləsi üçün kifayət etmir. Çünki dünyada biliklər məcmusu sürətlə dəyişir. Təbiidir ki, ümumtəhsil məktəblərində fənlər üzrə elm sahələri deyil, onun əsasları öyrənilir və bu prosesdə şagirdlər ancaq müəyyən ixtisasa yiyələnməyə istiqamətləndirilirlər. Gənclər istehsalatda elə elm sahələri ilə qarşılaşırlar ki, bunların məktəb dərsliklərində adları belə çəkilmir.

Təcrübə göstərir ki, ali məktəbi bitirən hər hansı gənc heç də öz ixtisası üzrə müasir həyatın tələbi həcmində biliklər məcmusuna yiyələnə bilmir. Ona görə də, zamanın tələbinə uyğun olaraq, ali məktəb illərində rəsmi təhsillə fərdi mütaliə paralel getməlidir. Elmin əsaslarına yiyələnmək üçün ali məktəb dərslikləri də kifayət deyildir. Bu mənəvi ehtiyacı hətta internet də ödəyə bilmir. Aydındır ki, bu boşluqları ancaq mütaliə doldura bilər. Çünki mütaliə prosesində oxucu kitabla sosial psixoloji münasibətə girir, bu münasibətlərin mexanizmi və onun sosial nəticələrini aşkar etmək yolunu tutur. Yalnız bu yolla müasir dövrün və tarixi keçmişin hadisələri ilə yaxından tanış olub, onların mahiyyətini anlamaq olar.

Pedaqogika elmi üçün bir məsələ aydındır ki, nəzəriyyə ilə praktika tam vəhdətdə götürülməlidir. Çünki məktəbdə tədris, təhsil və tərbiyə funksiyaları kompleks xarakter daşıyır. Bunlar bir-biri ilə qırılmaz tellərlə bağlıdır. Əgər tədris cəmiyyət tərəfindən toplanmış biliklərin mənimsənilməsi məqsədini güdürsə, təhsil bu biliklər sisteminin yaradılmasını, tərbiyə isə şəxsiy-

yətin inkişafı gedişinin idarə olunmasını ehtiva edir. Bu funksiyalar hər kəsi insanın məktəbə qədəm qoyduğu birinci gündən ömrünün sonunadək izləyir və onun intellektual fəaliyyətinin məzmununu müəyyənləşdirir. Ona görə də, mütaliə, onun zəruriliyi haqqında təhsil ocaqlarında geniş söhbət aparılmalıdır. Onun həyat üçün əhəmiyyəti dönə-dönə xatırladılmalıdır, böyük şəxsiyyətlərin həyatından nümunələr gətirməklə bəzi həqiqətlər yada salınmalıdır.

Elmi ədəbiyyatda mütaliə dedikdə, həyat təcrübəsi qazanmaq və özünütəkmilləşdirmə, idraki ehtiyac, şəxsi təhsil və təcrübi faydalanmaq, emosional və estetik tələbat, əylənmək və b. elmi-praktik kateqoriyalar başa düşülür. Bunların hər birinin öz funksiyaları vardır.

İnsanlar üçün fasiləsiz artmaqda olan sosial tələbat sayılan mütaliə ilk növbədə insanların ictimai şüurunun formalaşmasına, təhsil səviyyəsinin yüksəlməsinə təsir göstərən ən güclü amillərdəndir. Mütaliə elə bir prosesdir ki, onun nəticələri insanın ictimai və istehsalat fəaliyyətində əks olunur, onun dünyagörüşünün, əməyinin səmərəliliyini dəyərləndirir. Təsadüfi deyildir ki, İ.Şıxlının, İ.Əfəndiyevin, B.Vahabzadənin, M.Arazın, Anarın, Elçinin və b. şair və yazıçıların əsərləri yeniyetmə və gənclərin tərbiyəsində əvəzsiz əhəmiyyət kəsb edir. Gənclər onların qəhrəmanlarından çox şey əxz edirlər.

O da həqiqətdir ki, mütaliənin əsasında kitab durur. Ona görə də, gənclərdə kitabı bütünlüklə oxumaq, onu başa çatdırmaq vərdişi yaradılmalı, həm də onlar həyatın astanasından kitab mütaliəsinə daha çox həvəsləndirilməlidirlər. Kitab ömrün böyük yolunun başlanğıcı rolunu oynayır.

Mütaliənin mahiyyətində kitab təbliği də başlıca yer tutur. Odur ki, kitabxanalarda mütaliə sosial, sosial psixoloji və pedaqoji problemlərin, eyni zamanda onun ictimai həyata təsirinin tədqiqi sahəsinə nüfuz edir və yeni-yeni nailiyyətlərin meydana çıxması üçün qida verir. Kitab bilik mənbəyi olmaqla həm də ən yaxın ünsiyyət vasitəsidir. Yalnız kitab vasitəsilə, heç vaxt üzünü görə bilmədiyimiz, zaman və məkan baxımından bizdən çox-çox uzaq olan müəlliflərlə dialoq qurmaq olar. Bu prosesə valideynlər də cəlb edilməlidir. Valideynlərin maarifləndirilməsi də unudulmamalıdır. Öz uşaqlarında mütaliə sevgisi yaradacaqlarına ümidlərini itirməmiş valideynlər təcrübəli pedaqoqların məsləhətlərinə qulaq asmaqla və ona əməl etməklə uğur qazana bilərlər. Hətta övladlarına hədiyyə almaq istəyən valideynlər üstünlüyü kitaba versələr, daha gözəl iş görmüş olarlar. Uşaqlarda oxumağa meyil, öyrənməyə həvəs, ətraf mühiti anlamağa maraq da kitablardan başlayır. Bu yaşda kitabı sevməyin təməli qoyulur. Bəzi valideynlər düşünürlər ki, televizor və kompyuterlər uşaqların oxumaq həvəsini öldürmüşdür. Sözsüz ki, belə yanaşma tərzi kökündən səhvdir. Müəllimlərlə məsləhətləşərək hər bir valideyn uşaqlarda kitab oxumaq vərdişinin yaradılmasının iştirakçısı olmalıdır. Onlarda yatmazdan əvvəl kitab oxumaq vərdişi aşılanmalıdır. Uşaqların və yeniyetmələrin kitab seçiminə valideyn nəzarəti yaddan çıxmamalıdır. Məktəblilər üçün müəyyən edilmiş kitabların hələ orta məktəb dövründə oxunmasına, onların sevilməsinə ilk növbədə onlar cavabdehdirlər. Lakin bu asan məsələ deyildir. Uşaqların oxu qabiliyyətlərinə yiyələnmələri və kitaba məhəbbət bəsləmələri işində valideynlərdən böyük zəhmət və dözüm tələb olunur.

Hələ orta məktəbdə şagirdlərə kitab üzərində səylə işləməyi, fənlə əlaqədar müxtəlif sorğu ədəbiyyatdan (əsasən lüğətlərdən), kataloq və kartotekadan istifadə etməyi, müəyyən mövzuya aid material toplamağı, kitab üzərində müstəqil işin nəticələrini düzgün formalaşdırmağı, tezislər hazırlamağı, ədəbiyyat siyahısını tərtib

etməyi, oxuduğu əsərin qısa məzmununu şərh etməyi və s. öyrədilməlidir. Ali məktəblərdə isə, bunlar gündəlik işə, məqsədə çevrilməlidir.

Artıq YUNESKO da təsdiq etmişdir ki, hazırda mütaliəyə laqeydlik halları bütün dünyada mövcuddur. Bu isə, dünya alimlərini, xüsusən pedaqoqları və psixoloqları ciddi düşündürməyə bilməz. Məsələn, yayılan məlumatlara görə, Rusiyada ölkə əhalisinin yarıdan çoxu kitab almır. Əhalinin üçdə bir hissəsindən çoxu kitab oxumur. Vətəndaşların 79 faizi kitabxanaya getmirlər. Bundan əlavə, Rusiyanın hər üçüncü sakininin evində, ümumiyyətlə, kitab yoxdur. Buraxılan kitabların yarıdan çoxu öz oxucusunu tapmır. Bizdə belə statistika olmasa da, təəssüflə qeyd etməliyik ki, bizim ölkəmizdə də belə hallar vardır. Kitaba, mütaliəyə meyil bizdə də zəifləmişdir, bunu yazıçılarımız da, pedaqoqlarımız da, müəllimlərimiz də görürlər və onu ürək yanğısı ilə tez-tez dilə gətirirlər. Ona görə də, son vaxtlar kitab təbliğinə marağın artırılması məsələlərindən danışılır. Kitabın insan həyatı üçün əhəmiyyətli mənəvi xəzinə olduğunu ən etibarlı mənbələr də təsdiq edir. Böyük rus tənqidçisi Belinski mütaliənin vacibliyini həmişə ön plana çəkmişdir. O demişdir: "Talant ağıla, təhsilə, zəngin məlumatlara, hadisələrə, orijinal və düzgün baxışlara əsaslanmırsa, o, tezliklə fərasətsizliyə çevrilir."

Azərbaycan klassiklərinin əsərlərində mütaliəyə dair çox qiymətli fikirlər vardır. "Dolu" romanının müəllifi, tanınmış publisist və yazıçı Aqil Abbasdan soruşanda ki, "İnsan özünü tapmaq üçün nə etməlidir?" sualına belə cavab vermişdir: "Oxumalıdır, dünyada nə var, nə yox bilməlidir. Mənə elə gəlir ki, dünyada hər şey oxumaqdan yaranır. Oxumaq qədər insanı formalaşdıran heç şey ola bilməz. Mən xüsusilə gənclərimizə üzümü tuturam ki, mütləq oxuyun. Gec olmadan özünüzü formalaşdırın."

Dünyanın elə şəxsiyyətləri olmuşdur ki, onlar elmi biliklərini əsasən müstəqil mütaliə nəticəsində əldə etmişlər. Onlar mütaliəni hər günün əsas məqsədi və məzmunu kimi başa düşmüşlər. Məsələn, M.Qorki hər gün mütaliəyə vaxt ayırır və bunu dəqiqədə 4 min söz sürətiylə edirdi. Stalin gün ərzində 400 səhifə mütaliəyə özünün minimal norması kimi baxırdı. Balzak romanı yarım saatda 200 səhifə oxumaqla qiraət edirdi. N.A.Rubakin 250 min kitab mütaliə etmişdir. Napoleon kitabı bir dəqiqədə iki min söz sürətiylə oxuyurdu. T.Edissonun gözü bir dəfəyə 2-3 sətir alırdı. Məşhur riyaziyyatçı Hardi ilə bağlı belə bir rəvayət (həqiqət) söylənir:1913-cü ildə Kembric universitetində Hardiyə məktub gəlir. Zərfin üstündə yazılan müəllifin adı, yəni Rəmənucan Spinivazə (1887-1920) heç kimə məlum deyildi. Məktub Hindistanın Mədrəs vilayətindən gəlmişdi. Müəllif yazırdı ki, universitet oxumamışdır, orta məktəbdən sonra müstəqil yolla, riyaziyyatla məşğul olmuşdur. O, öz məktubuna düsturlar da əlavə etmişdi. Müəllif yazırdı ki, əgər düsturlar bir maraq kəsb edirsə, onları çap edin. Çünki o özü kasıb adamdır və buna imkanı yoxdur. Bu düsturlar əvvəlcə Hardinin təəccübünə səbəb olur, sonra onu maraqlandırır və nəhayət, dəhşətə gətirir. Hardi başa düşür ki, qeyri-adi istedada malik olan bir insanla rastlaşmışdır. Məktub gətirən bu şəxs öz mütaliəsi sayəsində elmin zirvəsinə yüksəlmişdir. Qısa məktublaşmadan sonra Hardidə Rəmənucanın elmə məlum olmayan 120 yeni düsturu toplanır. Çox keçmir ki, o, dünya şöhrəti qazanır. Spinivazə Rəmənucanı çox vaxt riyaziyyatın Paqaninisi adlandırırlar.

Deyirlər ki, Kazan Universitetinin professoru kimyaçı N.N.Zininin yanına bir tələbə gələrək deyir ki, "Mən təhsilimi qurtardım". "Doğrudanmı?" – deyə professor soruşur və az fasilədən sonra əlavə edir:

“Mən isə hələ yenicə başlayıram”. Söz yox ki, Zinin şəxsi mütaliəsini nəzərdə tuturdu.

Bir dəfə akademik N.N.Beketovun xidmətçisi alimin otağına gəlib həyəcanla: “Kitabxanamıza oğru girib”, - deyə qışqırır. Beketov bir anlığa işdən ayrılıb sakitcə ondan soruşur: “Həyəcanlanmaq nə üçün, görəsən o hansı kitabı oxuyur, mane olmayın”. Bəli, alim yalnız mütaliə barədə düşünürdü.

Böyük şəxsiyyətlərin həyatına nəzər saldıqda, mütaliə haqqında çox əhəmiyyətli və maraqlı faktlar meydana çıxır. Nizami elm öyrənməyi hər şeydən üstün tuturdu. O, özü qədim yunan mənbələrini birər-birər öyrənirdi. Müasirimiz olan S.Vurğun, R.Rza mütaliənin vacibliyini dönə-dönə qeyd edirdilər. Bir az keçmişə qayıdaq. “Risaleyi Nur” kitabının müəllifi olan Badiuzzaman Səid Nursi yeniyetməlik çağında gündə 200 səhifə mütaliə etməklə 90 kitab oxumuş və qeyri-adi hafizəsi hesabına onların hər birini əzbər yadda saxlamışdır.

Mütaliənin vacibliyi həmişə qeyd olunmuşdur. Qədim hind müdrikləri öyrədir: ”Kim ki, daim oxuyub öyrənir, o, özü-özünün həkimi olur. Səbirli olmaq, məqsəd uğrunda mübarizlik, insani kamillik oxuyub öyrənməklə bağlıdır.” Görkəmli psixoloq Anton Rubinşteyn çox gözəl demişdir: “Əgər bircə gün öyrənmirəmsə, - bunu özüm hiss edirəm, əgər iki gün öyrənmirəmsə - bunu mənə yaxın olanlar hiss edirlər, əgər üç gün öyrənmirəmsə - bunu hamı hiss edir.”

Yaradıcılığın bütün sahələrində özözünə öyrənmə və şəxsi mütaliə böyük əhəmiyyətə malikdir. Belə deyirlər ki, yaradıcılıq işlərində ən əsası və başlıcası öyrətmək olmaz – bunu ancaq öyrənmək olar. Filosof Spenserə görə, “bəşəriyyət həmişə ancaq şəxsi mütaliə yolu ilə müvəffəqiyyətlə inkişaf etmişdir. O.Süleymanov təsdiq edir ki, “ancaq şəxsi mütaliə yolu ilə mütəxəssis olmaq olar.”

Türkiyə parklarının birində kitab şəklində oturacaqlar quraşdırılmış, orada klassiklərin əsərlərindən bəzi parçalar həkk edilmişdir. Buraya parka gələnlərdə mütaliəyə maraq oyatmaq məqsədi nəzərdə tutulmuşdur.

Bütün bunlar bir daha təsdiq edir ki, mütaliə bütün elmi biliklərin əsasıdır, həm ümumtəhsil məktəblərində, həm də ali məktəblərdə şagirdlərin və tələbələrin mütaliə mədəniyyətinə yiyələnmələrinə ardıcıl diqqət və qayğı göstərilməlidir. Kitab oxuma alışqanlığı insanda tərbiyəvi bir xüsusiyyətdir. Belə insanlar bunun üçün həmişə vaxt tapırlar. Həm də bu hərəkətləri ilə, yəni əlində daim kitab gəzdirilməsilə başqalarına da təsir göstərirlər. Məlumdur ki, uşaqlara mütaliə vərdişlərinin erkən yaşlarda təbliği olduqca vacibdir.

Əsas odur ki, vaxtında bu vərdişin təməli qoyulsun. Mütəxəssislər sübut edir ki, kiçikyaşlı uşaqlar gördüklərini və eşitdiklərini daha yaxşı qavrayırlar. Uşaqlarda mütaliəyə həvəs hələ balaca yaşlarından başlayır. Təsadüfi deyildir ki, məktəbəqədər müəssisələrinə dair proqram və metodiki sənədlərdə balaca yaşlı uşaqlarda mütaliəyə həvəsdən bəhs edilir. Onlar üçün ucadan qiraət xüsusi qeyd edilir. Hətta onlara kitabı sevdirmək məqsədilə onları ekskursiyalara, müvafiq sərgilərə aparmaq da tövsiyə edilir. Məktəblərdə də bu sahədə əhəmiyyətli işlər görülür. Mütaliəyə cəlb etməyin başqa bir forması isə onların yazıçılarla, şairlərlə görüşlərinin təşkil edilməsidir. Belə tədbirlər tez-tez ali məktəblərdə də keçirilir. Bu yolla əhalidə mütaliəyə marağın formalaşdırılması da nəzərdə saxlanmalıdır. Ali məktəblərdə humanitar olmayan fakültələrdə də bədiisənədli ədəbiyyat oxumaq tövsiyə edilir. Azərbaycan Tibb Universitetinin müvafiq kafedralarında, o cümlədən dilçilik kafedrasında həm Azərbaycan, həm də rus bölməsində oxuyanların geniş dünyagörüşə yiyələnmələri üçün tədris materiallarından

kifayət qədər nümunələr gətirilir.

Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin “Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında” 12 yanvar 2004-cü il tarixli sərəncamı ilə bütün nəşrlərin çap olunub kitabxanalara təhvil verilməsi şagirdlərin, tələbələrin, bütün əhalinin mütaliə mədəniyyətinin inkişafına əsaslı və güclü təsir göstərmişdir. Tam əminliklə təsdiq edilir ki, yalnız bundan sonra mütaliə üçün geniş imkan və şərait yaranmışdır.

Mütaliə psixoloji proses kimi komminukasiya-əlaqə fəaliyyətini mümkün edər. O da diqqətdən kənarda qalmamalıdır ki, informasiyalaşmış cəmiyyətin formalaşması və tərəqqisi mütaliə prosesinin bəhrəsidir. Mütaliə insanı həyata bağlayır, zehni açır, ətraf mühiti, dünyanı, bütün insanları sevdirir. Onda estetik hislər oyadır, kulturoloji hazırlıq aşılayır. Təsadüfi deyildir ki, gözəl nitqə, zövqə, əxlaqa malik olanlarla işləmək daha asan və daha maraqlıdır.

Şagirdlər də, tələbələr də, müəllimlər də, pedaqoji işçilər də öz rəhbərlərini mütaliə mədəniyyətinin ən bariz daşıyıcısı kimi tanımalıdırlar. Belə adamlarla ünsiyyət yorucu olmur. Onları dinləmək, onlardan öyrənmək gündəlik tələbata çevrilir. Azərbaycan oxucusunun əlinin altında klassiklərimizlə yanaşı Tolstoy, Puşkin, Çexov, Lermontov kimi rus klassiklərinin əsərləri vardır. Onlar dilimizə çox gözəl tərcümə olunmuşdur.

Ölkəmizdə indi də dünyanın ən məşhur klassiklərinin, dünya ədəbiyyatı nümunələrinin əsərlərinin nəşri işinə böyük dövlət qayğısı göstərilir. Bu tərcümələrdə Azərbaycan dilinin bütün incəliklərinə fikir verilir. Kitabxanalarda, kitab mağazalarında doğma dildə istənilən qədər maraqlı, məzmunlu, oxunaqlı kitabları tapmaq olur. Onların hər biri elmin yolları ilə irəliləyən gənclərimiz üçün mayakdır. Vaxt gözləmir, mütaliə gecikməyi sevmir. Kitabı sevmək, onu oxumaq zamanın tələbidir. Unutmaq olmaz ki, mütaliə insanı kamilləşdirir, onu öz vətəninə layiq vətəndaş kimi yetişdirir.

Məqaləni Tibb Elmlər Akademiyasının akademiki V.N.Ternovskinin sözləri ilə bitiririk: “Bilirsinizmi bəzən mənə elə gəlir ki, insan kitabı nə qədər çox sevirsə, xəstəliklərə bir o qədər də az tutulur”.

*Rəyçi: dos. N.Nəcəfov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Mirzəcanzadə A. İxtisasa giriş. Bakı, 1990.

2. Hacıbəyli Ağa. Gənclik. Füyuzat, 2012, № 3.

3. Cəfər M. Məktəbdə estetik tərbiyə. Bakı, 1982.

**П.Азизова,**
**З.Мамедова**

**Чтение развивает мышление**

**Резюме**

В статье говорится о роли чтения в жизни человека, образовании важности навыков чтения у учеников и студентов . Вспоминаются высказывания великих личностей по этому поводу.

**P.Azizova**
**Z.Mammadova**

**Reading perfects humans**

**Summary**

In the article it is spoken about the role of reading, and developing students’ reading skills. At the same time some examples from the life of great thinkers are given.

# FÜZULİNİN "RİNDU ZAHİD" ƏSƏRİNDƏ TƏRBİYƏ MƏSƏLƏLƏRİ

**Bəyzadə Nuruyev**
***Bakı şəhəri 87 nömrəli tam orta məktəbin tərbiyə işləri üzrə direktor müavini***

***Açar sözlər:*** *mükalimə, vücud, vəhdət.*
***Ключевые слова:*** *общение, тело, связь.*
***Key words:*** *dialogue, body, unity.*

Ümumtəhsil məktəblərində Füzulinin tədrisi xüsusi yer tutur. Şagirdlər böyük şairin şah əsəri olan "Leyli və Məcnun" la yanaşı digər əsərlərini də öyrənirlər. Azərbaycan və dünya ədəbiyyatının ən görkəmli nümayəndələrindən biri olan Füzuli hələ sağlığında bütün Şərq ölkələrində məşhurlaşmış, əsərləri dillər əzbəri olmuşdur. O dövrdə yazılmış elə bir tədqiqat əsəri, arxiv materialı, cüng yoxdur ki, onun haqqında böyük ehtiram və məhəbbətlə danışılmasın, dərin lirizmi və istedadı yüksək qiymətləndirilməsin.

Avropada Füzuli haqqında tanınmış şərqşünaslar onun əsərlərindən ətraflı bəhs etmişlər. Ən yüksək və düzgün qiymət isə XIX əsrdə yaşamış tanınmış ingilis şərqşünası Gibb tərəfindən verilmişdir. O, Füzulini Şərqdən doğan günəşə bənzətmiş, ulduzlar günəşdən qüvvət aldıqları kimi, bütün dünya şairlərinin də onun yaradıcılığından bəhrələndiklərini qeyd etmişdir.

Füzuli dahi şair olmaqla bərabər, həm də hərtərəfli biliyə malik fenomen bir şəxsiyyət olmuşdur. Bədii dillə qələmə aldığı əsərlərində onun dahi filosof ("Mətlə ül etiqad"), təbib ("Səhhət və Mərəz"), böyük tərbiyəçi, dövrünün çatışmazlıqlarını ifşa edən tənqidçi ("Rindu Zahid") olduğu da görünür.

Şairin "Rindu Zahid" əsəri gənclərin və yeniyetmələrin peşə seçmələri, elm və təhsilə yiyələnmələri, tərbiyə məsələləri baxımından diqqəti çox cəlb edir.

Əsər fars dilində ata və oğlunun mükaliməsi şəklində nəsrlə yazılmış irihəcmli bir hekayədir. Hər bir mükalimənin nəticəsi kiçikhəcmli şeirlə yekunlaşır.

Əsəri diqqətlə oxuduqda gözümüz qarşısında dolğun pedaqoji mənzərə canlanır. Tarixin bütün dövrlərində və bu gün də cəmiyyət qarşısında duran gənclərin tərbiyəsi, elm, savad qazanması, peşəyə yiyələnməsi və gələcəyini müəyyən etməsi diqqət mərkəzində olmuşdur. "Rindu Zahid" əsəri də tamamilə bu məsələyə həsr olunmuşdur. Əsərdəki maraqlı cəhətlərdən biri budur ki, şair bütün bu tərbiyə məsələləri fonunda dövrünün eybəcərliklərini, adi adamların ağır vəziyyətdə yaşamasını, dövlət məmurlarının öz vəzifələrindən istifadə edərək çoxlu sərvət toplamalarını, xalqı soymalarını çox ustalıqla ifşa edir. Əsərin həm mükalimə üslubunda yazılması, həm də peşə-sənət seçiminə, tərbiyə məsələlərinə həsr olunması bədii bir priyomdur. Şair bu üsuldan istifadə edərək öz tənqidlərini bildirir, həm də özünü köhnəpərəst, mühafizəkar, qatı dindarlardan, yüksək rütbəli məmurlardan mühafizə edir.

Əsərdə təsvir olunur ki, Zahid adlı mühafizəkar, dindar, çox böyük nüfuza malik və zəngin kişinin Rind adlı bir oğlu var. Rind ağıllı, müstəqil fikirli, öz yaşına görə

geniş dünyagörüşlü bir gəncdir. Atası onun bu müsbət cəhətlərini hiss edir, bir sənətə, peşəyə yiyələnməsi vaxtının yetişdiyini başa düşür. Oğlu ilə bu məsələ haqqında söhbət etməyə başlayır. Əsas ideya və fikirlər də məhz bu mükalimə zamanı qaldırılır. Cəmiyyətdəki çatışmazlıqlar göstərilir.

“Rindu Zahid” əsərində bu gün də vacib olan, insan tərbiyəsində, şəxsiyyətin formalaşmasında əsas rol oynayan bir neçə məsələ qırmızı xətt  kimi keçir:

- kiçiyə qayğı, gənclərin müstəqil ideyalarına, fikirlərinə diqqət və hörmətlə yanaşmaq, peşə seçimində müstəqillik vermək;
- müəllimə, onun əməyinə verilən yüksək qiymət;
- müasir dövrdə də gənclərin təlim-tərbiyəsində əsas rol oynayan, onun kökünü təşkil edən, pedaqoji “üçbucaq adlandırılan” müəllim-valideyn əlaqəsi və ictimai mühitin birgəliyi.

Əsərin və iştirakçılarının adı rəmzi məna daşıyır. Bir tərəfdə dindar və mühafizəkar ata, digər tərəfdə isə ağıllı, savadlı, dünya nemətlərindən zövq almağa çalışan, əyləncələrə meyilli gənc dayanır.

Rind sənət seçməkdə atasından kömək istəyir. Zahid ona məsləhətlər verir, müxtəlif sənət və peşə adları çəkir. Lakin o, bu sənətlərdən heç birini bəyənmir, onların hər birinin çatışmayan cəhətlərini göstərir, atası ilə uzun mübahisələrə başlayır. Ata məsləhət görür ki, savad qazanıb padşah yanında çalışıb var-dövlət, hörmət sahibi olmaq, əkinçilik kimyası ilə məşğul olmaq, şəhər sənətlərindən birinə yiyələnmək, yaxud ticarətçi olmaq mümkündür və lazımdır.

Rind isə bu sənətlərdən heç birisini bəyənmir, onların hər birisinin mənfi cəhətləri haqqında danışır. O bildirir ki, padşah yanında işləmək həm xalqı soyub-talamaq, həm də çoxlu sərvət sahibi olsa da, daim qorxu və səksəkə içərisində yaşamaqdan başqa bir şey deyil, insan həmişə azad və müstəqil olmalıdır.

Əkinçiliklə məşğul olan adamlar isə məhsulu əkib gözləyirlər, intizar çəkirlər, məhsulun tez yetişməsi üçün çalışır və beləliklə, ömürlərinin də tez keçməsini gözləyirlər. Belə adamlar qafil və ağılsızdırlar.

Şəhər sənətkarlığı ilə məşğul olan adamlar qazanc üçün bütün günü işləyir, gecə yatıb səhər yenə həmin işlə məşğul olur. Həyat belə adamlar üçün mənasız və darıxdırıcıdır, insan həyatdan zövq almağı da bacarmalıdır. Ticarətçi isə bəzi fırıldaqlarla xalqı soyub sərvət qazanmaq istəyir. Bu isə insanlığa layiq iş deyildir. Rind bütün bu fikirlərinə atasını inandıra bilir, ata onunla razılaşır.

Bu mükalimədə Rindin fikirlərində iki əsas məsələ qabardılır. Birincisi, Rindin dili ilə peşə seçimi fonunda cəmiyyətin eybəcərlikləri göstərilir, ikincisi, peşə, sənət hər bir gəncin ürəyincə olmalıdır, əks halda gənc müxtəlif bəhanələrlə işdən uzaqlaşacaq, yaxud heç bir uğur qazanmayacaqdır.

Əsərdə xüsusi qabardılan məsələlərdən biri də müəllim və valideynin təlim və tərbiyə prosesində birgə fəaliyyəti, ətraf mühitin güclü təsiridir.

Bütün dünya dahiləri müəllim əməyinə böyük qiymət vermiş, xüsusi hörmət və məhəbbətlə yanaşmışlar. Bu baxımdan Füzulinin də fikirləri çox maraqlıdır. O, müəllimi atadan da müqəddəs hesab edir: “Bil ki, insan varlığının kamalı iki vücuddan asılıdır. Əvvəl zahiri vücuddur ki, onun da mənbəyi atadır. İkinci mənəvi vücuddur ki, onun da mənşəyi rəy sahibi olan mürşidin hidayətidir.

Əsərdə ikinci tərəfin-valideynin də rolu xüsusi qiymətləndirilir. Valideyn uşağı ancaq yedirib-içirməklə, geydirməklə, nəsihət verməklə kifayətlənməməlidir. Ona yol göstərməli, istiqamət verməlidir, nümunə olmalıdır. Həm də bu işdə bütün ailə iştirak etməlidir.

Vay o bəndənin halına ki, adının baqı qalması üçün

Bir ömür zəhmət çəkə övlad böyüdə

Övladına gözəl tərbiyə əsər etməyə,

Atasının adını batıra, abrını apara.

Əsərdəki maraqlı cəhətlərdən biri də gənclərin tərbiyəsində müəllim-valideyn birliyi ilə bərabər mühitin, cəmiyyətin rolunun da əhəmiyyəti göstərilir. Rind atası ilə mübahisə edərkən deyir ki, mən hələ dünya ilə tanış deyiləm, gəl bir neçə qədəm gəzməkdə mənə yoldaşlıq et, mənə bilmədiklərimi öyrət. Beləliklə, onlar şəhərə çıxır, küçə və bazarı dolaşırlar. Nəhayət, böyük və gözəl bir imarət qarşısına gəlirlər. Zahid bildirir ki, bura Allahın evidir, səfalı sufilərin məbədidir. İblisin bu evə yolu yoxdur. Sən də buraya gəl, bu tayfanın söhbətlərinə rəğbət et ki, cəhalət qaranlığından qurtarasan. Rind bildirir ki, bura kamil adamların yeridir, kamal öyrənmək məktəbi deyil, ayıbdır ki, mənim küdurət tozum onların səfa səhifəsinə qonsun.

Əgər bu məclisin əhli fəzl və kamal əhlidirsə,

Niyə bu cəhalətlə ora gedib utanaq?

Əgər hiyləgər, xudpəsənd və şərir adamlardırlarsa,

Nə üçün gedib onların işinə şərik olaq?

Onlar məsciddən uzaqlaşır, gəzə-gəzə gəlib başqa başı göylərə ucalan, gözəl binanın qarşısında dayanırlar. Burada insanlar yeyib-içir, vaxtlarını xoş keçirməyə çalışırlar. Rind buradan xoşu gəldiyini bildirir. Zahid deyir ki, bura şeytan işidir, üsyankarlığın sərçeşməsidir, onlar Allahın düşmənləridirlər.

Rind soruşur ki, əgər bura şeytan yuvasıdırsa, nə üçün Allah buranı belə abad edibdir? Uzun mübahisədən sonra Rind atasının razılığı ilə meyxanaya girir. Bir qocadan soruşur ki, deyirlər meyxana şeytan işidir, sən nə deyirsən? Qoca ona bəzi möminlərin hiyləsini, huri-qılman sevdalarını aydınlaşdırır. Rind başa düşür ki, meyxana pak insanların yeridir, onu atasına da danışır, yenidən mübahisə edirlər, nəhayət, Zahid oğlunun fikri ilə razılaşır, məscid və meyxananın birliyini etiraf edir. "Axırda Zahid arif Rindin tənbehi ilə öz işlərinin aynasından riya tozunu sildi, Rind vaqif Zahidin nəsihəti ilə öz surəti-halını tövbə bəzəkləri ilə zinətləndirdi. Hər ikisi müxalifət və ziddiyyətdən əl çəkdilər. Vəhdət dərəcəsinə çatdılar və məhəbbət yolunu tutdular".

"Rindu Zahid" əsərində çox maraqlı bir məsələ vardır. Müasir dövrdə sübut olunmuşdur ki, 14-20 yaşlı gənclə 50-60 yaşlı bir adamın bir elmi öyrənmək, qavramaq, yadda saxlamaq və həyata tətbiq etmək arasında böyük fərq vardır. İnsan elmi gəncliyində daha yaxşı öyrənib mənimsəyər, daha çox fayda verər. Füzuli bu cəhəti Rindin dili ilə belə bildirir ki, nə öyrənirsən gəncliyində öyrən, bədən süstləşdikdən sonra öyrənmək çətin olar. İnsan uğur qazanmaq üçün qarşıya məqsəd qoymalı, bu məqsədə çatmaq üçün mübarizə aparmalıdır. Onda bütün arzulara qovuşmaq olar.

Beləliklə, Füzuli dahiliyi kiçik bir hekayədə tam böyüklüyü ilə ortaya çıxır, dövrünün bütün vəziyyəti reallıqla təsvir olunur. Bəşər tarixinin əsas diqqət mərkəzində olan insan təhsili, tərbiyəsi ustalıqla, böyük bir mütəxəssis kimi göstərilir. Onun XVI əsrdə tərbiyə haqqındakı fikirləri bu günlə tam ayaqlaşır, sanki bu gün üçün yazılmışdır.

*Rəyçi: dos. R.Əhmədov*

**İstifadə edilmiş ədəbiyyat**

1. H.Araslı. Böyük Azərbaycan şairi Füzuli. Bakı, 1958-ci il.

2. M.Füzuli. Seçilmiş əsərləri. 6 cilddə V cild, Bakı, 2005-ci il.

# SAĞLAMLIQ İMKANLARI MƏHDUD OLAN UŞAQLARLA İŞİN TƏŞKİLİNƏ DAİR

**Nazim Məmmədbəyov**
***Azərbaycan Yazıçılar və Jurnalistlər Birliklərinin üzvü***

Son zamanlar sağlamlıq imkanları məhdud olan uşaqların problemlərinə bütün dünyada maraq artmaqdadır. Bu, beyin, intellekt pozğunluğu, mərkəzi sinir sistemi xəstə olan uşaqların taleyi müəllim və psixoloqları daha çox düşündürür. Bu da təbiidir. Bu elə uşaqların təlimə hazırlanması və öz imkanları dairəsində təlim fəaliyyətinə yiyələnməsi bu gün yeni və çoxları üçün təəccüblü olan, lakin çox vacib və problemli məsələlərdən sayılır.

Bu gün biz qeyd edə bilərik ki, belə uşaqların təlimi, tərbiyə olunması çox lazımlıdır, lakin onların ümumi təlimi, yaxşı olar ki, estetikadan başlansın. Məhz bu sahədən başlayanda mümkün ola bilməyən bir iş əks fikir və nəticələr ilə sübut olunur. Bu istiqamətdə aparılan iş uşaqların öz psixi imkanlarına əsaslanaraq, onların idrakını, marağını, qabiliyyətlərini inkişaf etdirir. Bununla birgə gözəllik nümunələrini dərk etməsini və onlarda yüksək emosional həzz almaq bacarığını formalaşdırır. Bu vasitə ilə xəstə uşaqların estetik fəaliyyətə marağının artmasına nail olmaq mümkündür. Bu fəaliyyət gözəllik nümunələrini yaratmaq həvəsinə tələbatı formalaşdıraraq uşaqların emosional hissiyyatlarına təsir edir, onlarda müstəqil işləmə bacarığı üçün geniş imkanlar yaradır. İşin müvəffəqiyyətlə nəticələnməsindən ötrü üçün estetikyönümlü hər bir dərs müəllimdən ruhi xəstə və ağır psixopatik, beyin pozğunluğu olan uşaqların idarəolunma prinsiplərinə yiyələnməsini zəruri edir, əgər belə olarsa, bu cür uşaqların estetik tərbiyəsi sahəsində qarşıya çıxan hər problemli məsələni operativ olaraq həll etmək mümkün olar.

Hər bir yeni işə başlamaq çox çətindir, xüsusilə də xəstə uşaqların təlim-tərbiyə işinə. Sinir, beyin xəstəlikləri üzündən əlillik almış uşaqların estetik tərbiyəsi axır vaxtlara qədər mümkün olmayan və gərəksiz bir iş sayılırdı. Lakin həyat bizə daim sübut edir ki, müəyyən vaxta qədər mümkün olmayan hallar, cəmiyyət qarşısında dayanan problemli məsələlər, cəmiyyətin özü, insan şüuru, elm və təcrübənin daim inkişafda olduğundan həlli yolunu tapır.

Yeni müstəqillik yolu ilə irəliləyən cəmiyyətimizdə təlim-tərbiyə işlərinin günün tələblərinə uyğun aparılması şəraiti yaranmışdır. Böyüməkdə olan gənc nəslin hər bir nümayəndəsinin təlim-tərbiyə işi ilə əhatə olunması xüsusi qeyd olunur. Hər bir körpə, məktəbli və yeniyetmə öz imkanları dairəsində lazımi təlim-tərbiyə işləri ilə əhatə olunmalıdır. Bu sahədə Saray qəsəbəsindəki 7 nömrəli, Şağan qəsəbəsindəki 3 nömrəli internatlarda və Maştağa qəsəbəsindəki ruhi xəstəxanada müalicə olunan uşaqlarla müəyyən təlim-tərbiyə işləri aparılır. Tədris ili ərzində qarşıya çıxan problemlər, gözlənilməz hadisələr, əldə olunan nailiyyətlər və nəticələr də maraqlıdır.

Estetik tərbiyə sahəsində aparılan dərslərin nəticələri xəstə uşaqların bu sahədəki bacarıqlarını aşkara çıxarır.

Düzdür, yaranan işçi qrupun hər bir müəllimi müxtəlif xəstə uşaqlarla işləyib,

müəyyən təcrübə toplamışdır. Lakin bu vaxta qədər hər xəstə uşaq ilə estetik dərs fərdi aparılır. Bu dərslər onun özünün istəyi ilə və ancaq seçdiyi fəaliyyətlə bağlı olur. Hər bir uşağın xüsusiyyətlərini gördükdə, araşdırdıqda, onunla münasib pedaqoji metod və üslub tapmaq olur. Bu dərslərin müəllimlər üçün nə dərəcədə çətin olduğu təcrübədən çox gözəl aydın olur. Bununla belə, xəstə uşağın dərs zamanı estetik fəaliyyət vasitəsilə aldığı o yüksək ruh, müsbət emosionallıq onu həyatda yaşadır, onun çətin həyat tərzini mənən dolğun edib, asanlaşdırır. Belə uşaqların, məhz estetikyönümlü dərsi aparan müəllimə qarşı xüsusi münasibəti yaranır. Bu münasibət aydın hiss olunur.

Estetik fəaliyyət özü uşaqlara yaxın olduğundan, onların özünə hədsiz müsbət emosiya bəxş etməsindən hər hansı dərsin üzürlü səbəbdən bir dəfə təşkil olunmaması, onların daxilinə dərin boşluq yaradaraq, həm valideynə, həm uşağa ağır təsir edir. Sözsüz ki, valideynlər xəstə uşaqların yanında olduqda, bir dəqiqə olsun belə uşaqlarının xəstə olduqlarını unutmurlar. Lakin təşkil olunmayan dərs belə uşaqların valideynlərinə öz uşaqlarını idarə etməyə böyük çətinliklər yaradır. Hər hansı düzgün keçirilməyən estetik dərs uşağın özündə, daxili aləmində o dərəcə mənfi emosiyaya səbəb olur ki, başqa fənn müəllimləri dərslərinin çətinliklə idarə etməsi meydana çıxır.

Həyat sübut edir ki, xəstə uşaqların hər hansı estetik sahə ilə məşğul olması mümkündür, hətta vacibdir. Bununla belə hiss olunur ki, məhz dərsin özündə, yaratdığı fəaliyyətdən alınan xoş əhvali-ruhiyyə uşağın başqa fənn dərslərində də uğurlar qazanmasına köməklik edir, onların maraqla qarşılanmasına və mənimsənilməsinə zəmin yaradır.

Təcrübə göstərir ki, bu uşaqların həyat tərzi, daxili aləmi, qavrama qabiliyyəti, həyata münasibəti, insanlarla ünsiyyəti sağlam uşaqlardan xeyli fərqlənir. Xəstə uşaqları həddindən artıq dərin hissiyyat və çox böyük daxili gərginlik xarakterizə edir.

Bu məsələlər, ilk növbədə xəstə uşaqları öz qayğısı ilə əhatə edən ailə üzvləri ilə birlikdə, müəllimlərinin üzərinə düşür. Müəllim tək xəstə uşağın özü ilə işləmir, valideynlər ilə birgə uşağın çətin təlim fəaliyyətini düzgün istiqamətləndirərək, onun tərbiyəsinə təsir edir, uğurlar üçün şərait yaradır.

Hamımıza bəllidir ki, xəstə uşağın hələ formalaşmamış xasiyyətində bir çox mənfi hallar olur. Bu da onun emosional vəziyyətinə, təlim fəaliyyətinə müəyyən dərəcədə mənfi təsir göstərir. Çoxillik pedaqoji təcrübə göstərir ki, eyni diaqnozlu xəstə uşaqlar təlimdə özlərini çox fərqli göstərirlər. Xəstə uşaqlar iş prosesində bir çox müşahidələr, fərdi söhbətlər göstərir ki, əldə olunan nəticələrin təhlilindən sonra münasib pedaqoji təsirli üslublar tapılıb, istifadə oluna bilər.

Xəstə uşaqların təlim-tərbiyəsi çox böyük zəhmət və biliklə birlikdə həssaslıq, dözüm də tələb edir. Müəllim işini qurduqda, xəstə uşağın psixi vəziyyətini, emosional sabitliyini, dərs mövzusuna münasibətini və s. nəzərdə saxlamalıdır. Təlim materialının dərsdənkənar vaxtı xəstə uşaq tərəfindən qavranılması, ona uşağın marağı, bəzi məsələlərlə bağlı problemli halları valideynlə ünsiyyətdə aydınlaşdırılıb, işi düzgün istiqamətləndirilməlidir.

Gözəlliyin özü, estetikanın öz çərçivəsinə sığan nə varsa, uşaqların qavrama qabiliyyəti əsasında qəlbinə tezliklə yol tapıb onları daha mehriban edir, narahat və daim yenilik axtarmaqda olan daxili aləminin zənginləşməsi üçün şərait yaradır. Əsas odur ki, estetik tərbiyə uşaqların hislərinin tərbiyəsinə səbəb olur. İnsanın hər hansı xüsusiyyətinin təzahür etməsi, ilk növbədə onun hissi tələbatından irəli gəlir. Bu baxımdan estetik tərbiyənin uşaq həyatında rolu

əvəzsizdir. Gözəllikdən doğan estetik hislər insanın ümumi inkişafı ilə əlaqədar surətdə tədricən təşəkkül tapır.

Estetik tərbiyənin ağır və çətin tərbiyə olunan uşaqlara müsbət təsiri, onların bir çox mənəvi aləmi ilə bağlı tərbiyə məsələlərindəki problemli düyünləri açmağa kömək edib. Estetik tərbiyə anomal və ruhi xəstə uşaqların çətin və çoxlarının fikri ilə mümkün olmayan mənəvi tərbiyələrində ciddi nöqsanları aradan qaldırmaqla, onların təlim və sağlamlığı ilə bağlı bir çox problemlərin həllini mümkün etmiş olur. Onu da qeyd etmək vacibdir ki, estetik tərbiyə bir çox xəstə uşağı ictimai həyata qaytarıb. Bu baxımdan bir daha estetik tərbiyənin mahiyyətini dəqiqləşdirmək istərdik.

Estetik tərbiyə yalnız incəsənət nümunələri ilə verilən tərbiyə kimi izah oluna bilməz. O, insanları təbiətdə və məişətdə, fikirdə və davranışda, ictimai həyatın digər sahələrində olan gözəlliklər vasitəsi ilə tərbiyə etməyi, eyni zamanda müasir həyatda və yeni cəmiyyətin problemləri ilə əlaqələndirib müəllimlərin apardıqları işlərdə uşaqları hər cür zövqsüzlüyə və eybəcərliyə qarşı mübarizə etmək bacarığının formalaşdırılması ilə birgə həyatın özünü gözəllik qanunları ilə qurmağı nəzərdə tutur.

Yuxarıda qeyd olunduğu kimi, xəstə uşaqlar xüsusi məktəb və internatda tərbiyə alır. Onların təlim fəaliyyəti xüsusi proqramla təşkil olunur. Bu uşaqların qüsuruna görə onları bir neçə kateqoriyaya bölüblər. Onlar xüsusi tipli təhsil ocaqlarında xüsusi proqramla, metodikayla, tədris və əyani vasitələrlə tərbiyə alırlar. Təhsil Nazirliyinin nəzdində qeyd etdiyimiz xəstə uşaqlar üçün xüsusi məktəblərin və məktəbəqədər müəssisələrin diferensiallaşmış şəbəkəsi mövcuddur. Respublikamızda yaradılmış tibbi-pedaqoji komissiya qüsurlu uşaqların xüsusi təlim müəssisələrinə yerləşdirilməsini müəyyənləşdirir. Lakin sağlamlıq imkanları məhdud olan uşaqların arasında pozuntular olan başqa bir qrup uşaqlar da mövcuddur: davranışı psixopatik formalı uşaqlar. Bunlar Səhiyyə Nazirliyinin, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin əlaqədar müəssisələrində tərbiyə alırlar.

Səhiyyə Nazirliyinin sistemində uşaqların yaşaması üçün gecə-gündüzlü körpələr evi, mərkəzi sinir sisteminin orqanik pozulması olan uşaqlar üçün ruhi-sinir xəstəliklərin sanatoriyası fəaliyyət göstərir.

Saray qəsəbəsindəki 7 nömrəli internat və Mərdəkan qəsəbəsindəki 3 nömrəli internat xəstə uşaqları saxlayıb, lazımi tibbi xidmət edir. Aşkar edilən və burada saxlanılan uşaqların sayı hazırda 285 nəfərdir.

Qarşımızda duran məqsəd estetik tərbiyə vasitəsi ilə xəstə uşaqların təlimə hazırlanmasını mümkün etmək, onların bir çox psixi xüsusiyyətlərinə təsir edərək, inkişafı üçün şərait yaratmaqdan ibarətdir. Məhz psixi inkişafın nəticəsində ümumi təlim ilə bağlı bir çox məsələlərin həlli yolu tapıla bilər. Bununla belə, xəstə uşaqların hissiyatına təsir edib, onları estetik fəaliyyətə cəlb etməklə, aktiv və çoxsahəli estetik fəaliyyətlə məşğul olmaqla onlarda sabit maraq, həvəs və tələbat yaratmaq olur. Estetik tərbiyənin bir neçə istiqamətində uşaqlara diqqət yetirməklə, onların psixoreabilitasiya üçün şərait yaratmaq vacib məsələlərdən biri kimi qarşıda durur.

Beləliklə, göründüyü kimi, ağır xəstə uşaqların təlim-tərbiyəsi, onların ictimai həyata qaytarılması və müəyyən qismin istehsalat fəaliyyətinə qoşulması mürəkkəb sosial və pedaqoji problemdir.

*Rəyçi: dos. Ş.Ağayev*

* 7

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ BİOLOGİYA FƏNNİNİN TƏDRİSİNDƏ ŞAGİRDLƏRƏ TİBBİ BİLİKLƏRİN VERİLMƏSİ

**Həqiqət Hacıyeva**
***ADPU-nun dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *tibbi bilik, biologiya fənni, ekoloji problem, infeksion xəstəliklər, zədələnmələr, xalq təbabəti, dərman bitkiləri, bakteriyalar, göbələklər, viruslar, dezinfeksiya, dezinseksiya, deratizasiya.*

***Ключевые слова:*** *медицинские знания, предмет биологии, экологическая проблема, инфекционные заболевания, повреждения, народная медицина, лекарственные растения, бактерии, грибы, вирусы, дезинфекция, дезинсекция, дератизация.*

***Key words:*** *medical knowledge, biology subject, ecological problem, infectious diseases, injuries, folk medicine, herbs, bacteria, fungus, viruses, disinfection, general nutrition.*

Dünya ölkələrində gedən iqtisadi-siyasi inkişaf, elmi-texniki tərəqqi, ekoloji proseslər, təhsil sahəsində baş verən dəyişikliklər insanların sağlamlığına müəyyən təsir göstərir, onun qorunması problemini aktuallaşdırır. Ekoloji problemlərin: təmiz hava, su, qida məhsullarının çatışmazlığı, müharibələr, insanlararası münasibətlərin pozulması sağlamlığa ciddi zərbə vurur.

Ailə münasibətlərinin kəskinləşməsi, boşanmaların sayının artması ilə uşaqların ata-ana qayğısından məhrum olması, infeksion xəstəliklərin yayılması, uşaq alveri kimi problemlər gələcək nəslin sağlam böyüməsinə inamı azaldır.

Digər tərəfdən, texnikanın sürətli inkişafı, onlardan istifadə edənlərin sayının günü-gündən çoxalması, terror və qəzaların sayının artması insanların sağlamlığını təhlükə altına alır. Ətraf mühitin, xüsusilə bitki və heyvanların lazımi səviyyədə qorunmaması heyvan xəstəliklərinin, xüsusilə zoonoz infeksiyaların insanlara yoluxmasına şərait yaradır.

Kimyəvi dərman preparatlarından istifadənin zərərli olması xəstəliklərin profilaktika və müalicəsində təbii vasitələrə geniş yer verilməsini labüd edir. Əhalinin xalq təbabətini, təbii vasitələri öyrənməsi və onlardan geniş istifadə etməsi zərurəti yaranır. Sağlamlığın qorunmasını çətinləşdirən bütün bu amillər hamının tibb işçiləri ilə birgə fəaliyyət göstərməsini tələb edir. Cəmiyyət üzvlərinin belə bir ciddi problemin həllinə cəlb edilməsi onların tibbi biliklərə malik olmasını şərtləndirir. Əhalinin tibbi biliklərə yiyələnməsi məktəblərdə fənlərin tədrisində həll olunmalıdır. Tibb elminə daha yaxın olan biologiya fənninin tədrisində problemin həllidə geniş imkanlar mövcuddur. Odur ki, bu sahəyə müəllimlər, xüsusilə biologiya müəllimləri daha ciddi yanaşmalıdırlar.

Şagirdlərə sağlamlığın qorunmasına dair tibbi biliklərin verilməsi fənn kurikulumlarının əsas tələblərindəndir. Biologiya fənn kurikulumunun məzmununda insan sağlamlığına geniş yer verilmişdir. Fənn

kurikulumunun məzmununda ümumi təlim nəticələrində deyilir: Ümumi təhsil pilləsi (VI-IX siniflər) üzrə şagird zədələnmələr zamanı ilk tibbi yardım göstərir, xəstəliklər zamanı profilaktik tədbirlər görür (6.s.5).

Məzmun xətlərinə gəldikdə isə dörd məzmun xəttindən biri "İnsan və onun sağlamlığı" kimi götürülmüşdür. Bu məzmun xətti üzrə şagirdlər insanın psixi xüsusiyyətlərinin sosial mahiyyəti ilə tanış olur, insan orqanizminin bəzi funksional anormallıqları, onu doğuran səbəblər və onların aradan qaldırılma yollarını, sağlam həyat tərzinə nail olmaq, xəstəliklər, zədələnmələr zamanı özünə və ətrafındakılara ilk yardım göstərmək, reproduktiv sağlamlığı qorumaq bacarığına yiyələnmiş olurlar.

Adı çəkilən məzmun xəttinin əsas standartı:

Sağlamlığın qorunmasına dair bacarıqlar nümayiş etdirir kimi müəyyən olunmuşdur. Alt standartlar VI sinif üçün 3.2.1. bitki və heyvanların insan sağlamlığında rolunu izah edir; 3.2.2. Dərman bitkilərini fərqləndirir.

VII sinifdə alt standartlar 3.2.1. virus, bakteriya, göbələk və heyvanların insan orqanizmində törətdiyi xəstəlikləri sadalayır; 3.2.2. Müalicəvi xassələrinə görə dərman bitkilərini quruplaşdırır.

VIII sinif üzrə alt standartlar 3.2.1. sağlamlığın qorunması qaydalarını izah edir. 3.2.2. Xəstəliklər, zədələnmələr zamanı ilk tibbi yardım göstərir.

IX sinifdə alt standartlar 3.2.1. irsi xəstəliklər, onların qarşısının alınması yollarını faktlarla izah edir. 3.2.2. Sağlam həyat tərzinin əhəmiyyətini şərh edir, referatlar hazırlayır.

X sinifdə alt standartlar 3.2.1. yoluxucu xəstəliklər, onlardan qorunma yolları haqqında referat, təqdimat hazırlayır; 3.2.2. sağlam həyat tərzində gigiyena qaydalarının rolunu və əhəmiyyətini dəyərləndirir, məruzə və təqdimatlar hazırlayır.

XI sinifdə alt standartlar 3.2.1. İnsan orqanizmində baş verən xəstəliklərin hüceyrə səviyyəsində olduğunu əsaslandırır, məruzə və təqdimatlar hazırlayır; 3.2.2. Sağlam ailənin qurulmasında sağlam həyat tərzinin rolunu dəyərləndirir, məruzə və təqdimatlar hazırlayır.

Göründüyü kimi, biologiya fənn kurikulumunun məzmununda şagirdlərə tibbi biliklərin verilməsi imkanları genişdir. Təlim nəticələri, əsas və alt standartlarda tibbi biliklərin verilməsi sistemli və ardıcıllığı ilə seçilir.

Burada yuxarı siniflərə keçdikcə veriləcək tibbi biliklər sadədən mürəkkəbə doğru mürəkkəbləşir, şagirdlər tam orta təhsil pilləsini başa vurduqda onlar daha mükəmməl tibbi bilik və bacarıqlara yiyələnmiş olurlar. Fənnin tədrisi imkanları əsasında tibbi biliklərin verilməsi şagirdlərin sağlam böyümə və inkişafına da müsbət təsir göstərir.

İmkanlar ondan ibarətdir ki, bitkilər kursunu tədris edən müəllim şəfaverici və insanın xəstələnməsinə səbəb olan bitkiləri ayırır və onlardan necə istifadə edilməsi, qorunma qaydalarını öyrədir. Mövzulara uyğun olaraq dərman bitkilərini şagirdlərə tanıdır, onlardan istifadənin yollarını izah edir.

Dərslikdə Azərbaycan florasından 80-dən artıq dərman bitkisinin adı çəkilir. Onlar yabanı və mədəni bitki olmaqla hər hansı bir xəstəliyə müalicəvi təsir göstərir. Adları çəkilən dərman bitkilərinin çox az qisminə dair dərslikdə məlumat verilir. Əksəriyyətinin şəfaverici təsiri, dərmanın hazırlanması və qəbulu qaydaları haqqında danışılmır. Müəllim onlara dair lazımi məlumatı toplamalı və ya bu işi şagirdlərinə həvalə etməlidir. Materiallar, mövzular əsasında dərslərə gətirilməli, şagirdlərə onları tanımaq və qorumaq bacarıqları aşılanmalıdır. Bir çox

dərman bitkiləri meyvə, tərəvəz, bostan olmaqla məişətimizdə geniş istifadə edilir. Onların faydası, xüsusilə şəfaverici xassələri şagirdlərə izah olunmalıdır. Qeyd olunmalıdır ki, orqanizmin sağlamlığı üçün zəruri maddələr olan vitaminlərin, mineral duzların əksəriyyəti həmin bitkilərin tərkibində mövcuddur. Dərman bitkilərinin şagirdlər tərəfindən tanınması onların həmin bitkilərdən lazımi normada və qaydada istifadə etməsinə, onları qorumasına, becərilməsində fəallıq göstərməsinə zəmin yaradır.

Müəllim sağlamlığa ciddi zərər vuran tütün, tiryək, tənbəki, çətənə kimi bitkilər və onlardan istifadənin zərərini şagirdlərə aydınlaşdırır, onlardan qorunmağın yollarını açıqlayır. Alkoqolun da bitki orqanlarından, xüsusilə meyvə və toxumlardan alındığını qeyd edir. Onların orqanizmin sağlamlığına zərərini izah etməklə, alkoqollu içkilərdən şagirdlərin uzaq olması yollarını göstərir. Belə içkilərin heç kimə faydalı olmadığını, əksinə cinayətlərə yol açdığını qeyd edir.

Müəllim bakteriyalar haqqında bilik verərkən onların faydalı nümayəndələri ilə yanaşı, xəstəlik törədənləri də öyrətmək imkanı qazanır. Bakterial xəstəliklər (piodermit, bronxit, tonzillit, pnevmoniya, qastrit, nefrit və s.), onlarla mübarizə yollarını izah edir. Törədicilərin çox kiçik mikroskopik ölçüdə olmaqla, gözlə görünmədiyini söyləyir. Virusların quruluş və xüsusiyyətlərini aydınlaşdırarkən onların törətdikləri təhlükəli virus xəstəlikləri (qrip, qızılca, hepatit, quduzluq və s.) və onlardan qorunmanın səmərəli yolları izah edilir.

Göbələklərə dair mövzuların tədrisində daha çox yer papaqlı göbələklərin quruluş və xüsusiyyətlərinə verilmişdir. Parazit göbələklər, onların törətdiyi xəstəliklər, onlardan qorunma yolları göstərilməmişdir. Ona görə də müəllim göbələklərin öyrədilməsində onların faydası, istifadə qaydaları ilə yanaşı, göbələk xəstəlikləri (epidermofitiya, kandidozlar, kandidomikozlar, trixofitiya və s.), onların yoluxma xüsusiyyətləri, göbələk xəstəliklərinin qarşısının alınması məsələlərini şagirdlərə aydınlaşdırmalı olur. Yeməli göbələklərdən istifadə qaydalarını izah edən müəllim onların orqanizmə verdiyi faydanı qeyd edir. Göstərir ki, vaxtı keçmiş və zəhərli göbələkləri tanımaq və onlardan istifadə etməmək lazımdır. Göbələklə zəhərlənmələrdə ilk tibbi yardımı da müəllim izah edir.

Adları çəkilən xəstəlik törədiciləri ilə baş vermiş yoluxucu xəstəliklərin ümumi əlamətləri, yoluxma yolları öyrədildikdən sonra onlarla mübarizədə aseptika, antiseptika, sterilizasiya qaydaları şagirdlərə izah edilir və həmin qaydalara daim riayət edilməsi tövsiyə olunur. Şagirdlərə çatdırılır ki, insan daim təmizliyinə diqqət etməklə, xəstəliklərin xüsusiyyətlərini öyrənməklə sağlamlığını qorumalıdır.

Zoologiya kursunu keçərkən şagirdlərə heyvan xəstəlikləri, heyvanların insanlarda törətdiyi xəstəliklər, onlardan insanlara keçən zoonoz infeksiyalar və onların yoluxmasının qarşısının alınması, müalicə və profilaktikası öyrədilir. İbtidai heyvanlardan dizenteriya amöbü, leyşmaniya, lyambliya, malyariya paraziti kimi mikrobların törətdiyi xəstəliklərə dair şagirdlərə məlumatın verilməsi, onlarla mübarizə üsullarının öyrədilməsi çox vacibdir.

İnsanlara yoluxan heyvan xəstəlikləri: bruselyoz, taun, helmintozlar, malyariya, quduzluq və başqalarının törədiciləri, yayanları, xəstəliyin əlamətləri, profilaktikası, müalicəsinə dair materialın şagirdlərə izah edilməsi yaxşı nəticə verir.

Müəllim adları çəkilən xəstəliklərin çox kiçik ölçüdə mikroskopik heyvanlar tərəfindən törədildiyini qeyd edir. Mövzulara müvafiq olaraq onların quruluşu, həyat tərzi, törətdiyi xəstəlik, onun insanlar arasında yayılmasına dair biliklər verir. On-

ların şəkillərini, videogörüntülərini nümayiş etdirməklə şagirdlərdə xəstəliklərə dair müfəssəl təsəvvür yaradır. Onlardan qorunmağın yollarını izah edir.

Dərslikdə qurdlar haqqında material genişdir. Müəllim onlara istinad edərək insanlarda parazitlik edən öküz soliteri, qaraciyər sorucusu, exinakokk, askarid və başqalarının törətdiyi helmintoz xəstəliklərini şagirdlərə izah edir. Onların quruluşunu, inkişaf tsiklini, xəstəliyin əlamətləri, yayılma yolları, profilaktika və müalicəsinə dair bilikləri şagirdlərə çatdırır. Helmintozlarla mübarizədə şəxsi gigiyenanın gözlənilməsinin zəruriliyini qeyd edir.

Bəzi heyvanlar: ağcaqanad, arı, hörümçək, əqrəb, balıq, ilan, timsah, yırtıcı və ev heyvanları insanları müxtəlif formada zədələyirlər. Həmin zədələnmələrdə ilk tibbi yardım göstərilməsi üsulları, zədələnmələrdən qorunma yolları şagirdlərə izah edilməli, bu sahədə bacarıqlar aşılanmalıdır.

Bir çox heyvanlar (it, pişik, inək, qoyun, siçovul və s.) müxtəlif xəstəlik törədicilərini gəzdirir və insanlarla təmasda onlara yoluxdururlar. Belə heyvanlarla təmasda olarkən ehtiyatlı olmaq, şəxsi gigiyenaya diqqət edilməsinin vacibliyi şagirdlərə izah edilir.

Xəstəlik törədən, xəstəlikləri yayan heyvanlara qarşı mübarizə üsulları (dezinfeksiya, dezinseksiya, deratizasiya tədbirləri) şagirdlərə öyrədilməli, onlardan şəxsi gigiyenaya daim diqqət edilməsi tələb olunmalıdır.

Bir sıra heyvanlar vardır ki, onların məhsulları şəfaverici xüsusiyyətlərə malikdir. Arının hazırladığı min bir dərdin dərmanı bal, vərəmum, arı südü, çiçək tozu belələrindəndir. Həşəratlar (cücülər) sinfinin tədrisində onun əsas nümayəndələrindən biri olan arının həyat tərzi, quruluşu, əhəmiyyəti öyrədilərkən onun insan sağlamlığına fayda verən bal və digər məhsulları, onların istifadəsi, şəfaverici xassələri izah edilir. Balın orqanizmin sağlamlığında əvəzsiz bir qida olduğu qeyd edilir. Sürünənlər sinfinin heyvanları öyrədilərkən ilanın həyat tərzi, quruluşu, çoxalması, təbiətdə rolu aydınlaşdırılır. Materiala ilan zəhərinin çox faydalı olması, onun alınması, dərmanların hazırlanması, onlardan bir sıra təhlükəli xəstəliklərin müalicəsində istifadə olunması məsələləri mövzuya əlavə edilir. Belə heyvanların mühafizəsi, onların məhsullarından sağlamlıq üçün istifadə olunmasının əhəmiyyəti göstərilir.

Xordalılar tipinin “Quşlar sinfi” bəhsini tədris edərkən quşların həyat tərzi, müxtəlifliyi, çoxalma və inkişafı, təbiətdə, insan həyatında, iqtisadiyyatda rolu kimi məsələlərə yer verilir. Quş məhsullarının şəfaverici, sağlamlığa müsbət təsiri izah edilir. Bir sıra ov quşlarının əti, yumurtası müxtəlif xəstəliklərin müalicəsində, xəstəliklərə qarşı müqavimətin, immunitetin yüksəldilməsində istifadə olunduğu qeyd edilir. Məsələn, kəklik əti qanyaradıcı olmaqla mədə-bağırsaq, sinir sistemi, xüsusilə iflicdə çox faydalıdır. Onun yumurtası səs tellərinin xəstəliklərində, nitqin açılmasında, şişin çəkilməsində müalicəvi təsir göstərir. Durna ətindən böyrək xəstəliklərində, xüsusilə böyrəkdaşı xəstəliyində daşın əriməsinə, ekzema xəstəliyinin müalicəsində istifadə edilməsi yaxşı nəticə verir. Bildirçin əti sidikqovucu xüsusiyyətə malikdir, yumurtası körpələrin tez dil açmasına, nitqin inkişafına kömək edir. Qaranquş əti qaraciyər, dalaq, dəri xəstəliklərində çox faydalıdır. Burada quşlarda törənən bəzi xəstəliklərin insanlara yoluxduğu da göstərilir.

Müəllim quşlara dair mövzuların tədrisində quş qripi xəstəliyinin əlamətləri, yoluxma yolları, xəstə quşların tanınması, onlarla rəftar qaydalarını şagirdlərə aydınlaşdırır.

Məməli heyvanlara gəldikdə isə onların quruluşu, müxtəlifliyi, həyat tərzi, çoxalma və inkişafı, təbiətdə, insanların sağlamlığında faydası nəzərə çatdırılır. Əti, südü, digər məhsullarının müalicəvi təsiri göstərilir. Qanından serum, qammaqlobulin, müxtəlif peyvəndlər hazırlandığı, qanyaradıcı məhsulların istehsal olunduğu qeyd edilir.

Heyvanların insan sağlamlığında rolu şagirdlərə izah edilməklə onlara heyvanların mühafizəsi, iqtisadi, ekoloji, tibbi-gigiyenik bilik və bacarıqlar aşılanır. Zoologiya kursunun tədrisində verilmiş tibbi biliklər insan kursunda davam etdirilir. İnsan kursunun tədrisində şagirdlərə insan orqanizminin quruluşu və orada gedən fizioloji proseslərlə yanaşı, patoloji dəyişikliklər də izah olunur. Şagirdlərə orqanizmin sağlamlığı, onun qorunması yolları əyani olaraq çatdırılır. Sağlamlığı pozan amillər mövzulara uyğun izah edilir. İnsanda baş verən iltihabi, yoluxucu, bakterial, virus, göbələk xəstəlikləri, müxtəlif səbəblərdən zədələnmələr, ekstremal vəziyyətlər, zərərli vərdişlər və onların sağlamlığa mənfi təsiri mövzulara müvafiq olaraq şagirdlərə öyrədilir. Xəstəlik və zədələnmələrdə ilk tibbi yardım göstərilməsinin əhəmiyyəti, onların həyata keçirilməsi qaydaları praktik olaraq göstərilir. Kursun tədrisində tibbi biliklərin verilməsi və əvvəlki kurslarda öyrəndiklərinin daha da dərinləşdirilməsi şagirdlərin sağlam şəxsiyyət kimi yetişdirilməsində mühüm rol oynayır. Kursun tədrisində orqanlar sistemi aşağıdakı ardıcıllıqla izah olunur: Sinir sistemi; Vəzilər; Dayaq-hərəkət aparatı; Qan və qan dövranı; Tənəffüs; Həzm; Maddələr mübadiləsi; İfrazat; Dəri; Analizatorlar; Ali sinir fəaliyyəti. Hər bir orqan və orqanlar sisteminin tədrisində onun patologiyası, xəstəlikləri, profilaktika və müalicəsi, xüsusilə xəstəliklərin səbəbləri, əlamətləri, törədici və yayıcıları, onlardan qorunma yolları izah edilir. Xəstəliklərin müalicəsində ağrı, öskürək, ürəkbulanma, yüksək temperatur, qan təzyiqi, ekstremal vəziyyətlər, zədələnmələr, qanaxma, sümük sınıqları, oynaq çıxıqları və başqa əlamətlərin aradan qaldırılmasında ilk tibbi yardım göstərilməsi, təcili tibbi yardım çağırılmasına dair bilik və bacarıqlar aşılanır.

Kursun tədrisində müəllim zərərli vərdişlər, xüsusilə siqaret çəkmə, spirtli içkilərin, narkotik maddələrin qəbulu, onların orqanizmə və cəmiyyətin inkişafına vurduğu ciddi ziyanlar haqqında izahat aparmalıdır. O, siqaretin heç bir faydası olmayan və tüstüsünün tərkibində sağlamlıq üçün zərərli olan yüzlərlə maddənin olduğunu qeyd edir. Təcrübələrin köməyi ilə şagirdlərə siqaret tüstüsünün canlılara (bitki, heyvan) mənfi təsirini əyani olaraq göstərir. Təcrübələrlə şagirdlərə siqaretin sağlamlığa mənfi təsirini sübut edən müəllim onların bir hissəsinə ev tapşırığı kimi siqaretin faydasına dair məlumat və prezentasiya hazırlamağı, nəticələri təqdim etməyi tapşırır. İkinci qrupa siqaretin sağlamlığa, insanın ayrı-ayrı orqanlarına: dişlərə, mədəyə, ağciyərlərə, qaraciyərə, sinir sisteminə, ürəyə, böyrəklərə vurduğu zərərə dair məlumat toplamaqla prezentasiya hazırlaması və təqdimatını aparır.

Şagird qruplarının liderləri tədqiqatlarının nəticələrinə dair şagirdlər qarşısında çıxış edir, müzakirə aparırlar. Nəticələr söylənilir, sağlamlığa ciddi zərər vuran siqaretlə mübarizə aparmaq, ona “yox” demək yollarını şagirdlər müstəqil olaraq öyrənmiş olurlar. Hər bir qrupun çıxışı, təqdimatı qiymətləndirilir, faydalı təkliflər müvafiq təşkilat və qurumlara çatdırılır. Müəllim onların müəyyən etdiyi səmərəli yolları aydınlaşdırır və şagirdlərinə belə faydalı işdə fəallıq göstərməyi tövsiyə edir. Şagirdlərə siqaret əleyhinə reklamlar, tövsiyələr, bukletlər hazırlamaqda, onları əhali arasında yaymaqla təbliğat işlərinə qoşulmaqda kö-

məklik göstərir.

X-XI siniflərdə ümumi biologiyanın tədrisində də verilmiş tibbi biliklərin möhkəmləndirilməsi və daha da genişləndirilməsi imkanları mövcuddur. Belə ki, “Sitologiyanın əsasları” bəhsinin tədrisində hüceyrə, onda gedən prosesləri öyrətməklə müəllim hər bir hüceyrə və toxumanın normal fiziologiyası üçün lazım olan amilləri izah edir, onun patologiyasının səbəblərini göstərir.

“Orqanizmlərin çoxalması və fərdi inkişafı” bəhsinin tədrisində insan orqanizminin çoxalması və inkişafında baş verə biləcək patoloji proseslər, çoxalma və inkişafa mane olan amillər, normal inkişafı təmin edən vasitələr izah olunur.

“Genetikanın əsasları” bəhsinin tədrisində insanın genetik aparatı, onun normal, sağlam fəaliyyəti, dəyişkənlik və irsiyyət məsələləri, mutasiya dəyişkənliyi, onun sağlamlığa mənfi təsiri, irsi xəstəliklər, onların xüsusiyyətləri, onlardan qorunma yolları göstərilir.

“Bitki, heyvan və mikroorqanizmlərin seleksiyası” bəhsinin tədrisində bir çox xəstəliklərin qarşısının alınmasında, dərman preparatlarının, peyvəndlərin istehsalında seleksiyanın nailiyyətlərindən istifadə edildiyi aydınlaşdırılır.

“Ekologiyanın əsasları” bəhsinin tədrisində də insan sağlamlığına müsbət və mənfi təsir edən ekoloji amillər təmiz hava, su, qida məhsulları, onlardan yerində və düzgün istifadə qaydaları, ekoloji tarazlığın daim saxlanmasına diqqət edilməsi kimi məsələlər izah edilir. Şagirdlərə bioloji, ekoloji biliklərlə yanaşı, tibbi bilik və bacarıqlar aşılanır.

Şagirdlərə tibbi bilik və bacarıqların verilməsində fəal təlim metodlarının tətbiq edilməsi təlimin keyfiyyətini yüksəldir, şagirdlərin məntiqi, yaradıcı təfəkkürünün inkişafını təmin edir, onların sağlam vətənpərvər şəxsiyyət kimi yetişməsini asanlaşdırır.

Biologiya dərslərində tibbi bilik və bacarıqların aşılanması imkanları geniş olduğu kimi onun həyata keçirilməsi yolları da müxtəlifdir. Bunlara:

- Tibbi biliklərə dair materialın biologiya mövzularına əlavə edilməsi;
- Mövzunun digər fənlərlə, həyatla əlaqələndirilməsi;
- Tibbi məlumatların, faktların, statistik rəqəmlərin toplanması,
- Tibb müəssisələrinə ekskursiyaların təşkili;
- Tibbin müasir nailiyyətlərini əks etdirən materialların internet səhifələrindən əldə edilməsi;
- Tibbi-gigiyenik məsələlərin həlli ilə bağlı tədqiqat xarakterli tapşırıqların yerinə yetirilməsi;
- Sağlamlıqla bağlı əlavə tibbi ədəbiyyatların mütaliəsi;
- Dərslərdə əyani və texniki vasitələrdən istifadə edilməsi;
- Tibbin aktual problemlərinə həsr olunmuş bülleten, buklet və referat işlərinin hazırlanması və s. misal göstərmək olar.

Tibbi bilik və bacarıqlar şagirdlərin sağlam böyümə və inkişafına, xəstəlik və zədələnmələrdən, zərərli vərdişlərdən uzaq olmasına, sağlamlıq naminə ətraf mühitin mühafizəsi işlərinə qoşulmasına, ekoloji tarazlığın qorunması vəzifəsinin həyata keçirilməsinə müsbət təsir göstərir. Ən əsası tibbi biliklərin verilməsi şagirdlərin sağlam, gümrah, vətənpərvər şəxsiyyət kimi yetişməsinə kömək edir. Ona görə də tibbi biliklər şagirdlərə fənnin bəhs və mövzularının xüsusiyyətləri nəzərə alınmaqla ardıcıl, sistemli, pedaqoji prinsiplər əsasında verilməlidir. Nəzəri biliklər həyatla əlaqələndirilməli, praktik tapşırıqların yerinə yetirilməsinə diqqət edilməlidir. Şagirdlərin tibbi bilik və bacarıqları yoxlanılmalı, qiymət-

ləndirilməlidir. Dərslərdə öyrədilməsi çətinlik törədən sağlamlığa dair zəruri tibbi biliklərin verilməsi sinifdənxaric tədbirlərdə davam etdirilməlidir.

*Rəyçi: prof. S.Əliyev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əliyev S., Hacıyeva H., Mikayılzadə N., Tibbi biliklərin əsasları. Ali məktəblər üçün dərslik. Azərbaycan Tibb Universiteti. Bakı, 2004.
2. Fərəcov Ə., Səlimov R., Quliyev R. Biologiya – 9. İnsan. Bakı: Çaşıoğlu, 2012.
3. Ələkbərov U., İsmayılov V., Ağamirov Ü. Biologiya. Ümumtəhsil məktəblərinin 7-ci sinfi üçün dərslik. Bakı: Xəzər, 2012.
4. Sultanov R. və b. Zoologiya 7. Bakı, Şərq-Qərb, 2011.
5. Hacıyeva H. Ümumtəhsil məktəblərində biologiya fənninin tədrisində tibbi biliklərin öyrədilməsi üzrə işin sistemi (monoqrafiya). Bakı: Ünsiyyət, 2007.
6. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün biologiya fənn kurikulumu, Bakı, 2012.

**Х.Гаджиева**

**Обучение учащихся медицинским знаниям при преподавании предмета биологии в общеобразовательных школах**

**Резюме**

В статье говорится о возможностях, методах, формах и путях обучения учащихся медицинским знаниям при преподавании предмета биологии в общеобразовательных школах. Разъясняется значение развития медицинских знаний и умений при преподавании предмета биологии. Показывается связь биологии с медицинской наукой, возможности их использования при преподавании предоставляются по темам. Выясняются возможности каждого курса (ботаника, зоология, человек, общая биология) в деле привития медицинских знаний и умений. Проводятся эксперименты и устанавливаются методы, полезность которых подтверждаются.

**H.Hajiyeva**

**Provision of medical knowledge for the students in teaching biology subject in secondary schools**

**Summary**

The article deals about the opportunities, method, form and ways of provision of medical knowledge for the students in teaching biology subject in secondary schools. The importance of engrafting medical knowledge and skills in teaching biology to students is explained here. Contacts of biology with medicine is indicated, their usage opportunities in education are given on the themes. The opportunities of grafting medical knowledge and skills of each course (plants, zoology, human, general biology) are clarified. The ways with approved benefits are identified through being experimented.

# AZƏRBAYCANDA MƏKTƏB KİTABXANALARININ İNKİŞAF TARİXİNDƏN

**Yusif Qazıyev**
***pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *kitabxana, kitabxanaçı, beşillik, qərar, sinifdənxaric, mütaliə.*
***Ключевые слова:*** *библиотека, библиотекарь, пятилетка, решение, внеклассное, чтение.*
***Key words:*** *library, librarian, five-year term, resolution, outofclass, reading.*

Ötən əsrin 20-ci illərində kitabxanalar özünün yeni mərhələsinə daxil oldu. 1929-1933 və 1934-1938 illər məktəb kitabxanalarının məhsuldar dövrü kimi qiymətləndirilməlidir.

Bu illərdə Azərbaycanda məktəb kitabxanaları dövlət planı və büdcəsi əsasında sürətlə inkişaf etməyə başladı. Bu dövrdə kifayət qədər bədii uşaq ədəbiyyatı və dərsliklər nəşr edildi. Təkcə 1929-cu ildə I və II dərəcəli məktəblər üçün Azərnəşr tərəfindən 50 adda 534000 nüsxə, 1930-cu ilin 9 ayında isə 49 adda 693000 nüsxə dərslik çap edilmişdir.

Bu dövrdə məktəb kitabxanalarına qarşısında aşağıdakı vəzifələr dururdu: mütaliə vasitəsilə dərslərdə alınan bilikləri genişləndirmək; şagirdlərdə əməyə məhəbbət oyatmaq normaları tərbiyə etmək, eyni zamanda kitab üzərində müstəqil işləmək bacarıqlarını, şagirdlərin fərdi istedad və qabiliyyətlərini inkişaf etdirmək, onları ictimai həyata hazırlamaq və s.

1929-cu ildə "Kitabxana işini yaxşılaşdırmaq haqqında"kı qərarda kütləvi kitabxanaların uşaqlara necə xidmət etmələri müəyyənləşdirilirdi. Qərarda 1929-1930-cu illərdə kitabxanalrın nəzdində olan uşaq şöbələri şəbəkəsinin ən azı 50 faiz artırılması nəzərdə tutulurdu.

Kitabxanaçılar öz iş üsullarını yaxşılaşdırır, təkmilləşdirir və yeni iş üsulları yaradırdı. Mütaliənin səmərəli olması üçün məktəb kitabxanasında da müəyyən işlər aparılırdı.

Bu qərarlarda ədəbiyyat dərslərinin mövqeyini yüksəltmək üçün mühüm vəzifələr irəli sürülürdü. Bu vəzifələrin yalnız dərslərin keçirilməsi ilə kifayət qədər ödənilmədiyi göstərilirdi. Ona görə də ədəbiyyat dərsləri üzrə sinifdənxaric mütaliənin təşkili barədə mətbuatda məqalələr dərc edilirdi. Azərbaycan SSR Elmlər Akademiyasının həqiqi üzvü olmuş F.Qasımzadə "Məktəbdənxaric bədii qiraət haqqında" məqaləsində sinifdənxaric mütaliənin əhəmiyyəti ilə bağlı qeyd edirdi ki, sinifdənxaric bədii əsərlərin şagirdlər tərəfindən mütaliəsi bir tərəfdən onların ədəbiyyatdan məlumatlarını genişləndirir, onlarda bədii zövq və bədii tərbiyəni yüksəldirsə, digər tərəfdən..... məktəbdənxaric mütaliənin siyasi əhəmiyyəti də vardır.

Müəllif məqalədə sinifdənxaric mütaliənin müəllimin ümumi iş planına daxil olmasını irəli sürürdü. O, oxucuların mütaliə gündəliyinin olmasını, kitabxanaların şagirdlərin bu işə cəlb olunmasını məsləhət verir. Qeyd edir ki, şagirdlərin nə kimi əsərlər alıb oxumasına, əsərin hansı cəhətinə daha çox fikir verdiyinə diqqət yetirmək lazımdır. O dövrdə sinifdənxaric mütaliənin

əhəmiyyətini göstərmək və onun təşkili məsələlərini işıqlandırmaqda bu məqalənin çox böyük rolu və əhəmiyyəti olmuşdur. Çox gözəl niyyətlə yazılmış bu fikirlər 1940-cı ildə müəllif tərəfindən "Ədəbiyyatın metodikası" kitabında qismən inkişaf etrdirilmişdir. Ədəbiyyatın tədrisi metodikasının işlənməsi ilə əlaqədar olaraq nəşr edilən vəsaitlərdə sinifdənxaric işlərə, o cümlədən mütaliənin təşkili metodikasına da xüsusi yer verilirdi. Bu məsələ proqramlarda da ildən-ilə xeyli yer tuturdu. Bir sözlə, bu məqalənin o vaxt sinifdənxaric mütaliənin metod və üsullarının formalaşmasında böyük əhəmiyyəti və rolu olmuşdur.

1 yanvar 1935-ci il məlumatına əsasən Azərbaycanda 625 kitabxana olmuşdur. Bunlardan 278-i kütləvi, 212-i məktəb və uşaq (bunlardan 42-i Bakıda), 135-i elmi-kütləvi kitabxana idi. Bütün kitabxanaların kitab fondu 4.541.211 nüsxə idi. 3.173 ibtidai, yeddiillik və orta məktəbdə 488493 şagird olmuşdur. Mövcud kitabxanalar isə lazımi səviyyədə deyildi.

1935-ci il ərzində Azərbaycanın rayonlarında 20 yeni kitabxana yaradılmışdır. 1936-cı ildə isə rayonlarda daha 87 məktəb kitabxanası təşkil edildi.

Azərbaycan SSR XMK şagirdlərin mütaliəsinə ciddi rəhbərlik məqsədi ilə 1935-ci ildə məktəb kitabxanaları üçün 18 maddədən ibarət təlimat hazırlayıb maarif müəssisələrinə göndərdi.

Təlimatda kitabxananın xidmət və metodiki işinin məzmunu göstərilirdi. Xidmət işləri: kitab dövriyyəsi, kitabların mühafizə və istifadə qaydaları, kitabxana texnikasının qoyuluşu haqqında təlimatlar və mütaliə üçün tövsiyə siyahıları geniş məzmunla izah edilirdi.

Qarşıya məqsəd kimi qoyulmuşdu ki, məktəblilərin uşaq yaşlarından kütləvi kitabxanalarından istifadə etməyi bacarmalı, müəllimlər, uşaq və məktəb kitabxanaları işçiləri isə uşaqları həmin kitabxanaların işi ilə tanış etməli; oraya vaxtaşırı ekskursiyalar təşkil etməli, habelə əlaqəli şəkildə işləməyi ön plana çəkməlidirlər, kitabxana hesabatının statistik blanklarında uşaq ədəbiyyatının miqdarını əksetdirən xüsusi qrafaların olmasını tələb edirdi; o, uşaq kitabxanalarını metodik mərkəz hesab edirdi.

Məktəb kitabxanalarının kitab fondunun zənginləşməsində ictimaiyyətin köməyini irəli sürmüşdür.

Artıq yeni uşaq ədəbiyyatının yaranması genişlənirdi və məktəb kitabxanalarının kitab fondu daha da zənginləşirdi. 1936-cı ilin aprelində Bakıda uşaq bədii ədəbiyyatının sərgisi təşkil edildi. Sərgidə 70 tərcümə kitabı, 15 dənə Azərbaycan yazıçı və şairlərinin yazdığı yeni əsərlər nümayiş etdirilirdi. Bu rəqəmlər az vaxt içərisində əldə edilmişdir. Belə ki, işin hazırlığı barədə qərar həmin ilin 13 yanvarında verilmişdir.

Lakin hələ də məktəb kitabxanalarının kitab fondu və kitabxana xidməti qənaətləndirici deyildir. Məktəb kitabxanalarının kitab fondunu artırmaq və uşaqlara kitab xidmətinin keyfiyyətini yüksəltmək məqsədilə "Məktəb kitabxanaları şəbəkəsinin genişləndirilməsi və onlar üçün ədəbiyyat nəşri haqqında" qərar qəbul edilmişdi. Bu qərara əsasən bütün ibtidai, natamam orta və orta məktəblərdə kitabxanaların açılması üçün 2 milyon manat məbləğində pul buraxılmışdır.

Bu qərara uyğun olaraq Az.SSR Xalq Komissarlar Soveti 1937-ci il 17 may tarixli "Məktəb kitabxanaları şəbəkəsinin genişləndirilməsi və onlar üçün ədəbiyyat nəşri haqqında" yenidən 3177 saylı qərar qəbul etdi. 13 maddədən ibarət olan bu qərarda əlaqədar təşkilatlara və idarələrə müvafiq tapşırıqlar verilirdi.

Azərbaycan SSR Xalq Komissarları Sovetinin bu qərarı Bakı Xalq Maarif Şöbəsi tərəfindən Bakıda maarif işçiləri evində

çağırılan müəllimlərlə kitabxana işçilərinin geniş müşavirəsində, həmçinin şəhər və rayonlarda müzakirə edilmiş və məktəb kitabxanalarının işinin yaxşılaşdırılması üçün konkret tədbirlər qəbul edilmişdir.

Yeri gəlmişkən, bütün bu tədbirlər sayəsində artıq 1938-ci ilin yanvarın birinə kimi respublikada kütləvi və məktəb kitabxanalarının sayı 1.098-ə çatdırılmışdır. 1939-cu ilin yanvarından 3.228-ə çatdı.

Həmin qərardan bir neçə ay sonra Azərbaycan SSR Xalq Komissarlar Soveti işin icrasını yoxladı. Yoxlamadan aydın oldu ki, bir çox idarə və müəssisələr, o cümlədən Azərbaycan SSR XMK də qərarı lazımınca yerinə yetirmə-mişlər. Azərbaycan SSR Xalq Komissarları Soveti 1937-ci ilin noyabrında yenidən "Məktəb kitabxanalarının təşkilinə dair tədbirlər və onlar üçün ədəbiyyat nəşri haqqında" adlı qərar verdi. Qərarda işin pis təşkilindən və ona lazımınca yanaşılmamasından, Azərnəşr və Azərbaycan SSR XMK-nın pis işindən danışılırdı.

Bu qərar uşaq kitabxanaları ilə məktəb kitabxanaları, uşaq kitabxana işçilərilə müəllim arasında sıx əlaqə yaradılmasına, məktəb kitabxanaları üzərində rəhbərliyin artmasına və onlara metodik yardımın genişlənməsinə, məktəb kitabxanalarının maddi cəhətdən möhkəmlənməsinə və onun işinin keyfiyyətcə yaxşılaşmasına əhəmiyyətli dərəcədə kömək etmişdir.

1937-ci ildə məktəb kitabxanalarının uşaq ədəbiyyatı ilə təmin olunması məqsədilə 2 milyon manat vəsait buraxıldı. İlin sonunadək məktəb kitabxanalarının sayını 3000-ə çatdırmaq və onlar 14 dildə 900.000 nüsxə kitab verilməsi nəzərdə tutulurdu.

Həmin ildə kitabxana kollektoru tərəfindən 43 rayonun məktəb kitabxanalarına 232.400 manatlıq, Bakı şəhərinin məktəb kitabxanalarına isə 147.100 manatlıq kitab göndərildi.

14 sentyabr 1938-ci ildə Azərkitab respublikanın məktəblərinə 2300 nüsxə kitab göndərdi.

Məktəb kitabxanalarının sayı miqdarca çoxaldı. 1935-ci ilin 1 yanvarında Azərbaycanda uşaq və məktəb kitabxanlarının sayı 212, kitab fondu isə 832744 nüsxə idisə, 1938-ci ilin 1 iyununda yalnız məktəb kitabxanalarının sayı 1628-ə, kitab fondu isə 386204 nüsxə idi. Bunlardan 43596 nüsxə kitaba malik 810 ibtidai məktəb kitabxanası, 188860 nüsxə kitaba malik 646 natamam orta məktəb kitabxanası, 153746 nüsxə kitaba malik 172 orta məktəb kitabxanası idi.

Azərnəşr Azərbaycanda 18 ildə 170 milyon tirajla 1012 adda dərs kitabı və 23 milyon 50 min tirajla 852 adda pedaqogika və metodika ədəbiyyatı buraxmışdır.

Həmin ildə uşaq və ictimai kitabxanaların sayı isə 107-dən 158-ə çatmışdır.

Lakin arxiv materialından aydın olur ki, 1938-ci ilə qədər kitabxana işinə dair heç bir vəsait nəşr edilməmişdir.

Lakin bu dövrdə də məktəb kitabxanalarının işi tələb olunan səviyyədə deyildir. Məktəb kitabxanalarının işinə rayon XMŞ, məktəb direktorları zəif rəhbərlik edirdilər. Yoxlamalardan aydın olur ki, bir çox rayonlar (Göyçay, Kəlbəcər, Qubadlı və s.) məktəb kitabxanasının komplektləşdirilməsi üçün Azərkitabla müqavilə bağlamamışlar. Bir çoxları isə (Cəbrayıl, Dəvəçi, Qax, Quba, Naxçıvan, Nuxa, Sabirabad, Stepanakert, Xaçmaz, Xızı, Jdanov və Yevlax) müqaviləni formal bağlamışlar. Yəni Azərkitaba heç bir qəpik dəyişməmişlər. Azərkitabın kitabxana kollektoru məktəb kitabxanalarına az kitab ayırırdı. Bundan başqa kitabxanalar hələ məfkurəcə zərərli və köhnəlmiş kitablardan təmizlənməmiş və onlar ixtisaslı kadrlarla təmin olunmamışlar. Qeyd edilən nöqsanları aradan qaldırmaq üçün 1938-ci il ərzində məktəb kitabxanalarına 279000 manat pul buraxılması nəzərdə

tutulurdu.

1937-ci ilin nəticələri araşdırılarkən məlum oldu ki, uşaq ədəbiyyatı kəmiyyət və keyfiyyət baxımından diqqətə layiqdir. Azərbaycan SSR Nazirlər Soveti tərəfindən iş qiymətləndirilib Azərbaycanda uşaq ədəbiyyatının yaxşılaşdırılması üçün Azərnəşr qarşısında əməli təkliflər qoydu:

1. 1937-1938-ci ildə orijinal və qabaqcıl uşaq ədəbiyyatın nəşrinin tematik planını müəyyən etmək və yazıçılarla müqavilə bağlamaq.

2. Müttəfiq respublikalarının uşaq nəşriyyatları ilə əlaqə yaratmaq və türk dilinə tərcümə üçün ən yaxşı əsərlərin siyahısını tutmaq.

3. Folklor materialı əsaında uşaq nağıllarını, oyunlarını və nəğmələrinin və s. toplanışını təşkil etmək və bu materialları yenidən işləmək üçün yazıçılarla müqavilə bağlamaq.

4. 1937 və1938-ci illər ərzində uşaq mütaliəsinə aid məzmunca yaxşı müxtəlif materialların nəşrini plana salmaq, həmçinin rus dilində olan əsas nəzəri materialların türk dilinə tərcüməsini təşkil etmək.

5. Uşaq ədəbiyyatının yaradılmasına elmi işçiləri, vətənpərvərləri, ölkəşünasları, mühəndisləri-neftçiləri, təbiətşünasları cəlb etmək.

6. Uşaq əsəri və bədii tərcümə üçün əmək haqqı sisteminə yenidən baxmaq, çap olunanların say vərəqindən qaçmamaq, ancaq bu əsərlərin keyfiyyət və səviyyəsini nəzərə almaq, əmək haqqının ödənilməsi hissələrlə yox, bir dəfəlik olmalı.

7. Uşaq ədəbiyyatının rəsmiləşdirilməsi və gözəlləşdirilməsi üçün xüsusi rəssamlar ayırmaq.

8. Azərbaycan yazıçılarının ən yaxşı uşaq əsərlərinin rus dilinə tərcüməsini təşkil etmək.

1937-1939-cu dərs ilində şagirdlərdə ədəbi biliyin dəqiqləşdirilməsi məqsədi ilə orta məktəbin V-VII, VIII-X siniflərində ədəbiyyat tədrisinin bir-birindən fərqli şəkildə keçirilməsi sinifdənxaric mütaliə üçün tövsiyə edilən ədəbiyyatın tərtibinə öz təsirini göstərirdi. V-VII siniflər üçün tövsiyə edilən ədəbiyyat şagirdlərin oxumaq, düzgün və bədii danışmaq, ayrı-ayrı personajları səciyyələndirmək qabiliyyətini inkişaf etdirməyə yönəldilmişdir.

*Rəyçi: A.Muradov, əməkdar müəllim*

**İstiafdə edilmiş ədəbiyyat**

1. Mehdizadə M. Azərbaycanda sovet məktəbinin tarixinə dair xülasələr. – B., 1958.

2. “Kommunist tərbiyəsi uğrunda”. Jurn. B., 1932, № 9-10.

3. AzR MDTA, fond 57, siyahı 1, iş 1170, 1224, 1313, 1266.

4. Orta məktəb üçün ədəbiyyat proqramı. B., 1939.

**Ю.Газыев**

**Об истории школьных библиотек в Азербайджане**

**Резюме**

В статье говорится что в 1928-1940 г. сформировались рабочие режимы школьных библиотек. Было урегулировано издание методической литературы для библиотек, а также художественной литературы для детского чтения, их качество и количество повысилось.

**Y.Qazıyev**

**From development the history of school libraries in Azerbaijan**

**Summary**

As a result of those decisions number of school libraries and their book fund increased sufficiently (1928-1940). Work methods of school librarians were formed. Belles-lettres edition for both methodic literature and child home reading for libraries improved quantitatively and qualitatively.

# SEMANTİK HADİSƏLƏR TARİXİ PROSESDİR

**Şəkər Məmmədova**
***Sabunçu rayonu 113 nömrəli məktəbin müəllimi***

Müasir Azərbaycan ədəbi dili rəngarəng və zəngin semantik sistemi ilə seçilir. Dilimizin lüğət tərkibinə daxil olan sözlərin bir çoxu öz ilkin mənasını müəyyən dərəcədə dəyişmişdir. Bunun da əsas səbəblərindən biri dilin, cəmiyyətin inkişafıdır. Sözün mənasının dəyişilməsi üç yerə bölünür: mənanın genişlənməsi, mənanın daralması və mənanın məcazi işlədilməsi. Bu semantik hadisələr tarixi proses olub, müəyyən zaman daxilində özünü göstərir. Əlbəttə, Azərbaycan dilinin lüğət tərkibində əsas yer tutan fellər bu semantik hadisələrdən uzaq qalmamışdır.

Fel əsas nitq hissələrindən biri olmaqla zəngin leksik - semantik xüsusiyyətlərə malikdir. Felin həcmcə digər nitq hissələrindən böyük olması onun semantikasının digər nitq hissələrindən daha geniş, daha zəngin olması ilə bağlıdır. Öz milliliyi ilə seçilən fel, həm də qədim tarixə malikdir. Bu da fellərin məna tutumunun çox olmasına gətirib çıxarır. Fellər mətn daxilində müxtəlif məna çalarlığına malik olur. Belə ki, fellərin bəzilərinin 10, bəzilərinin isə daha çox mənası var. V.A.Zvegintsevin dediyi kimi, “sözlər işlənməsindən asılı olaraq məna dəyişkənliyinə malik olur, eyni söz başqa mənaları da ifadə edə bilir”. Bu mənalardan yalnız biri felin əsas mənası, digər mənalar isə əlavə ifadə etdiyi mənalar hesab olunur. Bu əlavə mənalar məcazların yaranmasına da xidmət edir. Məcazi məna kəsb edən sözlər iki cür olur: üslubi məcazlar və leksik məcazlar. Leksik məcazlar dildə artıq öz yerini tutmuş mənalardır. Üslubi məcazlar isə yazıçının öz fərdi düşüncəsi, təxəyyülü, yaradıcılığı ilə bağlı ifadələrdir.

Lüğət tərkibinə daxil olan müəyyən qisim sözlər və tərkiblər semantikasına görə məcazi məna ifadə etmə xüsusiyyətinə malikdir və bu xüsusiyyət, əsasən çoxmənalı sözlərə məxsusdur. Çoxmənalı sözün mənalarından biri və ya bir neçəsi həmişə məcazidir və əksəriyyəti ümumişlək xarakterlidir. Fellər çoxmənalılığına görə fərqlənən nitq hissəsidir. Q.A. Deqteryeva “semasiologiya üçün sözün məna dəyişkənliyini – çoxmənalılığını birincidərəcəli” hesab edir.

Fellərin semantik inkişafı dedikdə, ilk növbədə sinonim, omonim və antonim yada düşür. Belə ki, Azərbaycan dilində sinonim, omonim və antonimlərin yaranmasında xüsusilə fellər böyük rol oynayır.

Fikrimizi əsaslandırmaq üçün Y.V.Çəmənzəminlinin əsərlərinə müraciət edirik. XIX əsr ədəbi-bədii fikrimizin yeni səviyyəyə yüksəlməsində böyük xidmətləri olan Yusif Vəzir Çəmənzəminli seçdiyi sözü yerində işlətməklə şüura və qəlbə təsir etməyi, onun məna və estetik cəhətlərini vəhdətdə götürməklə fikri hərəkətə gətirməyi bacarır. Əsərlərində arxaizm, dialektizm, varvarizm kimi xüsusi leksik ehtiyat vasitələrindən, məcazların müxtəlif növlərindən yerində bəhrələnməklə əsərin ideya-bədii təsirini gücləndirmişdir.

Yusif Vəzir Çəmənzəminlinin hekayələrində fellərin semantik inkişafı ilə bağlı, xüsusilə, fellərin çoxmənalılığı, məcazlığı,

sinonim, omonim, antonimliyi, mənasının genişlənməsi və daralması və digər semantik hadisələrə aid bir çox nümunə var: Məs: Tez ol qapını aç, soyuq məni kəsdi !.. ("Şaqqulunun xeyir işi" hekayəsi) Burada kəsdi sözünü çoxmənalı fel kimi götürmək olar. Çünki bıçaq kəsdi, qan kəsdi, yağış kəsdi, söz kəsdi, çörək kəsdi, yol kəsdi və s. kimi ifadələr də dilimizdə geniş işlənir və bu ifadələrdəki kəsdi feli Azərbaycan dilinin lüğət tərkibində olan kəsmək feli ilə əlaqəlidir, bir növ ondan törəmişdir. Qan kəsdi, yağış kəsdi əvəzinə qan dayandı, durdu, yağış dayandı ifdələri də dilimizdə işlənməkdədir. Söz kəsdi, çörək kəsdi, yol kəsdi ifadələrində məcazilik vardır və danışıq dilində fəal işlənən ifadələrdəndir. Kəsdi sözünün mənası genişlənmişdir. "Soyuq kişini elə vurmuşdu ki, heç oğlu Şaqqulunun evdə olmadığını anlamırdı" ("Şaqqulunun xeyir işi" hekayəsi). Bu cümlədə soyuq vurmuşdu ifadəsindəki vurmuşdu feli ilə soyuq kəsdi ifadəsindəki kəsdi feli sinonim kimi işlənmişdir. "Əliqulu çəpərdən bir taxta qopardıb Sülüyə qolazladı və sonra birçəyindən tutub, qapaz döşədi". ("Sərhəd məsələsi" hekayəsi) "...nə hikmət vardısa da həmişə hənanın üstünə qoz yarpağı döşəyib, bir neçə saat yerindən tərpənməzdi" ("Cənnətin qəbzi" hekayəsi). Hər iki cümlədə döşəmək feli müxtəlif mənalarda işlənmişdir. Belə ki, birinci cümlədəki döşəmək feli durmadan vurmaq, döymək mənasında danışıq dilində çox işlənir. Bu cümlədəki döşəmək feli məcazi mənada işlənmişdir. İkinci cümlədəki döşəmək feli isə sərmək mənasında işlənmişdir. "Dava təzədən qızışdı: başlar yarılmaqda idi; saqqallar yolunurdu; səs qonşu evlərə düşürdü." ("Sərhəd məsələsi" hekayəsi) cümləsində qızışmaq feli şiddətlənmək, güclənmək mənasında işlənmişdir. Burada məcazi məna özünü göstərməkdədir. Ümumiyyətlə, qızmaq feli mənasının genişlənməsi ilə seçilən fellərdəndir. Çırpışa-çırpışa bir az fırlanmışdıq, vallah, xan geri çəkilib mənə elə bir yumruq ilişdirdi ki, divara yapışdım... ("Cənnətin qəbzi" hekayəsi). Bu cümlədə ilişdirdi felinin öz həqiqi mənasında işlənmədiyini görürük, çünki ilişdirmək feli ədəbi dildə bir şeyi başqa şeyə keçirib bənd etmək, taxmaq mənasında başa düşülür. Bu cümlədə isə ilişdirmək feli məcazi mənasında işlənmişdir, yəni sillə, yumruq çəkmək, bərk vurmaq mənasında çıxış etmişdir. Həmçinin ilişdirmək felinin belə məcazi mənası xalq arasında çox geniş işlənir.

Müasir Azərbaycan dilində sadə fellərin içərisində ən zəngin məna variantlılığı olan fellərdən biri də süzmək felidir. Bu gün dilimizdə bu fel çoxmənalı fel kimi çıxış edir. Sağ olsun İmamqulu! Süzməkdə üstü yox idi. Arvadlar otaqda çəpik çalıb süzürdülər. ("Toy" hekayəsi). Bu cümlələrdə süzmək feli öz həqiqi mənasında deyil məcazi mənada, yəni oynamaq, rəqs etmək mənasında işlənmişdir. Təmizləmək, tökmək (xüsusən çayı), nəzərdən keçirmək, səssiz uçmaq süzmək felinin digər mənalarına daxildir. Bunlar da kirişəndə qızlar ağladı, qonaqlar ağladı, totuq gəlinlər ağladı, çox göz yaşı töküldü, çox ürəklər yandı. ("Toy" hekayəsi). Bu cümlədə kirişəndə sözü kirimək sözünün qarşılığı kimi işlənmişdir və susmaq, səsini kəsmək, dinməmək mənasında özünü göstərir. Yanmaq feli çoxmənalı fellər sırasında durur, belə ki, bu fel bəzi sözlərə qoşularaq frazeoloji ifadələr düzəldir: oduna yanmaq, canı yanmaq, həmçinin ürəyi yanmaq. İstər bədii ədəbiyyatda, istərsə də danışıq dilində yanmaq feli həqiqi mənası ilə yanaşı məcazi mənası da çox işlədilən fellərdəndir.

Yusif Vəzir Çəmənzəminlinin nümunələr gətirdiyimiz bu hekayələrində fellərin semantik inkişafı ilə bağlı çoxlu başqa nümunələr də göstərmək mümkündür. Bu da Yusif Vəzirin bədii dilinin zənginliyindən və bu zənginliyin əsərlərinin dilinə uğurlu təsirindən irəli gəlir.

*Rəyçi: dos. Pəri Soltan qızı*